# AZƏRBAYCAN MƏKTƏBİ

## Elmi-nəzəri, pedaqoji jurnal

2015
№ 1 (665)
(*yanvar-fevral)*

1924-cü ildən çıxır

***Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı №: 11/3165***

***Redaksiyanın ünvanı:***
*Az1025, Bakı şəhəri, A.Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, otaq 410 )*

***Telefon/Faks***
*(012) 496-74-19*
*(012) 496-74-20*

***E-mail:***
*azarbaycan.maktabijurnali.24@mail.ru*

***Rekvizitlər:***
*Kapital Bankın Rabitə Filialı*
***h/h AZ83AIIB45810013441800004118***
***VÖEN: 9900003611***
*Bankın rekvizitləri:*
***Kod: 200189***
***m/hAZ37NABZ01350100000000001944***
***SWIFT: Bik AIIBAZ2X***

***Jurnal redaksiyada yığılıb səhifələnmiş, "Ərgünəş" FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.***

**Təsisçi**
Azərbaycan Respublikasının
Təhsil Nazirliyi

**Baş redaktor**
*Nəcəf Nəcəfov*

**Baş redaktor müavini**
*Nəsrəddin Musayev*

***Məsul katib***
*Ənvər Abbasov*

**Redaksiya heyəti**
*Əjdər Ağayev, Əbdül Əlizadə, Hüseyn Əhmədov, Nurəddin Kazımov, Həqiqə Məmmədova, Abdulla Mehrabov, Rəfiqə Mustafayeva, Aliyə Təhmasib, Fərrux Rüstəmov, Asəf Zamanov.*

**"Azərbaycan məktəbi", 2015**
Bütün hüquqlar qorunur.
Redaksiyanın rəsmi razılığı olmadan jurnalın surəti çıxarılaraq və ya təkrar çap olunaraq yayılması qadağandır.

# BU NÖMRƏDƏ

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş:

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, “Ərgünəş” FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

**В этом номере**



**In this number**



# DİLİMİZ MƏNƏVİYYATIMIZDIR

**Tofiq Hacıyev,**
**AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun direktoru, akademik**

Ölkədə Azərbaycan dilinin inkişafına və zənginləşməsinə dövlət qayğısı və geniş imkanlar yaradıldığı bir şəraitdə Azərbaycan dilinin tədrisi ilə bilavasitə məşğul olanların üzərinə böyük vəzifələr düşür. Bu gün şagird şəxsiyyətinin formalaşmasında onun milli mənlik hissinin, dünyaya baxışının, ən başlıcası vətəndaşlıq təfəkkürünün yaranması xüsusi əhəmiyyət kəsb edir. Böyük dünyaya özünün milli mentalitet çərçivəsindən baxmaq, hər şeyi müasir cizgilərlə görə, dərk edə bilmək mühüm bacarıqlar hesab olunur. Əgər biz özünün milli müstəvisində dünyəvi ola bilmək bacarıqlarını uşaqlarımıza öyrətmək istəyiriksə, o zaman ən etibarlı mənbə, həm də vasitə kimi doğma dilə müraciət etməliyik. Onun keçmiş və müasir zamanlarda yaranmış, illər keçdikcə özünün qənirsiz gözəlliyi, bənzərsizliyi ilə diqqəti cəlb edən nümunələrinə diqqət yetirməliyik. Çünki Azərbaycan dili özünün bütün imkanları ilə xalqımızın tarixi boyu ona sirdaşlıq etməklə həm özünün tarixi, həm də sosial-kommunikativ funksiyasını qoruyub saxlayıb, nəsillərin yaddaşında qalanları nəsillərə ötürübdür.

Dil təlimi təcrübələrinə istinad etsək, belə qənaətə gəlmək olar ki, Azərbaycan dilinin tədris edilməsində şagirdlərin nitq mədəniyyətini formalaşdırmaqla yanaşı, dil quruculuğu, eləcə də dil siyasəti ilə bağlı onların təfəkkürünü cilalamaq əsas tələblərdən hesab edilir. Bu tələblər indi də Azərbaycan dili təliminin leytmotivini təşkil etməklə böyük uğur qazanıb. Odur ki, yuxarı siniflərin Azərbaycan dili kursunda aşağıdakı məsələlər ətrafında müzakirələr aparmaq, diskussiyalar təşkil etmək faydalı bilinir. X və XI siniflər üçün “Azərbaycan dili” dərsliklərində də bu barədə kifayət qədər material vardır. XI sinfin Azərbaycan dili kitabı “Mənim dövlət dilim” sözləri ilə açılır və ümummilli liderimiz Heydər Əliyevin aşağıdakı sözləri sitat kimi verilir: “Bizim çox gözəl, zəngin, cazibədar, dilimiz var. Bəlkə də biz bu dildə danışdığımıza görə öz dilimizin zənginliyini və gözəlliyini hələ tam dərk edə bilməmişik. Ancaq bilin ki, bu, həqiqətdir. Ona görə də bunu heç bir şeyə dəyişmək olmaz. ... Hər bir Azərbaycan vətəndaşı, hər bir azərbaycanlı öz ana dilini- Azərbaycan dilini, dövlət dilini mükəmməl bilməlidir. Gənclərə tövsiyə edirəm ki, əgər kiminsə bu barədə çatışmazlığı varsa, çalışın, bunu aradan qaldırın. Xarici ölkələrdə təhsil alarkən, həmin ölkənin dilini öyrənərkən, eyni zamanda başqa dilləri öyrənərkən öz dilinizi heç vaxt unutmayın və öz ana dilinizi heç bir başqa dilə dəyişməyin. Xalqın, millətin, insanın öz ana dilindən əziz heç bir şeyi ola bilməz” (“Azərbaycan” qəzeti, 31 avqust 1997-ci il). Sonra Həsən bəy Zərdabi, Nəriman Nərimanov və Ömər Faiq Nemanzadənin müdrik sözlərinə müraciət edilir. Şagirdlər elə buradaca böyük alman şairi Hötenin: “Ana dilində danışmaq böyük mədəniyyətdir”, - sözləri ilə də tanış olurlar.

Azərbaycan xalqı doğma dilinə sədaqətli xalqdır. XX əsrin əvvəllərindən başlayaraq ruslaşdırma siyasətinin basqıları altında şifahi ədəbi dilimizin saxlanmasına, dilin təmizliyinə, yad təsirlərdən qorunmasına elm, sənət adamları, müəllimlər tərəfindən

çox həssas münasibət bəslənilmişdir. Ana dilimizin orfoepiya, orfoqrafiya qaydalarına və nitq mədəniyyəti məsələlərinə ciddi fikir verilməsinə, dilimizin təmizliyinə, incəliyinə sevgi, məhəbbət oyadılmasına elə ümumtəhsil məktəblərindən bir mənəvi borc kimi yanaşılmalıdır.

Dilimiz haqqında danışmazdan əvvəl bir haşiyəyə çıxmaq istəyirəm. Fransız yazıçısı, Nobel mükafatçısı Albert Kamyu demişdir: “XVII əsr riyaziyyat əsridir, XVIII əsr fizika, XIX əsr biologiya, XX əsr qorxu əsridir. Qorxu elm deyil, ancaq bu qorxuda elmin payı var”. Doğrudan da, böyük elmi kəşflərin sırasında XX əsrdə şəhərləri, ölkələri xarabalığa çevirən, on milyonlarla insanı məhv edən silahlar da vardır. Texniki yüksəlişi, çox-çox abadlıqları yaradan dəqiq elmlərdir, həm də bunlar dünyanı insan qanı ilə suvarmağa da yönəlmişdir. XX əsrdə Kamyunun xatırlatdığı insanları daimi xofda, qorxuda saxlayan insan şüurunun yaratdığı fövqəladə kəşflərin müqabilində humanitar elmləri də yada salmaq lazım gəlir, məhz bu elmlər insanlara humanizm aşılayır, sevgi təbliğ edir. Hələ böyük mollanəsrəddinçi Ömər Faiq Nemanzadə deyirdi ki, biz bütün sevgilərimizin ən üst qatında dil sevgimizi tutmalıyıq.

Elmə dövlət diqqəti bütün elm sahələri ilə bərabər dilçiliyə də göstərilir. Dövlətin dilçilik elminə, dilin özünə diqqəti, həssaslığı, ilk növbədə, dəqiq elmlərlə müqayisədə dövlətçiliklə, azərbaycançılıqla, dövlətin milli siyasət quruculuğu ilə, dillə bilavasitə bağlı olması ilə izah olunur. Cəmiyyətdə bir dil quruculuğu var, bir də dil siyasəti. Dil quruculuğu (qrammatikalar yazılması, lüğətlər hazırlanması və s.) alimlərin işidir, dil siyasəti isə dövlətindir. Dil quruculuğu dövlətin dil siyasəti ilə idarə olunur. Dövlət siyasəti dil quruculuğunu sürətləndirə də, ləngidə də bilər. Məsələn, 1970-ci illərin əvvəllərində, mərhum Heydər Əliyevin zamanında ali məktəblər üçün dörd cildlik Azərbaycan dili dərsliyi Dövlət mükafatı aldı. Bundan sonra Azərbaycan dilçiliyinin inkişafında xüsusi dirçəliş dövrü başlandı.

Dilçiliyin təcrübəsi məsələləri ilə müqayisədə dilin etnik mənşəyi, dilin tarixən dövlət quruculuğu ilə bağlı problemlərinin tədqiqində dövlət sözünə, dövlət himayəsinə daha çox ehtiyac var. Əlbəttə, bu, o demək deyil ki, tədqiqat dövlətin diktəsi ilə getməlidir. İş ondadır ki, bu problem sırf milli xarakter daşıdığı üçün, xüsusilə sovet dövründə sərt müqavimətlərlə qarşılaşırdı. Yalnız milli mənafe xatirinə yox, birinci növbədə, elmi həqiqətə dövlət arxa duranda həqiqət rahatlıqla irəliləyir. Məsələn, dil tarixçiləri elmi mənbələrə əsaslanaraq, Azərbaycan türkcəsinin tarixini tarixin dərinliyinə apararkən bir sıra tarixçilərlə mübahisə aparmalı olmuşlar. Ancaq Azərbaycan dövlət dili haqqında Qanuna imza qoyarkən ümummilli liderimiz Heydər Əliyev mətnin giriş hissəsində (preambulada) dedi ki, e.ə. Azərbaycanda türk dili ünsiyyət vasitəsi kimi işlənirdi. Bununla da məsələyə dövlətin münasibəti ifadə olunmuş oldu və bu sahədə tədqiqatlar dərinləşməyə başladı.

Yaxud Azərbaycan milli ədəbi dilinin tarixi, formalaşması haqqında sovet dövründə yuxarıdan - Moskvadan gələn qeyri-elmi bir münasibət hökm sürürdü. Avropa dilçiliyinə, marksist dilçiliyə görə milli dil və ümumiyyətlə, millət kapitalizm dövründə yaranır. Həmin fikrə görə, Azərbaycan milli dilinin yaranması XX əsrin əvvəllərinə, bir az da loru desək, dünənə, srağagünə də yox, məhz dünənə düşür. Bununla bərabər elmdə, tarixşünaslıqda başqa dünyabaxışı da var: Avropada kapitalizmin gördüyü işi Şərqdə mərkəzləşmiş dövlət görür. Ancaq bu fikrə əsaslanmaq bizə yasaq edilmişdi. Çünki o fikirdən çıxış edəndə Azərbaycan milli dili-

nin tarixi daha uzaq əsrlərə gedir. Məsələ burasındadır ki, sovet dövründə toxumlamış anti-Azərbaycan qüvvələr hələ tükənməyib və milli tarixin, milli dil tarixinin obyektiv təqdiminə yenə pəl vuranlar var. Akademik Ramiz Mehdiyevin son illərdəki tədqiqatları, xüsusilə Şah İsmayıl Səfəvi haqqındakı son monoqrafiyası və XVI əsr dövlət sənədlərinin aşkar olunub onun müqəddiməsi, redaktəsilə çap olunmuş nəşri bu işdə əsaslı elmi söykənəcək oldu. Artıq indi biz müqavimətsiz deyə bilirik ki, XVI əsrdə milli dilimizin müəyyənləşməsi üçün hər iki faktor - obyektiv və subyektiv faktor meydanda idi: mərkəzləşmiş dövlət yaranmış və italyan dili tarixinin Dantesinin işini görmüş böyük Füzuli yetişmişdi. Milli dilin bugünkü əsas lüğət fondu, morfologiya və sintaksisi XVI əsrdə müəyyənləşmişdi.

Azərbaycan dilçiliyinin dilimizin tarixi ilə əlaqəli mühüm problemlərindən biri yazılı ədəbi dilin başlanğıcı ilə bağlı idi. Bu problemin açarı bütövlükdə türk ədəbiyyat tarixinin möhtəşəm abidəsi "Dədə Qorqud kitabı" idi. Bu məsələdə Azərbaycan və Türkiyə qorqudşünasları arasında kəskin mübahisə gedirdi. Türkiyə qorqudşünaslarına görə, abidə XV-XVI əsrlərdən o yana keçmir, Azərbaycan qorqudşünasları dilindən çıxış edərək, məzmununa əsaslanaraq abidəni daha dərinə aparırdılar. Yenə məsələ Azərbaycan dövlətinin səbatı ilə həllini tapdı. Mərhum Prezidentimiz Heydər Əliyev "Dədə Qorqud kitabı"nın 1300 illik yubileyi haqqında fərman verdi. YUNESKO qəbul etdi, bütün dünya qəbul etdi ki, Azərbaycan yazılı ədəbi dilinin, yazılı ədəbiyyatının tarixi eramızın VII əsrinə gedib çıxır. Təsəvvür edirsinizmi, yazılı tariximiz əvvəl rəsmi qəbul olunmuş tarixdən - XIII əsrdən altı yüz il irəli getdi. Dövlət öz abidəsinə, öz dilinin, ədəbiyyatının tarixinə sahib çıxdı, Azərbaycan elminə arxa durdu. Dövlət bu məsələdə nəinki elmə dayaq oldu, hətta bu işə özü də qoşuldu, qolunu çırmayıb, elmi işçilərlə birgə işlədi. Şahidəm ki, uzun illər üzərində iş aparılan "Dədə Qorqud ensiklopediyası"nın yubileyə qədər başa çatdırılması üçün professor Fatma xanım Abdullazadə Azərbaycan nəşriyyatında iki ay səhərdən axşamacan, şənbəsiz, bazarsız bizimlə birlikdə oldu, bir an ayrılmadı ki, işlər sürətini azaltmasın. Beləliklə, elmi işçilərlə, qorqudşünaslarla dövlət aparatı birlikdə ensiklopediyanı vaxtında yubileyə təqdim etdi.

Dövlətimizin ana dilinə, ədəbi dilə, dövlət dilinə qayğısını, himayəsini, onu hər cür qada-bəladan qorumasını bu gün də görürük. Cənab İlham Əliyevin Azərbaycan dilinin qloballaşma şəraitində işlənməsinə və dilçiliyin inkişafına dair sərəncamını və qəbul olunmuş Dövlət proqramını nəzərdə tuturam. Görürük ki, dilin dövlətdə, ölkədə işlənməsi və dilçiliyin inkişafı kimi milli yüklü anlayışlar sərəncamın özündə vurğulanır.

Füzuli deyirdi:

Yaxşı görünür surəti məhvəşlərin, əmma
Yaxşı nəzər etdikdə sərəncamı yamandır.

Bu gün qloballaşma deyilən anlayış dünya siyasətinin Füzuli deyən ayüzlü gözəlidir. Bu "ayüzlü gözəl" ancaq iri dövlətlərin mənafeyinə xidmət edir. Prezidentimiz bizi həmin "gözələ" Füzuli münasibətinə çağırdı, bu "gözələ" aşiq olub məxrəcimizdən çıxmamağa, ona mübaliğəsiz yanaşmağa çağırdı.

Sözümün sonunda mən 1300 il bundan əvvəlki dilimizdən nəzərinizə bir nümunə çatdırıram. Fonetikası, morfologiyası ilə eynən "Dədə Qorqud kitabı"ndakı kimi deyirəm: "Qız anadan görməyincə öyüd almaz", "Oğul atadan görməyincə süfrə açmaz". Bu ata sözlərinə bu təşbehləri də əlavə edirəm: "Qurulu yaya bənzər çatma qaşlım, Qoşa badam sığmayan dar ağızlım. Güz almasına bənzər al yanaqlım". Vəcdlə və inamla deyirəm ki, bu gün dünyanın irili-

xırdalı heç bir millətinin dili 1300 il bundan əvvəlki səslənişinə bizimki qədər uyğun gəlmir. 1300 il bundan əvvəl işlənmiş bu dil Səməd Vurğunun bugünkü dilindən nə qədər seçilir:

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən...
Könlüm keçir Qarabağdan,
Gah o dağdan, gah bu dağdan.
Axşamüstü qoy uzaqdan
Havalansın xanın səsi,
Qarabağın şikəstəsi !

Bu misraların dili həm vətəndaşlıq, dövlətçilik məzmunu ilə, həm milli psixoloji yükünə görə o qədər dolğundur ki, hərbi qurumlarda bərkimiş mərhum Prezidentimiz də, hamıya məlum olduğu kimi, bu misraları deyərkən kövrəldi. Mənim xalqım 1300 ildir ( təbii ki, daha qədimə gedir, mən əlimizdə olan yazılı nümunəni nəzərdə tutub deyirəm) bu dili öz danışığı ilə, şifahi və yazılı ədəbiyyat dili kimi işlədə-işlədə, qoruya-qoruya bu kamillikdə bu günə gətirib çıxarıb. İndi mənim bu dilim dövlətimin dilidir, dövlətimin siyasət dilidir, indi millətimlə bərabər, dövlətim də bu dili qoruyur. Mən Azərbaycan alimlərinin I qurultayında bir təklif də irəli sürmüşəm. 1926-cı ildə Bakıda ilk türkoloji yığıncaq oldu. Bu, tarixdə "Birinci Ümumittifaq Bakı Türkoloji qurultayı" kimi əks olunub, bu gün də elə deyilir. O zaman qərarlaşdılar ki, II Türkoloji qurultay 1930-da Səmərqənddə keçirilsin. Məlum irtica hadisələri ilə bağlı Səmərqənd qurultayı baş tutmadı. 1966-cı ildə görkəmli sovet türkoloqlarının təşəbbüsü ilə Bakıda bu qurultayın 40 illiyi qeyd olundu və qərara alındı ki, 4 ildən bir müxtəlif türk dövlətlərində (təbii, SSRİ-də) türkoloji konfranslar çağırılsın. Qurultay adından qorxdular. Ancaq həmin konfranslar, həqiqətən, 1989-cu ilə, yəni SSRİ dağılan ərəfəyə qədər davam etdi. 2006-cı ildə cənab İlham Əliyevin sərəncamı ilə Bakıda bu Türkoloji qurultayın 80 illiyi beynəlxalq konfrans kimi keçirildi. 2016-cı ildə I Bakı Türkoloji qurultayının 90 illiyi tamam olur. Mən istəyirəm ki, Bakı Türkoloji qurultayının üstündən 1 rəqəmi götürülsün. Biz bu yubileyi II Bakı Türkoloji qurultayı adı ilə qeyd edək. Bundan sonra Səmərqənddə, Aşqabadda, Astanada, Kazanda, Ankarada III, IV, V, VI, VII... türkoloji qurultaylar çağırılsın.

Ümumtürk kökündən ayrılmış bir qol olan Azərbaycan dili bu gün dünyanın ən yüksək kürsülərindən eşidilir, o, həyatımızın mühüm tərkib hissəsi olmaqla həm də xalqımızın milli quruculuq daşıyıcısı kimi səslənir. Onu öyrənmək, inkişaf etdirmək və müqəddəsliyini qorumaq hər Azərbaycan vətəndaşının şərəfli vəzifəsidir.

**Т.Гаджиев**

**Язык - наша духовность**
**Резюме**

В статье говорится о заботе, оказываемой азербайджанскому языку в стране, о мероприятиях, проведенных в этой области лингвистики и о предстоящих задачах. В статье также затрагиваются вопросы, связанные с съездами тюркологов.

**T.Hajiyev**

**Mother tongue is our spirituality**
**Summary**

In the article it is spoken about the attention paid to the development of Azerbaijan language, about the issues and challenges in the field of Azerbaijan linguistics. In the article it is also touched upon the issues of Turkish congresses.

***Pedaqogika***



# KARL ROCERSİN DİDAKTİK İDEYALARI (HUMANİST PEDAQOGİKA)

**Fərrux Rüstəmov,**
**ADPU-nun pedaqoji fakültəsinin dekanı, əməkdar elm xadimi, pedaqoji elmlər doktoru, professor**

***Açar sözlər:*** *humanist psixologiya, yaddaş məktəbi, təfəkkür məktəbi, pedaqoji-psixoloji irs, təlim konsepsiyası.*

***Ключевые слова:*** *гуманистическая психология, школа памяти, школа мышления, педагогическо-психологическое наследие, учебная концепция.*

***Key words:*** *humanistic psychology, memory school, thinking school, pedagogical and psychological heritage, learning concept.*

XX əsrin 90-cı illərinin əvvəllərində Azərbaycanda elmi-mədəni, sosial-iqtisadi və siyasi sahədə baş verən dəyişiklik əsaslı şəkildə sübut etdi ki, cəmiyyətdə müsbət köklü dəyişikliklərə nail olmaq üçün təhsil sistemi yenilənməlidir. Cəmiyyətin tərəqqisinin vacib amilləri olan elm və mədəniyyətin, xalqın intellektual potensialının formalaşmasında mühüm rol oynayan təhsil sisteminin müasir dövrdə inkişafını təmin etmək məqsədi ilə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən "Azərbaycan 2020: Gələcəyə baxış" İnkişaf Konsepsiyası (2012) və "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" (2013) təsdiq edildi. Yaddaş məktəbindən təfəkkür məktəbinə keçən Azərbaycanda təhsil sisteminin əsasına: ümumi dəyərlər, təhsil prinsiplərinin fəlsəfi əsasları (bərabərlik və azadlıq), təhsil və vicdan azadlığını əks etdirən liberal ideologiya, demokratik cəmiyyətin əsas komponentlərindən olan fasiləsiz təhsil, bərabərlik və məsuliyyətliliyi nəzərdə tutan insan hüquqları qoyuldu. Bu fundamental nəzəriyyənin görkəmli nümayəndələri A.Kombe, A. Maslou və K. Rocersdir.

Bu kontekstdə tanınmış Amerika psixoterapevti və psixoloqu Karl Rocersin (Carl Ransom Rogers) (1902-1987) didaktik ideyaları maraq doğurur. Onun didaktik konsepsiyasının əsasını insana və onun şəxsiyyətinə inam təşkil edir. K.Rocersin zəngin pedaqoji-psixoloji irsi vardır. 16 kitabı, 200-dən artıq məqaləsi dünyanın 60 ölkəsində ayrı-ayrı dillərdə nəşr olunmuşdur. O, dünyada xüsusi təlim konsepsiyası yaradan azsaylı psixoloqlardan biri kimi tanınır. Rus dilinə tərcümə olunmuş "Psixoterapiyaya giriş (psixoterpiyada şəxsiyyətyönümlü münasibət)" (1984), "Əgər müəllim olsaydım bu sualları verərdim" (1988), "Ellen Vest və tənhalıq" (1993), "Şəxsiyyətin təşəkkülü" (1994), "Həqiqətən necə varsan, elə də olmalı. Psixoterapevtin insanın məqsədi ilə bağlı baxışları" (2001), "Öyrənmək azadlığı" (2002), "Empatiya" (2002), "Konsultasiya və psixoterapiya" (2006), "Şəxsiyyətyönümlü psixoterapiya" (2006) monoqrafiyaları təhsil-tərbiyə məsələlərinə həsr olunmuşdur. Keçən əsrin 60-cı illərindən bu günədək onun didaktik ideyaları bütün dünyada təlim-tərbiyə nəzəriyyəsi və təcrübəsinə böyük təsir göstərir, formalaşan

yeni humanist pedaqoji-psixoloji ideyaların metodoloji əsası rolunda çıxış edir. Çox təəssüf ki, onun pedaqoji-psixoloji irsi Azərbaycanda sistemli şəkildə öyrənilməyib, heç bir əsəri doğma dilimizə tərcümə edilməyib. Ən yaxşı halda “Pedaqogika tarixi” (F.Rüstəmov) və “Psixologiya tarixi” (R.Əliyev) dərsliklərində haqqında qısa oçerk verilib. Elmi-pedaqoji ədəbiyyatın təhlili göstərir ki, Azərbaycanda şəxsiyyətyönümlü təhsillə bağlı son illərdə aparılan elə bir tədqiqat işi yoxdur ki, orada Karl Rocersin didaktik nəzəriyyəsinə istinad edilməsin. Bu da səbəbsiz deyil. Dünya pedaqoq və psixoloqlarının şəxsiyyətyönümlü təhsil modelinin əsasında Karl Rocersin irəli sürdüyü humanist ideyalar dayanır. Onun adı Avropadan Amerikaya mühacirət etmiş F.Perlz, Ş.Byuler, K.Xorni, E.From kimi görkəmli alimlərlə bir yerdə çəkilsə də o, əslən amerikalıdır. Vətəndaş müharibəsindən (1861-1865-ci illər) əvvəl onun babası Aleksandr Homilton Rocers İngiltərədən Nyu-York ştatına, oradan da Viskonsin ştatının Vayvatoşa şəhərinə köçmüşdür. Onun şərəfinə adlandırılan Rocersavenyu küçəsində vaxtı ilə yaşadığı ev tarixi abidə kimi qorunur. Həmin evdə Aleksandr Homilton Rocersin beş oğlan övladı dünyaya gəlir ki, onlardan da biri Karl Rocersin atası Uolter Aleksandr Rocersdir. Anasının ailəsi də köklü tarixə malikdir. Ulu nənəsi ingilis Metyu Kaşinq 1638-ci ildə okeanı keçərək Massaçusets ştatına köçsə də, onun varisləri sonralar Rocersin ailəsi kimi Viskonsin ştatında məskunlaşdı. Həmin ştatın Delafid şəhərində Metyu Kaşinqin Vətəndaş müharibəsində həlak olan üç qardaşının abidəsi indi də qorunur. Uolter Aleksandr Rocers və Culiya Kaşinq uşaqlıqdan bir-birini tanısalar da 1891-ci ildə ailə qurublar. Uolter Aleksandr Rocers ixtisasca mühəndis, yüksək maliyyə uğurları əldə edən iş icraçısı idi. Uolterin altı oğlan övladı olub ki, onlardan da biri 8 yanvar 1902-cı ildə İllinoys ştatının Ouk-Park şəhərində anadan olan Karl Rocersdir. K.Rocers sonralar uşaqlıq illərini xatırlayaraq ailəsi ilə bağlı yazırdı ki, bu (ailəmiz-F.R.), ciddi, güzəştə getməyi sevməyən, qonaqlıqlara az gedən, işləməkdən zövq almağı bacaran, etik mühitə malik qapalı bir ailə idi. Ailədə alkoqollu içkilərdən, kartdan istifadə edilməz, teatra isə, ümumiyyətlə, gedilməzdi. Ailədə bizim vaxtımız yaxşı keçsə də digər insanlarla ünsiyyətə girməzdik. Mən həmişə oxuyar, əyləncələrə vaxt sərf etməzdim. Orta məktəbdə oxuyanda cəmi iki dəfə yoldaşlarımla görüşə getmişdim. K.Rocers vaxtının çoxunu tənhalıqla keçirdiyindən əlinə keçən bütün kitabları, hətta lüğətləri və ensiklopediyaları oxuyurdu. K.Rocers hər üç məktəbdə yüksək qiymətlərlə oxuyur, bütün fənlərdən, xüsusilə ingilis dili və təbiət fənlərindən əla qiymətlər alırdı. Yay tətilini şəhər ətrafındakı fermalarında keçirər, yorulana qədər işləyərdi. O, uşaq vaxtı həm də çox zəif olub. 75 yaşında uşaqlıq illərini xatırlayaraq yazırdı: "Mən çox zəif uşaq olmuşam. Bir dəfə atam ağzından qaçırtdı ki, yəqin bu bədənlə çox yaşamaram, cavan ölərəm. İndi 75 yaşındayam və onun (atamın-F.R.) haqlı olduğunu düşünmürəm. Özümü cavan hiss edirəm və ümidvaram ki, heç vaxt qocalmayacağam". K.Rocers uşaqlıqdan fərasəti və qabiliyyəti ilə diqqəti cəlb etmişdi. Sürətli və düzgün oxuma vərdişinə görə o, 1909-cu ildə Ernest Heminqueyin də təhsil aldığı məktəbin birbaşa ikinci sinfinə qəbul olunmuşdu. Ernest Heminqueyin atası da həmin məktəbdə müəllim işləyir, təbiətşünaslıqdan dərs deyirdi. Onun 12 yaşı olanda ailə ferma aldı və şəhər ətrafına köçdü. Valideynlər belə hesab edirdi ki, yeniyetmələri olan ailənin şəhər həyatının aldadıcı təsirindən uzaq olması daha faydalı ola bilər. Orada Rocers gecə kəpənəkləri ilə maraqlanır, kənd təsərrüfatına aid ədəbiyyat oxuyur, materialları

müstəqil öyrənməklə tədqiqatların praktik və elmi metodları haqqında ilkin təsəvvürlərə yiyələnirdi. Sonralar o, "Şəxsiyyətin təşəkkülü" əsərində yazırdı ki, hər iki əyləncə mənim gələcək işimdə çox yararlı oldu.

1922-ci ildə Gənc Xristian Assosiasiyasının nümayəndələri ilə birlikdə Çində oldu. İlyarım Çində yaşaması onun dünyagörüşünün formalaşmasına güclü təsir etdi. "Psixoterapiyaya giriş. Şəxsiyyətin təşəkkülü" kitabında o yazırdı: "Mən gördüm ki, fransızlar və almanlar ayrı-ayrılıqda çox yaxşı insanlar olsa da, qətiyyən bir-birini sevmirlər". Buna görə də o, insana hansısa dini təmayülə, dini təriqətə görə baxışdan yan keçdi. Onun insana münasibəti dini baxışdan daha geniş və humanist idi. Bu isə özünü onun nəzəri və praktik fəaliyyətində göstərirdi. Uzun illər ailəsinin təsiri altında ruhi-mənəvi fəaliyyətlə məşğul olan K.Rocers yalnız yetkinlik yaşında öz həyat yolunu seçdi. Bu da təbii ki, valideynləri ilə onun arasında münasibətlərin gərginləşməsinə səbəb oldu. Ailədə nüfuz sahiblərinin təzyiqindən sonra qazanılan azadlıq sonralar psixoterapiyada yeni bir elmi istiqamətin yaradılmasında onun köməyinə gəldi. 1919-cu ildə Viskonsin ştatındakı universitetin kənd təsərrüfatı fakültəsinə daxil olan Rocers burada cəmi iki il oxudu. Əxlaqi-mənəvi məzmunlu, emosional yüklü tələbə konfransları onun həyata baxışını dəyişdi. Alim-aqronom peşəsindən imtina edərək, ruhi fəaliyyətə keçdi.

Özünün dediyinə görə, onun təhsil illəri zəngin və rəngarəng olmuşdur. Uşaqlıq illərindən yaxşı tanıdığı Xelen Eliotla ailə həyatı quran K.Rocers 1924-cü ildə liberal baxışları dəstəkləməsi ilə seçilən Yunion şəhərindəki teoloji seminariyaya daxil olur. Ailənin dini baxışlarından imtina edən K.Rocers müasir dini nəzəriyyələri öyrənmək üçün iki il həmin seminariyada oxumalı olur. Burada azad və müstəqil fəlsəfi fikrə, ciddi problemlərin həlli ilə bağlı göstərilən istənilən təşəbbüsə hörmətlə yanaşılsa da, təlim prosesinin təşkili onu qane etmirdi: "Biz hiss edirdik ki, burada (seminariyada - F.R.) hazır biliyi beynimizə doldurmağa çalışırlar. Biz isə öz suallarımızın cavablarını özümüz tapmaq istəyirdik". Bu səbəbdən də o, tələbələrin təşkil etdikləri seminarlarda fəal iştirak edirdi. Seminarlarda həyat və fəlsəfə problemlərini müzakirə predmetinə çevirən tələbələrin əksəriyyəti, o cümlədən K.Rocers də çox keçmədi ki, dindən imtina etdi. Onun həyat fəlsəfəsi tamam dəyişdi. Yunion seminariyasının müəllimi E.K.Mak-Qiffertin təsiri ilə K.Rocersin didaktik baxışları formalaşmağa başladı. Tələbələrə təlim prosesində azadlıq və sərbəstlik vermək, onları təhsil prosesinin bərabərhüquqlu iştirakçılarına çevirmək E.K.Mak-Qiffertin pedaqoji fəaliyyətinin əsasını təşkil edirdi. Rocers müəlliminin pedaqoji ideyalarını heyranlıqla qəbul edirdi, çünki o, dərketmə azadlığına və nəticəsindən asılı olmayaraq həqiqəti axtarmağın lazım olduğuna inanırdı. Düşüncə azadlığının heç nə ilə məhdudlaşdırılmadığı bilik sahələri axtarışında, o, psixologiyaya meyil etdi. Onda psixologiyaya marağın yaranmasına Qudvin Uotsonun, Eliot Xerrisonun, Marian Kenforsinin psixatriya üzrə mühazirə və praktik məşğələləri mühüm təsir göstərdi. O dərk etməyə başladı ki, mənəvi yardıma ehtiyacı olanlara kömək etmək kilsə ilə məhdudlaşa bilməz. Bu ideyalardan ilham alan Rocers Kolumbiya Universitetinin pedaqoji kollecinə daxil oldu. Burada o, U.Kilpatrikin vasitəsilə Con Dyuinin yaradıcılığı ilə tanış oldu, fərdi təcrübəni idrakın yeganə meyarı kimi qəbul edən praqmatizm fəlsəfəsinin əsas müddəalarını mənimsədi. Con Dyuinin Amerikada yeni pedaqoji nəzəriyyənin yaranmasını şərtləndirən ideyaları K.Rocersin pedaqoji təfəkkürünün formalaşmasına ciddi

təsir göstərdi. O, U.Kilpatrikin rəhbərliyi altında təhsilin fəlsəfəsi ilə məşğul oldu və qısa bir müddətdə diqqətəlayiq uğurlar əldə etdi. Bacarıqlı və qabiliyyətli müəllim olacağına onda dərin inam yarandı. Az sonra sağlam düşüncəli və praktik insan olan Liva Xollinqvortun rəhbərliyi ilə uşaq klinikasında klinik psixoloq kimi işləməyə başladı. Burada o, uşaqların diaqnostikası və konsultasiyası ilə bağlı sualları cavablandırırdı. Onun ilk terapevtik təcrübəsi də bu institutla bağlı olmuşdu. K.Rocers uşaqlara kömək institutunda internada olarkən freydizmin qızğın təbliğatçıları olan psixiatrlarla - Devid Levi və Loyson Louri ilə tanış olur. Z.Freydin spekulyativ konsepsiyası ilə U.Torndaykın ideyaları arasındakı ziddiyyətin həlli zəruriliyi onu düşündürən ciddi məsələlərdən biri idi. K.Pocers Z.Freydin və müasirləri olan Karen Xorni və Harri Stek Sallivan kimi psixoanaliz nəzəriyyəçilərin tərəfdarı olan psixoterapevt kimi fəaliyyətə başladı. O, 1928-ci ildə magistr, 1931-ci ildə doktorluq dərəcəsi aldı. Az sonra o, Nyu-York ştatının Roçestera şəhərinin sosial xidmət idarəsinin həddi-buluğa çatmayan qanunpozanların və aztəminatlı ailədən olan uşaqların təlimi şöbəsində işləməyə başladı. Məhz həmin dövrdə onda müştərilərlə (K.Rocers pasient əvəzinə klient sözü işlədir) iş təcrübəsi əsasında özünün şəxsi baxışları formalaşmağa başladı. Əmin oldu ki, terapiya müəyyən qanunlara tabedir. İlk səkkiz il K.Rocers praktik psixoloq kimi fəaliyyət göstərdi, insanlarla psixoterapevtik söhbətlər apardı, onların diaqnostikasının texnologiyasını və onlara kömək metodlarını işləyib hazırladı. Uşaqlarla və onların valideynləri ilə təklif etdiyi metodların səmərəsini yoxladı. Çoxillik təcrübəyə istinad edərək belə nəticəyə gəldi ki, müştərini nəyəsə məcbur edən və ya təhrik edən bütün yanaşmalardan imtina etmək lazımdır. Psixoterapiya prosesində müştəriyə arxalanmaq daha səmərəli və faydalıdır. Uzunmüddətli iş təcrübəsi nəticəsində onun öz nəzəriyyə və metodları (müştəri mərkəzli yanaşması) formalaşdı. 1939-cu ildə onun "Çətin tərbiyə olunan uşağın klinik müalicəsi" adlı kitabı nəşr olundu. Həmin dövrdə o, universitetin sosiologiya şöbəsində çətin tərbiyə olunan uşağın klinik müalicəsi ilə bağlı mühazirələr oxuyur, onları necə başa düşməyin və onlarla necə davranmağın yollarını göstərirdi. Bu məqsədlə o, hətta Roçester şəhərində istiqamətverici kömək mərkəzi yaratmışdı. K.Rocers burada fəaliyyət göstərərkən kliniki təcrübəsi onda şəxsiyyətlə bağlı yeni və mükəmməl bir nəzəriyyənin formalaşmasına təkan verdi.

K.Rocersin oğul və qızlarının erkən uşaqlığı həmin dövrə təsadüf edir. O, "Psixoterapiyaya giriş. Şəxsiyyətin təşəkkülü" əsərində yazırdı ki, mən həyat yoldaşımın köməyi ilə uşaqları sevən, onlarla ünsiyyət qurmaqdan zövq alan, onların istək və arzularını başa düşən valideynə çevrildim. Sonralar o, yazırdı: "Nə Bibliya, nə peyğəmbərlərin kitabları, nə Freyd, nə də elmi tədqiqatlar şəxsi təcrübəmin dəyəri ilə müqayisə edilə bilməz".

O, obyektivliyi qorumağa çalışdığından, özünü konkret hansısa elmi məktəbin təmsilçisi hesab etmirdi: "Mən heç zaman hansısa peşəkar qrupa aid olmadım. Psixoloqlar, psixoanalitiklər, psixiatramlar, sosioloqlar, yoxsul ailələrlə iş üzrə mütəxəssislər, pedaqoqlar və din xadimləri ilə sıx əməkdaşlıqda çalışsam da, özümü birbaşa və ya dolayısı ilə bu qruplardan hansısa birinə məxsus hesab etmirəm. Mənim, həqiqətən, məxsus olduğum yeganə qrup, özümün təşkil etdiyim və ya təşkilinə kömək etdiyim xüsusi təyinatlı sıx birləşmiş qrupdur.

1940-ci ildə K.Rocers Ohayo ştatının dövlət universitetinə professor vəzifəsinə dəvət olunur. Öz akademik karyerasına kifayət qədər yüksək pillədə başlayan K.Rocers

bununla da ona olunacaq təzyiqdən qaçmağa nail oldu. Onun fikrincə, çox vaxt yeni fəaliyyətə başlayan tədqiqatçıların ideyalarının yerli-yersiz tənqidi həmin alimlərə yaradıcı şəkildə özünü göstərməyə imkan vermir. Universitet fəaliyyətinin ilk ilində onun diskussiyalara səbəb olan "Terapiya prosesi" adlı məqaləsi dərc edildi. Universitet təcrübəsi, tələbələrin onun ideyalarını dəstəkləməsi və adekvat cavab verməsi onu psixoterapiya problemlərinin şərhinə həsr olunmuş "Konsultasiya və psixoterapiya" kitabını yazmağa ruhlandırdı. Həmin kitabda psixoterapiyada "qeyri-direktiv konsultasiya" kimi tanınan yeni elmi istiqamətin əsası qoyuldu. O dövrdə Amerikada psixoterapiyada iki əsas elmi istiqamət var idi. Onlardan biri psixoanaliz idi. Bu metoddan, əsasən, həkimlər istifadə etsələr də, tibbi təhsildə məsləhətçilər və psixoterapevtlər insan davranışını izah etmək üçün Freydin və onun ardıcıllarının nəzəriyyələrinə istinad edirdilər. İkinci istiqamət direktiv məsləhətvermə idi. Bu metodun tərəfdarlarının əsas ideyası ondan ibarət idi ki, terapevt ekspert kimi öz obyektinə (müştərisinə) dəqiq diaqnoz qoymalı və bunun əsasında da müştərinin ruhuna uyğun istiqamət seçməlidir. K.Rocers "Konsultasiya və psixoterapiya" kitabında müştəriyə məsləhət verməkdə yeni tip münasibətlər təklif etdi. Yeni münasibətləri xarakterizə edən səciyyəvi cəhət ondan ibarət idi ki, bu yanaşmada terapevtin isti münasibətləri müştərini məcburiyyətdən, təzyiqdən azad olmağa, öz hislərini, düşüncələrini açıq şəkildə ifadə etməyə imkan verirdi. Belə vəziyyətdə müştəri özünün dərketmə səviyyəsinə yüksəlir, bu isə ona yeni pozitiv addımlar atmağa kömək edirdi.

K.Rocers 1945-ci ildən fəaliyyətini Çikaqo Universitetində davam etdirməli oldu. Bu illər onun üçün şəxsiyyət nəzəriyyəsi və psixoterapiya sahəsindəki məhsuldar tədqiqatlarının nəticəsi kimi meydana gələn ”Psixoterapiya və şəxsiyyətin inkişafı" (1954) əsəri ilə yadda qaldı. 1953-1954-cü illərdə onun yetkinlik nəzəriyyəsi ilə bağlı bir neçə məqaləsi ("Müştəri mərkəzli terapiya", "Şəxsiyyət və şəxsiyyətlərarası münasibətlərlə bağlı müştəri mərkəzli yanaşma əsasında işlənmiş terapiya nəzəriyyəsi") dərc olundu. Həmin illərdə o daha iki nəzəri işi ilə psixoloji-pedaqoji ictimaiyyətin diqqətini cəlb etdi. 1957-ci ildə "Şəxsiyyətin terapevtik dəyişkənliyi üçün zəruri və qaneedici şərtlər", 1958-ci ildə isə "Psixologiya konsepsiyası bir proses kimi" məqaləsi nəşr edildi. Bu dövrdə Rocersə davranışın determinantı kimi "Mən" obrazına xüsusi diqqət yetirən alimlərin – K.Xorni, K.Qoldşteyn, A.Maslau, A.Anqyal və Q.Sallivanın mühüm təsiri olur. "Mən" obrazının yaradılması Amerika alimlərinin ən diqqətəlayiq elmi nəzəriyyələrindən biri olmuşdur. Bu obraz 2 hissədən ibarətdir: özünütanıma və özünəmünasibət. Burada insanın özünə olan münasibəti müsbət olmalıdır. Alimlərin fikrincə, bir neçə "Mən" obrazı mövcuddur: real "Mən", ideal "Mən" və digərlərin gözündə "Mən" obrazı. İdealda bu 3 "Mən" obrazı üst-üstə gəlməlidir və ancaq bu halda insanın normal inkişafı və nevroza qarşı davamlılığı haqqında danışmaq olar. İdeal "Mən" real "Mən"dən fərqlənirsə, insan özünə müsbət yanaşa bilmir və bu onun normal inkişafına mane olur və onda gərginlik, təlaşlıq, özünəinamsızlıq yaradır.

K.Rocers şəxsiyyətin strukturunun fundamental komponenti olan "Mən" konsepsiyasını subyektin ətraf sosial mühitlə inteqrasiyası prosesində formalaşan davranışın nizamlanmasının daxili hərəkətverici mexanizmi kimi nəzərdən keçirirdi. Əgər əvvəllər psixoterapevtlər pasientlərlə, xəstələrlə həkim-peşəkarlarların müəyyənləşdirdiyi sərt direktiv göstərişlərlə işləyirdilərsə, K.Rocers həkim və xəstə münasibətlərində bərabərliyin olmasını əsaslandıraraq elmi

dövriyyəyə “müştəri” (o, pasient sözünün yerinə klient sözü işlədirdi) anlayışını daxil etdi. K.Rocersə görə, müştəri onu narahat edən bütün problemlərə baxmayaraq, bütövlükdə sağlam adamdır. Müştəri nəzəri cəhətdən özünə xidmət göstərməyi bacarsa da, üstünlüyü psixoterapevtə verir və inanır ki, o, bu işi daha keyfiyyətli və peşəkarcasına həyata keçirə bilər. Bu halda inteqrasiya dərin şəxsi əlaqə tələb edir. Müştəri öz “Mən”ini yaradıcı şəkildə fəallaşdırır və problemlərinin həlli üçün məsuliyyətli olur. Psixoterapevt sadəcə, “mürgüləməkdə” olan həmin potensialı oyatmalı, aktivləşdirməli, müştəridə elə bir daxili inam yaratmalıdır ki, o özü öz problemini həll etməyə qadir olsun.

K.Rocersə görə, psixoterapevt səmərəli kömək etmək üçün üç xarakterik xüsusiyyətə malik olmalıdır:

1) müştərini şərtsiz, yəni necə varsa elə qəbul etməli, ona müsbət münasibət göstərməli, hörmət etməyi bacarmalıdır;

2) müştəri ilə münasibətdə tam səmimi, vicdanlı və açıq olmağı bacarmalıdır;

3) müştərinin emosional vəziyyətinə enməyi bacarmalı, mərhəmətli və qayğıkeş olmalıdır.

Həkim müştərinin daxili aləmini görmək, onun emosional vəziyyətini obyektiv qiymətləndirmək, psixi xüsusiyyətlərini üzə çıxarmaqla yanaşı, öz şəxsi mövqeyini bir an da yaddan çıxartmamalıdır. K.Rocers “müştəri mərkəzli terapiya” ideyasını təşkil etdiyi Konsultasiya Mərkəzində geniş təbliğ etdi. 1957-ci ilə kimi K.Rocersin rəhbərliyi ilə fəaliyyət göstərən bu mərkəzdə müştərilərə azad terapiya istiqaməti seçmək imkanı verilirdi. Onun “Müştəri mərkəzli terapiya” kitabında mərkəzdə topladığı təcrübə ümumiləşdirilmişdi. Alimin ideyalarını ənənəvi direktiv metoda təhlükə hesab edənlər onu haqsız yerə tənqid edirdilər.

K.Rocers Çikaqo Universitetində işləyərkən Amerika Tətbiqi Psixologiya Assosiasiyasının (1945-1946), Amerika Psixologiya Assosiasiyasının (1946-1947), Amerika Psixoloqlar Akademiyasının prezidenti (1956-1957) seçilmişdi. O həm də Humanist Psixologiya Assosiasiyasının (1963) əsasını qoyanlardan biri, Amerika və Qərbi Avropa universitetlərinin bir neçəsinin fəxri doktoru idi. K.Rocers yeganə Amerika psixoloqudur ki, Amerika Psixologiya Assosiasiyasının iki ən vacib və nüfuzlu mükafatını (“Distinguished Scientific Contribution Award (1957) və Distinguished Professional Contribution Award (1972) almışdır. 1964-cü ildə Humanist Psixologiya Assosiasiya onu şərəfli bir ada – İlin humanisti adına layiq görmüşdü.

K.Rocers 1957-1961-ci illərdə Viskonsin Universitetində psixoterapiya və psixologiya üzrə xüsusi kurslar aparırdı. Burada o, belə bir suala cavab axtarırdı: “zəruri və qaneedici şərait” Çikaqo Universitetinin Konsultasiya mərkəzində müştəriləri olmuş tələbələr, yaşlılar və uşaqlar kimi xəstəxanaya götürülmüş şizofreniklərə də tətbiq oluna bilərmi? Şizofreniklərlə psixoterapevtik işin beşillik yekunu şəxsiyyət mərkəzli terapiyanın inkişafına böyük təsir göstərdi. Həmin tədqiqatların təşkilatçılarından biri olan Yucin Cendlin sonralar yazırdı ki, şizofreniklərlə psixoterapevtik iş sayəsində biz xeyli nailiyyətlər əldə etdik. Bu dövr K.Rocersin həyatında ağır bir mərhələ oldu. O, təlim prosesinin düzgün qurulmamasından narahatlıq keçirərək yazırdı: “Təlimin uğurla getməsinə baxmayaraq alınan nəticələrin nə qədər əhəmiyyətsiz olduğunu görəndə dəhşətə gəlirəm. Çünki təlim insanda öz xüsusi təcrübəsinə inamsızlıq yaradır, onun üçün biliyin dəyərini aşağı salır. Ona görə də mən belə hesab edirəm ki, təlimin nəticələri ya vacib deyil, ya da ümumiyyətlə zərərlidir”. O öz narazılığını kəskin şəkildə ifadə edərək deyirdi: “Biz psixoloq-

ları cəmiyyətin zərərinə öyrətməklə ağılsız, səmərəsiz və faydasız iş görürük". "Amerika psixoloqu" jurnalı ilk vaxtlar həmin məqaləni dərc etməkdən imtina etdi. Yalnız tələbələr arasında böyük populyarlıq qazandıqdan sonra həmin yazını çap etmək mümkün oldu.

Kaliforniya ştatının San-Dieqo Universitetində qısa bir müddətdə pedaqoji fəaliyyət göstərən K.Rocers tələbələrin hüquq və azadlıqlarını müdafiə etdiyinə görə Universitet rəhbərliyi ilə yollarını ayırmalı oldu. Məhz həmin dövrdə o, müəllimin fəaliyyətini psixoterapevtin işləri ilə müqayisə etmək qərarına gəldi. Psixoterapevt insanı əvvəlcədən düşünülmüş formaya salmağa cəhd etməklə formalaşdırmır, insana özündə gizlənən, unudulan, təhrif olunan müsbət şeyləri tapmağı öyrədir. Bununla əlaqədar olaraq o yazır ki, əgər müəllimlərə funksional, dəyişikliyə səbəb olan, insana, onun hərəkətlərinə təsir göstərən biliklər maraqlıdırsa, onlar nümunələr və ideyalar üçün psixoterapiyaya müraciət etməlidirlər. Psixoterapiyada isə bilik alma elə sadə və anlaşıqlı şəkildə ifadə edilməlidir ki, təhsil prosesində ondan istifadə etmək mümkün olsun. Müəllim şagirdə münasibətində həssas və qayğıkeş olmalıdır. Əgər müəllim heç bir fərq qoymadan şagirdlərə qayğıkeş və mehriban münasibət göstərirsə, onların uğurlarına sevinirsə, bu, şagirdin narahatlığını, qorxusunu, müdafiə reaksiyalarını minimuma endirir, onun şəxsiyyətinin inkişafını və özünüaktuallaşdırmasını təmin edir. Müəllim psixoterapevt kimi şagirdi şərtsiz, yəni olduğu kimi qəbul etməklə yanaşı, şagirdlə münasibətini elə səviyyədə qurmağı bacarmalıdır ki, şagird onu başa düşə bilsin. K.Rocers uzunmüddətli təcrübələrinə əsaslanaraq belə qənaətə gəldi ki, uğurlu psixoterapiyanın və uğurlu pedaqoji fəaliyyətin üsul və vasitələri eynidir. Onun fikrincə, hər iki sahədə uğur qazanmaq üçün empatiya, hörmət, konqruyentlik imkan verir ki, pedaqoq öz həqiqi şəxsiyyətini, öz həqiqi "Mən"ini ifadə edə bilsin.

1952-ci ildə Rocers Harvard Universiteti tərəfindən təşkil olumuş konfransda "İnsan davranışına təsir edən təlim metodları" mövzusunda çıxış etmək üçün dəvət aldı. Ona psixoterapiya prinsiplərinə əsaslanan şagirdyönümlü təlim haqqında ideyalarını şərh etmək təklif olundu. O, konfrans iştirakçılarının böyük marağına səbəb olan, universitet məşğələlərində, fərdi və qrup psixoterapiyasında əldə etdiyi şəxsi təcrübəsinin nəticələri ilə bağlı maraqlı təqdimat etdi.

K.Rocersin fikrincə, başqa birisinə təlim metodikası öyrətmək mümkün deyil, çox vaxt buna cəhd göstərmək faydasız və nəticəsiz olur. Öyrədilən bilik isə insanların davranışına çox az, yaxud da heç təsir göstərmir. İnsanlara elə bilik vermək lazımdır ki, onların davranışına əhəmiyyətli dərəcədə təsir göstərə bilsin. Bir insanın özü tərəfindən qazanılan bilik, təcrübə nəticəsində dərk etdiyi həqiqət olduğu kimi başqasına verilərsə, bu, digər insanda şəxsi təcrübəsinə inamsızlıq yarada bilər. Bununla da o, daha çox müstəqil öyrənməyə, şəxsi təcrübəyə üstünlük verilməsi qənaətinə gəlirdi. Onun fikrincə, təlimin bu cür təşkili öyrənənlər üçün daha maraqlı olur. Rocers üçün təlim üsullarından ən maraqlısı və həm də ən çətini odur ki, insan müvəqqəti olaraq öz davranışını "unudur", digər insanların öz təcrübəsini necə yaşamasını, həmin təcrübənin onlar üçün hansı məna kəsb etməsini öyrənir. Rocersə görə, təlim metodu şübhələri dəqiqləşdirmək üçün aydın olmayan sualların cavabının tapılmasına cəhd etməklə yeni təcrübə qazanmaqdan ibarətdir. Bütün insanların təcrübələri oxşar və alınan nəticələr eyni olsaydı, onda Rocersin dediyi kimi, təlimdən (insanlar oxumaq üçün müstəsna hallarda toplanardı), təlim nailiyyətlərinin qiymətləndirilməsindən (məqbul və imta-

hanlardan-onsuz da onlar insan üçün dəyərli olan, onların davranışına təsir göstərən bilikləri ölçmür), komponentlik meyarı kimi dərəcələrdən (kim öyrənirsə bunun fasiləsiz davam etməsində maraqlıdır), nəticələrin təqdimatından (heç kim nəyisə nəticələrdən çıxış edərək öyrənə bilməz) imtina edilərdi.

Rocers fəaliyyətinin sonrakı illərində diqqətini şəxsiyyətyönümlü nəzəriyyə və metoddan normal insanların şəxsi yüksəlişinin fasilitasiyası və insan münasibətlərinin potensialının genişləndirilməsi üçün istifadəyə yönəltdi. İntensiv olaraq kiçik qrupların personal və təşkilati dəyişikliklərin katalizatoru kimi səmərəliliyini öyrəndi.

XX əsrin 60-cı illərində K.Rocers Amerikada qrup terapiyası adını almış hərəkatın liderinə çevrildi. 1961-ci ildə onun “Terapiyaya giriş. İnsanın təşəkkülü”, 1970-ci ildə isə “Karl Rocers qrup terapiyası haqqında” kitabları nəşr olundu. Onillik psixoterapevtik təcrübəsini ümumiləşdirdiyi və sistemləşdirdiyi “Terapiyaya giriş. İnsanın təşəkkülü” kitabı ilk vaxtlar həmkarları tərəfindən o qədər də anlaşıqlı qarşılanmasa da, geniş maraq doğurdu və müəllifinə çox yüksək qonorar gətirdi. 1963-cü ildən onun fəaliyyəti Kaliforniya ştatının La Jolla şəhərindəki “Şəxsiyyətin Öyrənilməsi Mərkəzi” ilə sıx bağlı olmuşdur. Burada onun ideyalarına və fəaliyyətinə müdiriyyət tərəfindən məhdudiyyət qoyulmadığından xeyli yeni əsərlər yazdı. Yuxarıda qeyd etdiyimiz kimi, həmin illərdə K.Rocers mövcud nəzəriyyələrə və şəxsi təcrübəsinə əsaslanaraq şəxsiyyətin “Mən” konsepsiyası nəzəriyyəsini yaratdı. 1968-ci ildən “Şəxsiyyətin Öyrənilməsi Mərkəzi”nə rəhbərlik etməyə başladı. K.Rocers hesab edirdi ki, şəxsiyyətyönümlü nəzəriyyənin əsas ideyasını istənilən insani münasibətlərə aid etmək olar. Şəxsiyyətyönümlü nəzəriyyənin fərziyyəsinə görə, təlim prosesinin iştirakçıları şəxsi inkişafa can atdıqda, psixoterapevt tərəfindən səmimilik, empatiya və pozitiv münasibət təmin olunduqda klientin şəxsiyyətində pozitiv dəyişikliklər baş verir. Bu nəzəriyyə onun tanınmış pedaqoq X.Frayberqlə birgə yazdığı “Öyrənmək azadlığı” kitabında öz əksini tapdı. Kitabda həm də onun tədris prosesi ilə bağlı fikirləri, didaktik konsepsiyasının əsas müddəaları təhlil olunurdu. Həmin kitaba görə K.Rocers yenidən həmkarlarının tənqidinə tuş gəldi. Kitab haqqında yazılmış tənqidi resenziyaların təhlili göstərir ki, psixoterapiyada olduğu kimi təhsildə də yeni ideyalar müqavimətlə qarşılandı. Pedaqogika nəzəriyyəçisi, London Universitetinin professoru R.Petere K.Rocersi nəinki tənqid, hətta təhqir edərək yazırdı: “Təəccüblüdür ki, ...başqalarının təcrübəyə açıqlığını təkidlə tələb edən müəllif guya ümumi təhsil problemlərinə aid olan məqalələr toplusu təklif edir, amma pedaqogika nəzəriyyəsi və praktikası məsələlərində tam nadanlıq və savadsızlıq göstərir. Azadlıq - özüidarəolunan tədqiqat kimi gözəldir. Amma həyatda da, təhsildə də digər dəyərlər var. Məsələn, həqiqət, ciddilik və düşüncə azadlığı. Bu resenziyanın qərəzli olması ilk baxışdan diqqəti cəlb edir. Mühakimənin ziddiyyətli olması təhsil fəlsəfəsi üzrə tanınmış mütəxəssis Samuel Tenenbaum tərəfindən yazılmış resenziyadan da aydın görünür. O yazırdı: “Təhsilin inkarına həsr olunmuş kitab nadir hallarda insanı həyəcanlandırır, oxucunu təhsilə konvensial baxışdan azad edir. “Öyrənmək azadlığı” kitabında oxucu təkcə yaxşı təhsilin yox, həm də yaxşı həyatın fəlsəfəsini və metodologiyasını tapır”. Şəxsiyyət mərkəzli terapiya ideyasını irəli sürəndə də K.Rocersə qarşı belə bir münasibət özünü göstərmişdi. K. Rocers çox maraqlı nəticəyə gəlmişdi: “Mən hər dəfə həyati əhəmiyyətli vacib məsələlər qaldıranda tamamilə əks reaksiyalar doğurur. Doktor Samuel Tenenbaumun yazısı mənim üçün çox maraqlı və əhəmiyyətlidir. O, U.Kilpatrik kimi məşhur alim



* 3 “Azərbaycan məktəbi” № 1

haqqında əsərin müəllifi, təcrübəli pedaqoq, təhsil problemləri ilə məşğul olan filosofdur. Onun mənim təcrübəmi qəbul etməsi mənim üçün xüsusilə əhəmiyyətlidir".

K.Rocers 1966-cı ildə verdiyi müsahibəsində öz peşəkar fəaliyyətini belə qiymətləndirir: "Mənim psixologiyada çox da yaxşı nüfuzum yoxdur, bu isə məni o qədər də qayğılandırmır. Lakin təhsildə, sənayedə, qrup dinamikası və sosial işdə, fəlsəfədə, elmdə, teoloji psixologiyada, həmçinin digər sahələrdə ideyalarım genişlənmiş və elə təsir göstərmişdir ki, bunu heç zaman təsəvvür belə etməzdim". Templ Universitetinin əməkdaşı Qovard Kirşenbaumenin sözlərinə görə, Karl Rocers psixologiyada müştəri-mərkəzli yanaşmanın banisi, humanist psixologiya və təhsil sahəsində aparıcı simalardan biridir.

Onun ideyaları "qaynar xəttlər"də və digər krizis mərkəzlərində istifadə olunurdu. 1970-ci illərdə K.Rocers qrup psixologiyası metodundan istifadə etməklə beynəlxalq və etnik münaqişələri həll etməyə cəhd etdi. Bu məsələ ilə bağlı bir çox ölkələrdə (Meksika, Avstriya, Braziliya, Böyük Britaniya, Almaniya, İspaniya, İtaliya, Yaponiya, Cənubi Amerika, İsveçrə və b.) mühazirələr oxudu, qrup görüşləri təşkil etdi.

Beləliklə, Karl Rocersin didaktik konsepsiyasının təşəkkülündə aşağıdakı mərhələləri fərqləndirmək mümkündür:

I mərhələ - ilkin dövr (1919-1927-ci illər). Təhsilin fəlsəfəsi ilə ilkin tanışlıq, tədris prosesində şagirdlərin passiv mövqeyinin qəbul edilməməsi, təlim prosesində tələbələrə azad seçimin verilməsinin zəruriliyinin əsaslandırılması;

II mərhələ - fraqmentlər dövrü (1927-1940-cı illər). Pedaqoji təcrübə toplanması, psixoterapiyada müştəri-mərkəzli yanaşmanın təşəkkülü, şəxsiyyətyönümlü təlim ideyasının irəli sürülməsi və qismən reallaşdırılması;

III mərhələ - innovasiya mərhələsi (1940-1961-ci illər). Uğurlu psixoterapiyanın və uğurlu pedaqoji fəaliyyətin üsul və vasitələrinin eyniliyi ideyasının irəli sürülməsi, şəxsiyyətmərkəzli (şəxsiyyətəyönəlmiş) təlim konsepsiyasının tam formalaşdırılması;

IV dövr - təbliğat və tətbiqetmə mərhələsi (1962-1987-ci illər). ABŞ-da və digər dünya ölkələrində K.Rocersin təhsilin inkişafı üçün vacib olan didaktik konsepsiyasının əsas ideyalarının (şagirdin tam və mütləq şəkildə, yəni necə varsa elə qəbulu, təlimin dəyər, məqsəd, məzmun, forma və metodlarının modifikasiyası prosesində şagirdə pozitiv yanaşma, şagirdin davranışına təsir göstərən biliklərin verilməsi) reallaşdırılması və yayılması.

1982-ci ildə ABŞ-ın iki ən məşhur psixologiya jurnalının (Journal of Counseling Psychology və American Psychologist) sorğusuna əsasən Amerika tarixində ən yüksək təsiredici reytinqə və nüfuza məhz Karl Rocers sahib olmuşdur. Hazırda Kaliforniya ştatının Santa Barbara Universitetində unikal bir kolleksiya qorunur. Həmin kolleksiyaya Karl Rocersin özü tərəfindən toplanan məqalələr, şəkillər və qeydlər daxildir. ABŞ-da Sülh İnstitutu Karl Rocersin adını daşıyır.

K.Rocers SSRİ-də baş verən siyasi hadisələrə böyük maraq göstərirdi. O, yenidənqurma illərində - 1986-cı ildə Moskvaya dəvət olundu. Psixoloqların çoxsaylı auditoriyası qarşısında çıxış etdi, bir neçə seans psixoterapevtik məşğələ keçdi. Onun Moskvaya gəlişi Rusiyada psixoterapiya və psixoloji konsultasiyanın inkişafına böyük təsir göstərdi. Erudisiyası, pedaqoji-psixoloji hazırlığı, mükəmməl elmi nəzəriyyələri ilə yanaşı, gümrahlığı, nikbinliyi, həyat enerjisi ilə moskvalıların təəccübünə səbəb olan K.Rocers bir ildən sonra - 4 fevral 1987-ci ildə Kaliforniya ştatının La-Xoe şəhərində

dünyasını dəyişdi. Ölümündən bir-iki gün əvvəl ailəsinə xəbər gəldi ki, onu Nobel mükafatına təqdim ediblər. Özünün isə bundan xəbəri olmadı.

Uşaqlıqda K.Rocersin sevimli məşğuliyyətlərindən biri də macəra romanlarını oxumaq idi. Bu romanlardan birinin qəhrəmanı balaca Rocersə güclü təsir göstərmişdi. Həmin qəhrəman kitabın bir fəslində hindularla, digərində dəniz quldurları ilə döyüşür və qalib gəlir, çox asanlıqla keçilməz səhranı keçir. Bir adamın yerin bütün sahələrində - quruda və dənizdə etdiyi fövqəladə qəhrəmanlıqlar balaca Rocersi heyrətə salırdı. Karl Rocersin taleyi də elə roman qəhrəmanlarının taleyinə bənzəyir. O, insan fəaliyyətinin müxtəlif sahələrinə, xüsusilə də pedaqogika-psixologiya elminin və praktikasının inkişafına öz elmi-nəzəri və praktik fəaliyyəti ilə elə güclü təsir göstərmişdir ki, bu gün haqlı olaraq XX əsr psixologiyasının korifey şəxsiyyətlərindən biri hesab olunur.

**İstifadə edilmiş ədəbiyyat**

1. Rüstəmov F. Pedaqogika tarixi. Bakı: Elm və təhsil, 2006.

2. Əliyev R. Psixologiya tarixi. Bakı: Elm və təhsil, 2006.

3. Орлов А. Человекоцентрированный подход в психологии, психотерапии, образовании и политике (к 100-летию со дня рождения К.Роджерса) //Вопросы психологии. 2002, № 2.

4. Роджерс К. Взгляд на психотерапию. Становление человека. М.: Изд. группа "Прогресс" - "Универс”, 1994.

5. Роджерс К. Клиент-центрированная психотерапия. Теория, современная практика и применение. М., 2002.

6. Роджерс К., Дорфман Э., Хоббс Н., Гордон Т. Клиентоцентрированная терапия. М.: Рефл-бук; Киев: Ваклер, 1997.

7. Роджерс К. Консультирование и психотерапия. Новейшие подходы в обл. практ. работы. М.: Апрель-пресс: Эксмо-Пресс, 2000.

8. Роджерс К., Фрейберг Дж. Свобода учиться. М.: Смысл, 2002.

9. Роджерс К. Вопросы, которые я бы себе задал, если бы был учителем //Эксперимент и инновации в школе. М., 2011, № 4.

**Ф.Рустамов**

**Дидактические идеи Карла Роджерса (гуманистическая педагогика)**
**Резюме**

В статье говорится о фундаментальной теории гуманистической педагогики, а также повествуется о дидактических идеях видного деятеля этой теории Карла Роджерса.

**F.Rustamov**

**Carl Rogers didactic thoughts (humanitarian pedagogy)**
**Summary**

The article is dedicated to the fundamental theories of humanitarian pedagogy and prominent representative of this theory Carl Roger’s (1902-1987) didactic thoughts.

**Təhsil müəssisələrimizdə**



# 95 YAŞLI KOLLEC

**Nurlana Əliyeva,**
**Azərbaycan Dövlət Pedaqoji Kollecinin**
**direktoru, professor**

***Açar sözlər:*** *darülmüəllim, humanizm, şəxsiyyət, milli təhsil.*
***Ключевые слова:*** *университет, гуманизм, личность, национальное образование.*
***Key words:*** *pedagogue, humanism, identity, national education.*

Xalqımızın maariflənməsi xidmətində qərinələr yola salan, Vətən övladlarının ağlına nur, mənəviyyatına, şüuruna ziya saçan, ən çətin illərdə və dövrlərdə belə, öz böyük amalından və məsləkindən dönməyən Azərbaycan Dövlət Pedaqoji Kollecinin şərəfli salnaməsini vərəqlədikcə, onda fəxr etməli, ibrət götürməli, təqdir olunmalı cəhətlərin zənginliyini gördükcə hər kəsin qəlbi qürur və fəxarətlə döyünür.

Sabir adına Pedaqoji Texnikum kimi bu gün də xalqın milli təfəkküründə minnətdarlıqla yaşayan, vaxtilə Qori Müəllimlər Seminariyasının bütün Zaqafqaziyada həyata keçirdiyi maarifçilik missiyasını Azərbaycanda yerinə yetirən, ölkədə savadsızlığın ləğv edilməsi prosesində tarixi xidmətləri olmuş bu zəka və ülviyyət məbədinin dəyərli ənənələri bu gün də yaşayır və öz bəhrəsini verir. Bu tarixi ənənələr bizim üçün ona görə son dərəcə əzizdir ki, o, Vətənin qanlı-qadalı illərindən, xalqımızın məhrumiyyətlərlə üz-üzə durduğu çətin dövrlərin sınağından şərəflə keçib gəlmişdir. Buna görə də pedaqoji ictimaiyyət kollecimizi milli dəyərə, milli zənginliyə, qədir-qiymətə layiq təhsil ocağı hesab edir.

1919-cu il – faciələrlə, təqiblərlə, təhdidlərlə dolu çox təbəddülatlı bir dövr, sonra 20-ci illər, daha sonra ağrılı-acılı 37-ci illər və Böyük Vətən müharibəsi adlandırdığımız II Dünya müharibəsi illəri ölkənin, xalqın, təhsilin ağır, məhrumiyyətlərlə yaddaşlara həkk olunmuş dövrü idi. Həmin dövrdə xalqımız Şərq dünyasına respublika məfkurəsini və demokratik idarə üsulunu gətirdi. Azərbaycan Xalq Cümhuriyyətinin həyata keçirdiyi ən mühüm tədbirlərdən birincisi millətin maariflənməsi və təhsil ocaqlarının yaradılması oldu.

Azərbaycan Xalq Cümhuriyyətinin liderləri: Əlimərdan bəy Topçubaşov, Fətəli xan Xoyski, Nəsib bəy Yusifbəyli, Məmməd Əmin Rəsulzadə, Əhməd bəy Ağayev və başqalarının ən ülvi arzuları xalqın, millətin təhsil alması idi. Onlar bu məqsədlə Darülmüəllimlər şəbəkəsi yaratmalı idilər. Çünki dövrün müəllimə böyük ehtiyacı var idi: insanları aydınlığa çıxarmağı bacaran müəllimlərə, öyrəndiklərini öyrətməkdən yorulmayan, şəxsiyyətin ruhunu tərbiyə edən, ürəklərdə insanlığı oyada bilən müəllimlərə... Və 1919-cu ildə Azərbaycanın ilk universiteti ilə eyni vaxtda ilk müəllimlər seminariyası yaradıldı.

Həmin illərdə seminariyanın taleyi, ölkənin ən görkəmli şəxsiyyətlərinin taleyi ilə həmahəng oldu. Üzeyir bəy Hacıbəyli, Hüseyn Cavid, Abdulla Şaiq, Mikayıl Müşfiq, Sultan Məcid Qənizadə, Niyazi, Əfrasiyab Bədəlbəyli, Mehdi Hüseyn, Müslüm Maqomayev, Atababa Musaxanlı,

Rəşid bəy Əfəndiyev, Badisəba Köçərli, Məmmədhüseyn Təhmasib, Əlisöhbət Sumbatzadə, Əli Sultanlı, Əkrəm Cəfər, Sabit Rəhman, Pənah Qasımov, Camo Cəbrayılbəyli, Əliheydər Haşımov, Azad bəy Əmirov, Fatma Süleymanova, Mərdan Muradxanov, Sara Xuramoviç, Mədinə xanım Qiyasbəyli və digərləri kimi Azərbaycanda mədəni inqilabın həyata keçirilməsində, savadsızlığın ləğv edilməsində, xalqımızın maariflənməsində böyük tarixi xidmətləri olan ziyalıların dəyərli ənənələri bu gün də yaşayır və öz bəhrəsini verir. Onlar bizim üçün zəngin irs qoyub gediblər, indiki nəsil hörmətli simaların ruhları qarşısında böyük ehtiramla baş əyir, çünki təhsilimizin beşiyi başında duran bu ziyalıların hər birinin fəaliyyəti milli olduğu qədər də bəşəridir...

Bu gün onların layiqli davamçıları - gələcəyin alimləri, şairləri, bəstəkarları, pedaqoqları burada təhsil alır, xalqın və Vətənin yüksəlişi naminə sabaha özlərini həsr edəcək gənclik yetişir.

Müstəqil dövlətimizin ilk pedaqoji məktəbi olan kollecimizdə böyük humanizm, saf insani qayğılar, vətəndaşlıq və vətənpərvərlik duyğuları təlqin edən, biliyindən, ləyaqətindən, ömründən gəncliyə əsirgəmədən pay verən pedaqoqlar fəaliyyət göstərirlər, təhsilimizin yüksəlişi üçün ürəkdən çalışırlar.

Milli mədəniyyətimiz, sənətimiz, tariximiz proletkultçu deyilən bir cərəyan tərəfindən inkar olunurdu. Onlar üzümüzü Füzulilərə, Nəsimilərə, Vaqiflərə, Fətəlilərə, Cavidlərə deyil, Verxarnlara, Uitminlərə, Jül Vernlərə, Mayakovskilərə doğru çevirməliyik deyirdilər. Bütün sahələrdə xalqın istedadı, qabiliyyəti, zəngin klassik irsi danılır, onun görkəmli şəxslərinin fəaliyyətinə kölgə salınırdı.

Milli alətimiz olan tara qadağa qoyulurdu ki, o, fars saraylarında şaha xidmət etmişdir. Və bu fikirlərlə istər-istəməz milli ruhumuz, milli duyğularımız inkar olunurdu. Hətta tanınmış şairlərin dilindən: “Kəs səsini, kifayətdir, sus ey tar, İstəməyir proletar səndə çalınsın qatar!” sözləri eşidilirdi. Lakin bizim seminariyanın müəllimi M.Müşfiq isə ona cavab olaraq, “Oxu tar, mən səndə istənilən havanı çala da bilərəm, mən səndən bu günün zövqünü ala da bilərəm” söyləyib milli mədəniyyətimizin mövqeyini daha düzgün müəyyənləşdirirdi. Pedaqoji kollektivimiz bu ruhla yaşayırdı.

O zaman seminariyada dərs deyən böyük sənətkar Üzeyir Hacıbəyli muğamatımıza rişxəndlə yanaşan, operalarımıza ağız büzən, Azərbaycan dilində danışmağı qəbahət sayan, milli dildə məktəblər açanlara istehza edən, amma başqa millətlərə özlərini çox “obrazovannı” göstərən dönük, səbatsız adamlara qarşı mübarizə aparırdı.

Azərbaycan ədəbiyyatına, tarixinə, təhsilinə küt və şüursuz ağılla hücum edənləri Ü.Hacıbəyli, A.Şaiq, Camo Cəbrayılbəyli, Azad bəy Əmirov kimi pedaqoqlar ağlı, məntiqi, zəkası ilə susdurur, xalqımızın böyük sənət eşqini, ədəbiyyatımızın qüdrətli tərbiyə vasitəsi olmasını, təhsilimizi küt beyinləri, yatmış başları oyatmaq vasitəsi kimi təbliğ edirdilər. Onlar həmin illərdə həm seminariyada dərs deyir, həm də xalqın dərdinə yanaraq gəncliyi çətinlik və qovğalardan keçirib sağlam, vicdanlı insanlar kimi tərbiyə edirdilər.

Bu gün onların nurlu simaları göz önünə gələndə hamımızın qəlbi böyük qürur hissi ilə dolur.

Azərbaycan Dövlət Pedaqoji Kolleci yarandığı gündən indiyədək respublikanın orta ümumtəhsil məktəbləri üçün 125000 ibtidai sinif müəllimi hazırlamışdır. Hazırda ölkənin az-az ucqar kəndləri tapılar ki, orada kollecimizin məzunları işləməsin.

İbtidai sinif müəllimi deyərkən gözlərimiz qarşısında zahiri görkəmindən başla-

mış daxili bütövlüyünədək ağlı, zəkası, elmi, bacarığı, ləyaqəti, mənəviyyatı ilə xalqın övladlarının təlim-tərbiyəsi ilə məşğul olan bütöv bir şəxsiyyət canlanır.

Belə bir mənəviyyata malik kamil insanlar, hərtərəfli mütəxəssislər yetişdirmək üçün pedaqoji məktəbimiz təlim-tərbiyə işlərinin ildən-ilə təkmilləşməsi, cilalanması, onun yeni metod və üsullarla zənginləşməsi qayğısına qalmış, zəhməti, əməyi dövlət və xalq tərəfindən həmişə təqdir edilmişdir. Müəllimlərin XIV qurultayında respublikamızın təhsil naziri cənab Mikayıl Cabbarovun dediyi kimi, "hər bir təhsil sisteminin gücü onun tərkibində fəaliyyət göstərən müəllimlərin gücündən üstün ola bilməz". Məhz belə bir zəhmətin bəhrəsidir ki, illər uzunu məzunlarımızın fəaliyyətini təqdir edən yüzlərlə təşəkkür məktubları almışıq. Bu gün ölkəmizdə "ilin ən yaxşı müəllimi" adına layiq görülmüş ibtidai sinif müəllimləri sırasında bizim onlarla məzunumuzun da adı çəkilir. Bu il məktəbimizin məzunlarından 38 nəfəri ali məktəbə daxil olmuşdur.

Tələbələrimiz şəhər və respublika müsabiqələrində mütəmadi olaraq uğur qazanır, kollecə təltiflər, fəxri fərmanlar, I, II, III yerlərin qalibləri kimi şöhrət gətirirlər. Hər il müəllimlərimiz bu fərəhli sədaların qüruru ilə daha ürəklə, daha məsuliyyətlə çalışırlar. Axı əsl müəllim üçün çəkdiyi zəhmətin fərəhini yaşamaqdan böyük mükafat ola bilməz!

Uzun illər ibtidai sinif müəllimi ixtisası almaq üçün məktəbimizə üz tutan abituriyentlərin sayına görə ali məktəblər kollecimizlə rəqabət aparıb... Bu gün bunu açıq demək olar ki, xalqımız hansı məktəbin onun övladına hansı biliyi, elmi verdiyini çox gözəl başa düşür.

Bu gün Azərbaycan təhsili ölkəmizin tərəqqisi və yüksəlişinə uyğun tərzdə irəliləyir. Ulu öndər H.Əliyevin ömür boyu hazırladığı və praktik şəkildə həyata keçirdiyi müstəqil Azərbaycan Dövlətinin təhsil siyasəti o dahi şəxsiyyətin pedaqoji təliminin prinsipidir, vətənpərvərlik, azərbaycançılıq tərbiyəsi konsepsiyasının əsas məzmunu və tələbidir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin imzaladığı mükəmməl sənədlərdən biri də "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"dır. Sənədin missiyası ölkəmizin modernləşdirilməsi üçün zəruri olan insan kapitalını inkişaf etdirmək və bununla Azərbaycanın beynəlxalq aləmdə rəqabət qabiliyyətini yüksəltməkdən ibarətdir.

Azərbaycan təhsilinə göstərilən bu diqqət Heydər Əliyev fondunun prezidenti Mehriban xanım Əliyevanın Azərbaycan təhsilini inkişafa, müasirləşməyə aparan islahatlara dəstək olması, onun miqyası və təlimimizin uğurlu layihələri yüksək intellektə malik insan kapitalının yetişdirilməsinə istiqamətləndirilmişdir.

2010-2013-cü illərdə Azərbaycan Respublikasının orta ixtisas təhsili sistemində islahatlar üzrə tədbirlər proqramından irəli gələrək 2010-2015-ci illər üzrə strateji inkişaf planı hazırlanmışdır. Bu mühüm sənəd orta ixtisas təhsili şəbəkəsinin məsuliyyətlə təkmilləşdirilməsini, zənginləşdirilməsini tələb edir.

Azərbaycan Dövlət Pedaqoji Kollecinin istər maddi-texniki bazası, istər tədris prosesinin müasir yeniliklərini özündə ehtiva etməsi prosesi, müasir fənn kabinetlərinin zəngin təchizatı və tərtibatı, innovativ proqramlardan və dərs vəsaitlərindən istifadə edilməsi, qeyri-ənənəvi dərslərin təqdimatı, müasir tədris planlarının və innovativ proqramların tətbiqi, İKT-dən istifadə etmək ənənəsi, kollecin resurs mərkəzində keçirilən treninqlər, seminarlar, bütün fənlər üzrə açıq dərslərin nümayişi, əl işlərindən, rəsm-

lərdən ibarət sərgilərin, inşa yazılarının, olimpiadaların, müxtəlif müsabiqələrin, yarışların təşkili, tələbələrin istedadlarını cilalayan dərnəklərin, klubların fəaliyyəti, Pedaqoji Şuranın iclaslarında müzakirəyə çıxarılan yeni layihələrin həlli, bütün bunlarla yanaşı, kollecin abadlığı, təmiri, səliqə-sahmanı, zəngin maddi-texniki bazası, 120 nəfərlik akt zalı, 60 nəfərlik müəllimlər otağı, 100 yerlik yeməkxanası, arxivi, ötən il tikilərək istifadəyə verilmiş müxtəlif tipli avadanlıqlarla təchiz edilmiş müasir idman kompleksi, 85 min kitabı, 500-dən artıq annotasiyası olan elektron kitabxanası, müasir avadanlıqlar və tərtibatlarla zəngin 45 kabineti, bu kabinetlərdə 19 ədəd İQ ( ay kü) board ağıllı lövhələri, 60-dan çox kompyuteri, 50 ədəd notbuk, 20 müasir proyektoru, kabinetlərdə və dəhlizlərdə nəzarət kameraları, bütün kabinetlərdə internet şəbəkəsinə çıxış, 400000 KK-lik qazanxanası, bütün bunların hamısı kollecin bugünkü simasını əks etdirən mənzərədir.

Bu gün əksəriyyəti qızlardan ibarət olan tələbələrimizi gələcəyin kamil insanları, millətin ləyaqətli anaları, əxlaqı, mənəviyyatı, biliyi, bacarığı ilə Azərbaycan müəlliminin və Azərbaycan anasının ali keyfiyyətlərini özündə ehtiva edən mütəxəssis kimi yetişdirmək məqsədi kollecimizin bütün pedaqoji kollektivinin ümdə vəzifəsi və əsas fəaliyyət proqramıdır.

Kollecdə son beş ildə elmi potensiala malik pedaqoqların sayca və keyfiyyətcə artması bu işlər üçün münbit zəmin yaradır. 217 nəfərdən ibarət pedaqoji kollektivin hazırda 1 nəfəri elmlər doktoru, professsor, 21 nəfəri müxtəlif elmlər üzrə fəlsəfə doktoru, 16 nəfər baş müəllim, 30 nəfər elmi araşdırmalarla məşğuldur. Ölkədə təhsilin təkmilləşməsi və yeni proseslərin tətbiqi məsələləri üzrə keçirilən müxtəlif treninqlərdə 198 sertifikata sahib olmuş müəllimlərimiz bu gün uğurla kredit sisteminin tətbiqini həyata keçirir, İKT-nin müasir imkanlarını dərslərdə bacarıqla tətbiq edirlər.

Müəllimlərimizin müəllifliyi ilə son 5 ildə 11 dərslik və dərs vəsaiti, 41 sayda fənn proqramları və digər tədris resursları hazırlanmış və nəşr olunmuşdur.

Kollecimizin son 5 ildəki fəaliyyətini ifadə edən bir neçə statistik rəqəm səsləndirmək istərdim:

2010-2014-cü illərdə respublika səviyyəli 12 konfrans, görkəmli şəxslərlə 8 görüş, 38 dəyirmi masa, 65 ədəbi-bədii gecə, 26 müzakirə, 20 müsabiqə keçirilmiş, 42 metodiki məruzə dinlənilmişdir.

“İnformasiya cəmiyyəti: sosial şəbəkələr və milli-mənəvi dəyərlərimiz” adlı elmi-nəzəri konfransdan əvvəl 469 səhifəlik “Qeyri-ənənəvi dərslər toplusu” kitabı pedaqoji kollektivin böyük əməyinin nəticəsi kimi nəşr edilmiş, ulu öndər Heydər Əliyevin 90 illik yubileyi ərəfəsində müəllimlərimizin müəllifliyi ilə 407 səhifəlik “Zəmanəmizin ən böyük azərbaycanlısı” kitabı işıq üzü görmüşdür.

Bu gün tədrisin səviyyəsini dövrün tələblərinə uyğun qurmaq və onu innovativ proqram və vəsaitlərlə mütəmadi təkmilləşdirmək kollecin ən böyük vəzifəsi, məqsədi, amalı kimi daima diqqət mərkəzindədir. Çünki dərk edirik ki, dövr həmin dövr olmadığı kimi, məktəb də, müəllim də, tədris də həminki olmamalıdır. Bu, o deməkdir ki, təhsilin milliliyi qədər onun qloballaşmasının tələblərini də diqqətdə saxlamaq vacib məsələlərdən biridir. Ən azı ona görə ki, bizim təhsil qanunumuzda təhsilin milliliyi və ümumbəşəri dəyərlərə bağlılığı daima vəhdətdədir.

Bu gün Qarabağın düşmən işğalı altında olduğu bir vaxtda xalqımız üçün vətənpərvərlik tərbiyəsi mühüm bir məqsəddir. Bu məqsədə nail olmaq azərbaycançılıq təliminin, vətənsevərlik ideyalarının təbliği ilə reallaşır. Gəncləri vətənçilik, dövlətinə

sədaqət və məhəbbət ruhunda tərbiyə etmək, pedaqoji kollektivin fəaliyyətinin əsas istiqamətlərindən biridir.

Biz müəllimlər Azərbaycanın milli təhsil quruculuğunu möhtərəm Prezidentimiz cənab İlham Əliyevin müəyyənləşdirdiyi prinsiplər əsasında - təhsil sistemində hər bir yeniləşmənin təkamül yolu ilə həyata keçirilməsi, dünya təcrübəsinin öyrənilməsinin vacibliyi, təhsildə XX əsrdə qazanılmış ənənələrdən istifadə olunması, milli və ümumbəşəri dəyərlərə əsaslanan, beynəlxalq standartlara uyğun, xalqın sabahkı tərəqqisinin bütün şərtləri nəzərə alınmaqla təmin edilməsi tövsiyəsindən qürur duyduğumuz qədər, qarşımızda qoyulan vəzifələrin məsuliyyətini və müqəddəsliyini də dərk edirik.

Məqaləmi ümummilli liderimiz Heydər Əliyevin kollecimiz haqqında söylədiyi tarixi sözlərlə bitirmək istəyirəm. “Yarandığı ilk dövrlərdən təlim-tərbiyə prosesini Azərbaycan maarifinin gözəl ənənələri üzərində qurmuş Bakı Pedaqoji Texnikumu bu gün də müstəqil Azərbaycanımızın xoşbəxt gələcəyi naminə uğurla çalışır, respublikanın ümumtəhsil məktəblərini və təlim-tərbiyə ocaqlarını pedaqoji kadrlarla təmin edir. Əminəm ki, texnikumunuzun uzun illər toplamış olduğu zəngin təcrübəni yeni şəraitdə daha da artıracaq və respublikamızda müasir tələblərə cavab verən müəllimlər hazırlanması işinə bundan sonra da var qüvvənizi sərf edəcəksiniz”...

Azərbaycan Dövlət Pedaqoji Kolleci bu müqəddəs çağırışı qlobal müstəviyə keçirərək təhsilin, tədrisin bütün komponentlərinin tərəqqiyə yönələn mümkün istiqamətlərindən bəhrələnir və təhsil ictimaiyyətini, valideynləri, tələbələri və dövlətimizi əmin etmək istəyir ki, kollecimiz öz müqəddəs vəzifəsini hər zaman olduğu kimi, bundan sonra da həyata keçirmək üçün mənəvi gücünü, pedaqoji bacarığını, istedadını, böyük təcrübəsini səfərbər edəcək, ölkə təhsilinin inkişafına öz layiqli töhfələrini vermək naminə ləyaqətlə, şərəflə, məsuliyyətlə fəaliyyət göstərəcəkdir.

**Н.Алиева**

**95- летний колледж**
**Резюме**

Азербайджанскому государственному педагогическому колледжу исполняется 95 лет. Колледж подготовил для азербайджанских школ 125 000 учителей начальных классов. В колледже функционируют оснащённые лаборатории, кабинеты ИКТ.

Говоря о деятельности колледжа, общенациональный лидер Гейдар Алиев отметил, что колледж успешно трудится во имя счастивого будущего Азербайджана. Колледж с достоинством продолжает свою успешную деятельность.

**N. Aliyeva**

**95 year old college**
**Summary**

The Azerbaijan State Pedagogical College is 95 years old. The college has trained 125 000 primary school teachers for Azerbaijani schools. There function the equipped laboratories and ICT rooms (the Information Communication Technologies) in college.

Speaking about activity of college the national leader Heydar Aliyev noted that the college successfully works for the happy future of Azerbaijan. The college continues its activity with honor.



# TƏHSİL DAİM İNKİŞAFDADIR

**Tünzalə Yusifova,**
***Azərbaycan Müəllimlər İnstitutu Şamaxı filialının direktoru, filologiya üzrə fəlsəfə doktoru***

Tarixə çevrilmiş 2014-cü il Azərbaycan üçün həm də uğurlu təhsil islahatı ili kimi yadda qalmışdır. Dinamik inkişafı davam etdirməklə strateji vəzifələrə doğru irəliləyən respublikamız təhsil sahəsində də pozitiv göstəricilərə nail olmuşdur. Ölkəmizdə təhsil sistemində aparılan islahatlar, o cümlədən Bolonya prosesinə keçidlə əlaqədar tədris prosesinin daha da təkmilləşdirilməsinə, təlim keyfiyyətinin yüksəldilməsinə, tədrisdə kompyuter texnologiyalarından istifadə edilməsinə, yeni dərslik və dərs vəsaitlərinin hazırlanmasına ali təhsil ocaqlarında geniş şərait yaradılmışdır.

Son illərdə aparılan sosialyönümlü islahatlar nəticəsində ölkəmizdə müasir tələblərə cavab verən bir sıra infrastruktur layihələr həyata keçirilmiş, yüksək standartlara cavab verən təhsil, səhiyyə, mədəniyyət və idman obyektləri inşa edilib istifadəyə verilmişdir. Bu nailiyyətlər isə sosial sfera, o cümlədən təhsil sahəsində əsaslı islahatların aparılmasına təkan vermiş, onun davamlı inkişafına stimul yaratmışdır.

Millətin təhsilinin və elmi potensialının inkişaf etdirilməsi öz növbəsində müasir cəmiyyətin davamlı və dinamik inkişafının əsas amillərindən biridir. Təsadüfi deyildir ki, dünyanın qabaqcıl ölkələri məhz təhsildə yüksək inkişaf yolu keçməklə uğurlu nəticələr əldə edə bilmişlər. Bu fikirlər ulu öndərimiz Heydər Əliyevin səsləndirdiyi və bu gün hər birimiz üçün devizə çevrilmiş "Təhsil millətin gələcəyidir" ifadəsində öz əksini daha düzgün tapmışdır. Müdrik siyasətçi tərəfindən bünövrəsi qoyulmuş təhsil strategiyasının əsas istiqamətləri üzrə davamlı inkişaf dinamikası hazırda bu siyasətin layiqli davamçısı möhtərəm Prezidentimiz İlham Əliyev tərəfindən uğurla davam etdirilir, təhsil sahəsində mühüm islahatlar həyata keçirilir, genişmiqyaslı dövlət proqramları icra olunur və yeni inkişaf strategiyaları müəyyənləşdirilir. Təhsil sahəsində aparılan islahatlar və icra edilən dövlət proqramları sayəsində bütövlükdə təhsil infrastrukturunun və təhsilin məzmununun yeniləşdirilməsi istiqamətində mühüm nailiyyətlərin əldə olunması da bununla bağlıdır.

"Azərbaycan 2020: Gələcəyə baxış" İnkişaf Konsepsiyasından irəli gələn sənədlərdən biri də "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"dır. Sənədin missiyası ölkəmizin modernləşdirilməsi üçün zəruri olan insan kapitalını inkişaf etdirmək və bununla Azərbaycanın beynəlxalq rəqabət qabiliyyətini yüksəltməkdən ibarətdir. Strategiya təhsil sahəsində aparılacaq islahatların başlıca istiqamətlərini müəyyənləşdirir, Azərbaycan təhsilinin XXI əsrin çağırışlarına uyğun inkişaf üfüqlərini özündə ehtiva edir və təhsilin bütün pillələrində keyfiyyətcə yeni mərhələyə başlamağı-"qara qızılı insan kapitalına çevirək" fəlsəfəsini qarşımıza əsas vəzifə kimi qoyur.

Bu sənəd və onun həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı təhsilin sahələrini əhatə edir. Bu əhatəlilik, həmçinin Azərbaycanın gələcək inkişafının davamlı xarakter alması üçün peşəkar bilik və baca-

rıqlara yiyələnən və rəqabətədavamlı insan resurslarının yetişdirilməsi missiyasına xidmət edir və Azərbaycan təhsilinin yeni keyfiyyət mərhələsinə keçidi istiqamətində genişmiqyaslı tədbirlərin həyata keçirilməsini nəzərdə tutur. Dövlət Strategiyasında təhsilin keyfiyyətinin yaxşılaşdırılması, təhsili idarəetmə sisteminin yenidən qurulması, kadr hazırlığının gücləndirilməsi, müəllim peşəsinin nüfuzunun artırılması, müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılması, müasir təfəkkürlü Azərbaycan vətəndaşının yetişdirilməsi əsas hədəflər kimi götürülür. Hazırda tələb belə qoyulur ki, təhsil aktiv olmalı və yeni maraqlar istiqamətində qurulmalıdır.

Təhsil naziri cənab Mikayıl Cabbarovun 14 dekabr 2013-cü ildə Azərbaycan müəllimlərinin XIV qurultayında qeyd etdiyi kimi, həyat yerində durmur, dünya hər gün dəyişir, inkişaf edir. Bu dəyişikliklərlə hər zaman ayaqlaşmaq, onlardan geri qalmamaq üçün üzərimizdə hər gün çalışmalı, böyük zəhmət hesabına qazandığımız nailiyyətlərin qorunub saxlanılmasını və geridönməzliyini təmin etməliyik.

Qeyd etmək lazımdır ki, 2014-2015-ci tədris ilindən etibarən ali təhsilin bakalavriat səviyyəsində məzmunu bilik, bacarıq və vərdişlərlə qoyulan kompetensiyaları əks etdirən 138 ixtisas üzrə yeni nəsil təhsil proqramlarının və buna müvafiq hazırlanmış tədris planlarının tətbiqinə başlanmışdır. Hazırda bu sahədə əsaslı işlər görülür.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2013-cü il 24 dekabr tarixli 348 nömrəli qərarı ilə təsdiq edilmiş "Ali təhsil müəssisələrinin bakalavriat və magistatura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili qaydaları" bütün ali təhsil müəssisələrinə şamil edildiyindən AMİ və onun filiallarında da kredit sistemi əsasında təşkil olunmuş tədris prosesinə bir aydınlıq gətirilmişdir.

İndi ali təhsil müəssisələrində tələbələrin təhsili ixtisaslaşma üzrə təhsil proqramı əsasında həyata keçirilir. Bu sahədəki işlər "Bakalavriat təhsilinin məzmunu və təşkili qaydalarına" uyğun qurulur. Kredit sistemi ilə tədrisin təşkili də Bolonya bəyannaməsinin müddəalarına müvafiq olaraq, tələbələrin ayrı-ayrı fənlər üzrə kreditlər qazanmaları ilə təmin edilir. Az vaxt keçməsinə baxmayaraq artıq bu sahədə müəyyən çalışmalar müşahidə olunmaqdadır. İndi bütün tələbələr başa düşmüşlər ki, hər bir fərd öz dəyərlər sistemini özü yaratmalıdır.

Bu baxımdan bu gün Azərbaycan Müəllimlər İnstitutunun yüksək və gərgin işi sayəsində baza institutu tamamilə yenidən qurulduğu kimi filialların da işi yaxşılaşdırılmışdır. Ölkəmizdə pedaqoji kadr potensialının gücləndirilməsi, təhsil sahəsində islahat proqramının müddəalarına uyğun olaraq tədrisin təşkili işində xeyli müsbət irəliləyişlər əldə edilməsi filialın fəaliyyətinə də öz təsirini göstərmişdir.

Əsası iki əsrin qovuşuğunda qoyulmuş AMİ-nin Şamaxı filialında da son illərdə əsaslı yenidənqurma işləri aparılmış, filialın siması tamamilə yenilənmişdir. Belə ki, tədris korpusunda istilik sistemi quraşdırılmış, kafedralar, auditoriyalar, akt zalı, foye təmir edilmiş, müasir texnologiyalar quraşdırılmış, otaqlar, zəngin kitabxana tələbələrin istifadəsinə verilmişdir. Filialın həyətyanı sahəsində tələbələrin asudə vaxtlarını keçirmələri üçün geniş və səliqəli park salınmışdır. Hər il əkilən ağac və gül kolları filialın bağ və park sahəsini daha da gözəlləşdirir. Bütün bunlar həm də tələbələrdə estetik zövqün formalaşmasına xidmət edir.

Tələbələrin vətənpərvərlik ruhunda tərbiyəsi məqsədi ilə müxtəlif tədbirlər keçirilir. Belə ki, tarixi günlər, anım günləri, milli bayramlarımız, görkəmli şəxsiyyətlərin yubileylərini keçirmək artıq bir ənənə halını almışdır. Tələbə Gənclər Təşkilatının xətti ilə keçirilən müxtəlif intellektual oyunlar,

idman yarışları, müxtəlif mövzularda dəyirmi masalar tələbələrin asudə vaxtlarını səmərəli keçirmələrinə kömək edir.

Filialda tələbələrin elmi tədqiqat işlərinə cəlb olunması da daim diqqət mərkəzindədir. Onlar başa düşür ki, sivilizasiyanın gələcəyi elmi düşüncəyə yiyələnməkdən və onun gələcəkdə dərinləşməsindən asılıdır. Hər il filialda TEC xətti ilə tələbə elmi tədqiqat işlərinin konfransı keçirilir və layiqli işlər qiymətləndirilərək onların baza institutunda keçirilən konfransda iştirakı təmin edilir.

İmtahan sessiyalarının şəffaf keçirilməsi üçün ilboyu məqsədyönlü işlər aparılır. Sessiya zamanı yarana biləcək hər hansı bir münaqişə və şikayətlərin operativ həll edilməsi məqsədi ilə filialda “Münaqişə komissiyası”, tələbələrin biliyinin şəffaflığı və obyektivliyini təmin edərək neqativ halları aradan qaldırmaq məqsədi ilə “Qaynar xətt” qərargahı yaradılmışdır. Bu tədbirlərdə bir prinsip əsas götürülür ki, təhsil mühiti demokratik olmalıdır.

Bütün bunlar yüksəkixtisaslı gənc müəllim kadrlarının yetişdirilməsi məqsədi ilə həyata keçirilən müstəqil dövlətimizin təhsil sahəsindəki uğurlu islahatlarının tərkib hissəsidir.

Tələbələrimiz üçün daha dəqiq desək, gələcək müəllimlər üçün çox sevindirici haldır ki, yerlərdə işə başlayan müəllimlərə müntəzəm dövlət qayğısı göstərilir. Təhsil naziri Mikayıl Cabbarovun “Azərbaycan” qəzetinə verdiyi müsahibəsində qeyd edilmişdir ki, müəllim hazırlığında diqqət kəmiyyətə deyil, keyfiyyətə yönəldilməlidir. Nazir onu da xatırladır ki, Təhsil Nazirliyinin təklifləri nəzərə alınaraq Nazirlər Kabinetinin “Pedaqoji profilli ixtisaslar üzrə ali və orta ixtisas təhsili müəssisələrini bitirmiş və ümumi təhsil müəssisələrində işə başlamış gənc mütəxəssislər üçün əlavə güzəştlər və stimullaşdırıcı tədbirlərin müəyyən edilməsi haqqında” qərarında da bir sıra dəyişikliklər edilmişdir.

Dövlətimizin bu qayğısı tələbələrin sevincinə səbəb olmuşdur. Axı onların çoxu kənd rayonlarından gələn gənclərdir. Gələcəyin müəllimləri arxayındırlar ki, ilk iş yerləri onların ürəyincə olacaqdır.

Ümummilli liderimiz Heydər Əliyevin 15 iyun 1999-cu il tarixli, 168 nömrəli sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı”nda təhsil sisteminin bütün sahələrində olduğu kimi, pedaqoji kadrların ixtisasının artırılması, təkmilləşdirilməsi prosesinin yeniləşdirilməsi məsələlərinə də xüsusi diqqət yetirilmişdir. Məlumdur ki, pedaqoji kadrların diplomdansonrakı təhsili onların zamanla birgə addımlamasında heç də ilkin müəllim hazırlığından az əhəmiyyət kəsb etmir. Məhz buna görə də ixtisasartırma təhsilin və təkmilləşdirmə prosesinin tamamilə yenidən qurulmasını zəruri edir. Təlim-tərbiyənin keyfiyyətini ən yüksək səviyyəyə çatdırmaq üçün fasiləsiz təhsili müasir tələblər səviyyəsində elə təşkil etmək lazımdır ki, cəmiyyət üçün elmi biliklərə yiyələnən, hazırlıqlı, yüksək mədəniyyətə, məsuliyyət hissinə, mütərəqqi dünyagörüşünə malik olan, onu daim inkişaf etdirən şəxsiyyət formalaşsın.

Hazırda bəşəri dəyərlərdən daha çox bəhrələnmək, faydalanmaq sahəsində təhsil sisteminin keyfiyyətcə tamamilə yeni bir mərhələsi başlanmışdır. Tədrisin demokratikləşməsi, humanistləşdirilməsi, yeni pedaqoji təfəkkürün formalaşması bir məqsəd güdür ki, o da təhsilin keyfiyyətinin yüksəldilməsidir. Bu iş həm müəllim-şagird münasibətləri ilə, həm də müəllimin öz təhsili ilə əlaqədardır. Müəllimlərin müntəzəm olaraq ixtisasının artırılması, onların öz bilik və bacarıqlarını şagirdlərə çatdırma metodlarının təkmilləşdirilməsi bu yeniləşmədə başlıca amillərdəndir. Bu sahədə son vaxtlar çox

ciddi axtarışlar aparılır, ixtisasartırma, təkmilləşdirmə sahəsində yeni strukturlar, mexanizmlər hazırlanıb geniş müzakirəyə çıxarılır. Bunlardan ən başlıcası, bütün hüquqi sənədlərin yekunu kimi təhsil nazirinin "Dayaq məntəqələri mexanizminin tətbiqi barədə" 30 noyabr 2000-ci il tarixli 194 nömrəli və "İxtisasartırma təhsilində yeni mexanizmə keçid və müəllimlərin təkmilləşdirilməsi işinin təşkili barədə" 21 fevral 2002-ci il tarixli 164 nömrəli müvafiq əmrləri olmuşdur. Bu tarixi sənədlər müəllimlərin ixtisasının artırılmasının və təkmilləşdirilməsinin yeni qaydada həyata keçirilməsinin ilk praktik istiqaməti rolunu müəyyənləşdirmişdir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə 19 iyun 2009-cu ildə qüvvəyə minmiş Təhsil Qanununun 24.1. maddəsinə əsasən "Əlavə təhsil fasiləsiz təhsilin və peşə hazırlığının tərkib hissəsi olmaqla, peşə ixtisas təhsilinin hər hansı pilləsini bitirmək haqqında dövlət sənədi olan hər bir vətəndaşın fasiləsiz təhsil almaq imkanını təmin edir və insan potensialının inkişafı, kadrların intellektual və peşə hazırlığı səviyyəsinin yüksəldilməsi və təkmilləşdirilməsi, onların daim dəyişən və yeniləşən əmək şəraitinə uyğunlaşdırılması, yaşlı vətəndaşların ölkənin sosial, iqtisadi, siyasi və mədəni həyatında fəal və səmərəli iştirakının təmin edilməsi vəzifəsini daşıyır".

Ehtiyacların ödənilməsi, ölkədə insan kapitalının davamlı inkişafı üçün şəraitin yaradılması, mövcud infrastrukturun təkmilləşdirilməsi, müasir düşüncəyə, yeni təlim-tərbiyə texnologiyasına, əxlaqi-mənəvi saflığa, yüksək peşə və ixtisas hazırlığına malik pedaqoji, mühəndis-pedaqoji və elmi-pedaqoji kadr hazırlığının təkmilləşdirilməsinə dair tələblər "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"ndan irəli gələn vəzifələrə uyğun yeniləşdirilir.

Bu baxımdan dayaq məntəqələrinin rolu olduqca əhəmiyyətlidir. Belə ki, dayaq məntəqələri hər bir müəllimin bu və ya digər pedaqoji metodlar, psixoloji məsələlər üzrə bilik səviyyəsini artırır, onlara təlim-tərbiyə sahəsinə dair yeni informasiyalar ötürür və pedaqoji kadrların ixtisasartırma və təkmilləşdirilməsini həyata keçirən mərkəz rolunu oynayır. Bütün bunları məsuliyyətlə dərk edən AMİ-nin Şamaxı filialının professor-müəllim heyəti öz işlərinə yaradıcı yanaşır, keçən tədris ilində buraxılmış nöqsanları, səhvləri analiz edir və 2014-2015-ci tədris ilində fəaliyyətlərini günün tələbləri səviyyəsində qurmağa çalışır. Dislokasiyaya daxil olan Şamaxı, Qobustan, Ağsu və İsmayıllı rayon təhsil şöbələri ilə dayaq məntəqələrinin təşkili istiqamətində müəyyənləşdirilmiş yeni mexanizmlərin daha çevik hərəkəti üçün bütün təşkilatı işlərin vaxtında həyata keçirilməsinə ardıcıl səy göstərilir. Bu istiqamətdə dayaq məntəqələrinin şəbəkəsi dəqiqləşdirilmiş və onların dislokasiyası hazırlanmış, məntəqələrə rayonların bütün ümumtəhsil məktəblərinin müxtəlifixtisaslı müəllimləri cəlb edilmişdir.

AMİ-də seminar-treninqlərdə iştirak edərək "Öyrədənləri öyrədən" sertifikatı almış müəllimlərin, metodistlərin, ilin ən yaxşı müəllimlərinin, orden - medallarla təltif olunmuş müəllimlərin, habelə məntəqə rəhbərlərinin siyahısı müəyyən edilmiş, bütün müəllimlər haqqında informasiya bankları yaradılmışdır.

Təhsil Nazirliyinin "Dayaq məntəqələri mexanizmin tətbiqi barədə" və "İxtisasartırma təhsilində yeni mexanizmə keçid və müəllimlərin təkmilləşdirilməsi işinin təşkili barədə" əmrləri ilə təsdiq edilmiş qaydalara uyğun olaraq filialın əməkdaşları rayonlarda olur, dayaq məntəqələrində seminar-treninqlər keçirir, müəllimlərin qarşılaşdıqları problemlərin birgə müzakirəsini

keçirir.

Bu sahədə filialın əlavə təhsillə məşğul olan "Müasir təlim metodları və dayaq məntəqələri ilə iş üzrə" və "Əlavə təhsilə xidmət edən" kabinetlərin dislokasiyaya daxil olan rayon təhsil şöbələri ilə apardığı birgə işlər nümunə ola bilər. Filialın əməkdaşları ümumtəhsil məktəblərində elmi-praktiki konfranslar, seminar-treninqlər, açıq dərslər keçirir, fənn müəllimlərinin ixisasartırma təhsilinə olan tələbatı öyrənilərək "Sifariş - təklif" prinsipi əsasında dayaq məntəqələrində kurslar təşkil edilir. Məşğələlərdən "Fəal və interaktiv təlim metodlarının tətbiqi", "informasiya-kommunikasiya texnologiyalarından istifadənin imkanları", "Ümumi təhsilin müasir kurikulumları və yeni pedaqoji texnologiyalar", "Yeni qiymətləndirmə konsepsiyaları" və digər mövzularda araşdırmalar və təcrübə mübadiləsi aparılır, müvafiq fənn müəllimlərinin iştirakı ilə konkret problemlər ətrafında müzakirələr keçirilir, çatışmazlıqların aradan qaldırılması yolları təhlil edilir, yeniliklərin digər müəllimlərə ötürülməsi təmin edilir. Dayaq məntəqələrində təlimin aktual məsələləri, fənlərin elmi-nəzəri problemləri müzakirə olunmaqla məntəqələr əsl mənada pedaqoji fikir mərkəzinə çevirilir.

İxtisasartırma təhsilində açıq dərslərin təşkilinə, məşğələlərdə İKT-nin imkanlarından geniş istifadəyə, ixtisasartırma təhsilinə cəlb edilən müəllimlərə müasir texnologiyalar, qabaqcıl təcrübələr öyrətməklə, fikir mübadiləsi aparmaqla yanaşı onların mədəni-kütləvi tədbirlərdə də iştirakına xüsusi diqqət verilir. Buna misal olaraq Şamaxı diyarşünaslıq muzeyinə, VIII əsrin yadigarı "Cümə məscidi"nə, M.Ə.Sabirin ev muzeyinə və "Yeddi günbəz" qəbiristanlığındakı məqbərisinə, Seyid Əzim Şirvaninin "Şahxəndan qəbiristanlığı"ndakı məqbərəsinə, Heydər Əliyev mərkəzinə və digər tarixi yerlərə ekskursiyaları göstərmək olar.

Müasir təlim metodlarının öyrənilməsi və yayılması sahəsində əlavə təhsillə bağlı əməkdaşlarla yanaşı, filialın bütün professor-müəllim heyəti dislokasiyaya daxil olan rayonlarda fəal iş aparır. Ulu öndərin aşağıdakı tövsiyələri həmişə diqqət mərkəzindədir:

"Təbiidir ki, müəllim 5-10-20 il bundan öncəki səviyyəsi ilə bizim bugünkü yüksək təhsilimizi təmin edə bilməz. Gərək müəllim öz üzərində daim işləsin, dünyanın texniki, elmi-tərəqqi nailiyyətlərindən xəbərdar olsun və onları uşaqlara, gənclərə lazımınca çatdırsın".

AMİ-nin Şamaxı filialının bütün pedaqoji kollektivi təhsilin keyfiyyətinin yüksəldilməsi, ixtisasartırma işlərinin müasir tələblər səviyyəsində qurulmasına ilboyu ciddi səy göstərir. Azərbaycanın ali pedaqoji məktəbləri qarşısında qoyulan tələblər bu gün filialın bütün professor-müəllim heyətini düşündürən və onların həyata keçirilməsini təmin edən vəzifələrdəndir.

*Rəyçi: dos. R.Əzizov*

**Т.Юсифова**

**Образование на пути развития**

**Резюме**

В статье повествуется о делах, выполненных в области расширения возможностей получения образования в Шемахинском филиале АУИ.

**T.Yusifova**

**Education always development**

**Summary**

The article is dedicated to the issues of expanding education opportunities in Shamakhi branch of Teachers Institute.



# İLİSUDA BİR MƏKTƏB VAR

**Xanpəri Muradova,**
**Qax rayonu, İlisu kənd tam orta məktəbinin direktoru**

Ölkəmizdə təhsil quruculuğu sahəsində mühüm işlər görülür. Təhsil Nazirliyinin həyata keçirdiyi islahatlar təlimin keyfiyyətinin yüksəldilməsinə, müəllimlərin, məktəblərin iş fəaliyyətinin səmərəliliyinin artırılmasına xidmət etməklə yanaşı, tədris ocaqlarının idarəedilməsi işinin təkmilləşdirilməsinə də təkan verir.

Pedaqoji kollektivə o da aydındır ki, müasir məktəb mədəni irsi formalaşdıran dəyərləri öyrənməlidir. Həm də bu işdə təhsilalanların fəallığı vacib komponentlərdəndir. Çünki hər bir fərd öz sistemini özü yaratmalıdır. Yəni hər bir fərdin dəyərlər sistemini müstəqil bir şəkildə, böyüklərin məcburiyyəti olmadan qurmasına imkan verilməli və ona kömək edilməlidir. Bu tələblərin həyata keçirilməsi üçün təhsil sistemimizdə ən ciddi və əsaslı dəyişikliklər aparılır.

Bu məqsədlə dərs ilinin əvvəlində pedaqoji şurada "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası", həmçinin təhsil naziri M.Cabbarovun 2014-cü il 16 may tarixli, 600 nömrəli əmri ilə təsdiq olunmuş "Müəllimlərin etnik davranış qaydaları"ndan irəli gələn vəzifələr müzakirə olunmuş, 2008-ci ildən ümumtəhsil məktəblərdə həyata keçirilən kurikulum islahatı ilə bağlı görülən işlər bir daha nəzərdən keçirilmişdir.

Bu gün təhsil cəmiyyətin inkişafı dinamikasını tənzimləyən, onu daha uğurla irəliyə aparan potensial qüvvə kimi dəyərləndirilir. Müstəqil Azərbaycan dövlətinin təhsil sistemi milli-mənəvi dəyərlərə əsaslanaraq uzun illər toplanmış səmərəli təlim-tərbiyə ənənələri ilə dünyanın təhsil sisteminə inteqrasiya olunur.

Bu baxımdan "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" sənədi və onun həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı təhsilimizin inkişafı üçün böyük perspektivlər açmışdır. Sərəncamda insan kapitalının inkişafı, hər bir şəxsin bilik və bacarıqlara yiyələnməsinin vacibliyi önə çəkilməklə təhsilimizin yüksək səviyyəyə qaldırılması vəzifələri də qarşıya qoyulmuşdur. Bu sənədi öyrənməklə yanaşı, pedaqoji kollektiv geniş yaradıcılıq işlərinə rəvac vermiş, strategiyanın uğurla həyata keçirilməsinin əsas şərtlərinə bir daha nəzər salınmışdır. Onun məqsədi və məzmunu haqqında təsəvvürün daha aydın qavranılmasının, aktuallığının müəyyənləşdirilməsinin, bu mükəmməl sənədin reallaşmasının, ən yeni metodlardan istifadə olunmasının zəruriliyinin çox vacib məsələlərdən olduğu bir daha vurğulanmışdır.

Azərbaycanın qədim və gözəl guşələrindən biri olan İlisu kəndində fəaliyyət göstərən məktəbimizin adı həmişə qabaqcıl təhsil ocaqlarının sırasında çəkilir. Dünyəvi təhsil verən bu məktəbin əsası hələ 1889-cu ilin payızında İlisu kəndindəki 4 ibtidai, dünyəvi və dini məktəblərin birləşməsi nəticəsində qoyulmuşdur. Artıq o vaxtdan qərinələr keçsə də illərin üzərinə illər gəldikcə İlisu məktəbinin sorağı da miqyasını genişləndirmişdir.

İlisu məktəbində dərs demiş və buradan ucalmış görkəmli şəxslərin sayı onlarcadır. Bu elm ocağında dərs deyən – ali sənətin sahibləri ölkəmiz üçün 18 görkəmli dövlət xadimi, 4 akademik, elmlər doktorları və namizədləri yetişdirmişdir. Bundan başqa məktəbin yetirmələri içərisində 50-dən artıq respublika və rayon miqyaslı dövlət qulluqçusu və rəhbər kadr, 40-dan çox tanınmış mütəxəssis, 6 idman növü üzrə dünya çempionu yetişmiş, məktəbin 1200-dən çox məzunu ali təhsil almışdır. Onlar respublikamızın müxtəlif bölgələrində, hətta uzaq xarici ölkələrdə çalışırlar.

Məktəbin məzunları içərisində Qarabağ döyüşlərində rəşadətlə vuruşan, vətən yolunda şəhidlik zirvəsinə yüksələnlər də az deyildir.

Bu qədim təhsil ocağında müəllimlik fəaliyyəti ilə məşğul olan və maarifçilik ideyalarını yayanlar içərisində Həmzət bəy Əfəndiyev, dərslik müəllifi Harun bəy Sultanov, Arifə Məhərrəmova və Nurməhəmməd Xəlilovun adı iftixarla çəkilir.

Ölkədə müharibə vəziyyəti olsa da, bu təhsil ocağı 1941-ci ildə orta məktəb statusu almışdır. Elə o vaxtdan da dahi Nizaminin 800 illik yubileyi şərəfinə məktəbə böyük şairin adı verilmişdir. Müharibədən sonrakı dövrlərdə məktəbdə çalışan görkəmli müəllimlər öz tələbkarlığı, qayğıkeşliyi, elmə olan marağı ilə pedaqoji ictimaiyyətin dərin hörmətini qazanmışlar. Məktəbi bitirən çoxsaylı elm adamlarının yetişməsində onların böyük əməyi vardır. Bunlara misal olaraq Balay Qocayevi, Əmrullah Bayramovu, Şəfi Qocayevi, Salam Xəlilovu, Rəsul Kərimovu, Həmid Şabanovu və başqalarını göstərmək olar. Onların əziz xatirəsi bu gün də məktəbin pedaqoji kollektivi tərəfindən hörmətlə yad edilir.

Respublikamız müstəqillik qazandıqdan sonra təhsili cəmiyyətin prioritet sahəsi hesab edən Azərbaycan Respublikasının Prezidenti bu qədim təhsil ocağının Azərbaycanın milli təhsil sistemindəki rolunu dəyərləndirərək 1999-cu ildə məktəbin 110 illik yubileyini keçirməyə dair fərman imzalamış və məktəbin pedaqoji kollektivini yubiley münasibəti ilə təbrik etmişdir. Məktəb kollektivi bunu özünə böyük şərəf bilir, hər zaman bu diqqət və qayğını hörmətlə xatırlayır.

İlisu kənd tam orta məktəbi bu gün də özünün təhsil ənənələrini qoruyub saxlayaraq təhsil sahəsində aparılan islahatları uğurla həyata keçirməyə davam edir. Hal-hazırda məktəbdə 112 nəfər şagirdin təlim-tərbiyəsi ilə 35 müəllim məşğul olur. Məktəbdə 7 fənn kabineti, zəngin fizika laboratoriyası vardır.

"Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təminatı Proqramı (2005-2007-ci illər)"na uyğun olaraq məktəb kompyuterlərlə təchiz edilmiş, sürətli internet xətti çəkilmişdir.

Təlimin keyfiyyətinin yüksəldilməsində, şagirdlərin yaradıcılıq potensialının üzə çıxarılmasında, onların şəxsiyyət kimi yetişdirilməsində yeni texnologiyaların əhəmiyyəti böyükdür. "Öyrənməyi öyrətmək" məktəbin əsas vəzifəsi olduğundan ilboyu müəllimlərin nümunəvi açıq dərsləri təşkil edilir və geniş müzakirə olunur. Tədris prosesində müəllimlər İKT-nin tətbiqinə geniş yer verir, yeni təlim texnologiyaları tətbiq edilir. Abdulla Həsilov, Gunay Mahmudova, İranə Rəşidova, Pərvanə Zehirova, Səlimə Seyidəliyeva, Nurlanə Xəlilova və başqaları məhz belə müəllimlərdəndir.

Təlimin keyfiyyətinin yüksəldilməsində, şagirdlərin yaradıcılıq potensialının üzə çıxarılmasında, istedadlı şagirdlərin aşkar edilməsində bilik yarışlarının, müsabiqələrin, fənn olimpiadalarının əhəmiyyəti hamımıza yaxşı bəllidir. Ötən tədris ilində

məktəbin şagirdlərindən İsgəndərzadə İsgəndər və Rəşidov Məhəmməd coğrafiya fənni üzrə rayon olimpiadasında I yer, riyaziyyat fənni üzrə Kərimli Səbuhi II yer, Kərimli Əminə biologiya fənni üzrə II yer tutmuşlar. Bundan başqa, şagirdlərimiz hərbi vətənpərvərlik sahəsində rayonda keçirilən inşa yazı və rəsm müsabiqələrində də fərqlənmişlər. Belə şagirdlərə misal olaraq Seydəliyeva Naidəni, Yusifova Gülçini, Əlimzadə Səidəni, İsgəndərzadə Turanı göstərmək olar.

Çox sevindirici haldır ki, Təhsil Nazirliyi tərəfindən "Gələcəyin müəllimi təqaüdü" kimi çox şərəfli ad təsis edilib. Təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən 300 tələbəyə şamil olunur. Aydındır ki, kənd rayonlarındakı məktəblərdə müəllim çatışmazlığı hələ də qalmaqdadır. Bunun üçün müxtəlif tədbirlər, həvəsləndirmələr həyata keçirilir.

Məktəbin idman sahəsindəki uğurları daha sevindiricidir. Belə ki, şagirdlərimiz hər il respublika və rayonda keçirilən yarışlarda uğurla çıxış edirlər. Bu il məktəblilərin VII spartakiadasının atletika idman növü üzrə zona yarışında şagirdlərimiz I yer tutmuşlar. Bu il məktəbin XI sinif şagirdlərindən 3-ü çağırışyaşlı gənclərin çoxnövçülüyü üzrə İsmayıllıda keçirilən respublika yarışında I yerə layiq görülmüşlər.

İlisu kənd tam orta məktəbinin məzunlarından son on ildə 34 nəfər ali məktəbə, 16 nəfər texnikuma qəbul olunmuşdur. Məzunlarımızın əksəriyyəti ödənişsiz ali təhsil müəssisələrində oxuyurlar. Qəbul olunanlar içərisində Qocayeva Aysel, Seydəliyeva Aynur, Qocayeva Xəyalə, Musayeva Çinarə 500-dən yuxarı bal toplamışlar. 2012-2013-cü tədris ilində Rəşidov Rüstəm 612 balla Qafqaz Universitetinə qəbul olunmuşdur. Ötən tədris ilində XI sinfi bitirən 12 şagirddən 7-si ali məktəbə, o cümlədən Kərimli Əminə 654 balla Azərbaycan Dövlət Tibb Universitetinin Müalicə işi fakültəsinə, 5 nəfər isə orta ixtisas təhsili müəssisəsinə qəbul olunmuşdur.

Ölkəmizdə uğurla həyata keçirilən islahatlar, dünya təhsil sisteminə inteqrasiya, yeni innovasiyaların tətbiqi məktəbin idarə edilməsinin yeni tələblər əsasında qurulması zərurəti yaratmışdır.

Pedaqoji kollektiv dərk edir ki, onların vəzifəsi milli, mənəvi və ümumbəşəri dəyərlərə yiyələnən, demokratik ənənələrə və insan hüquqlarına hörmət edən vətənpərvər, azərbaycançılıq ideyalarına sadiq vətəndaş yetişdirməkdir. Bu prinsipləri rəhbər tutan bütün müəllimlərimiz əzmlə çalışaraq təhsil sahəsində aparılan islahatları dəstəkləyir, məktəbin indiyədək qazandığı ənənələri qoruyub saxlamağa çalışırlar.

*Rəyçi: dos. R.Qəndilov*

**Х.Мурадова**

**Илисуинская школа**

**Резюме**

В статье говорится об истории Илисуинской школы Кахского района. Также называются известные во всей стране выпускники этой школы, а также проблемы в системе обучения детей.

**Kh.Muradova**

**About a school in Ilisu**

**Summary**

The article is about a good school in Ilisu, one of the oldest villages of Gakh region known for its country-famous graduators and about the current issues of this school.



# MÜƏLLİM HAZIRLIĞINDA FİZİKADAN FƏNLƏRARASI İNTEQRASİYA PROBLEMİ

**Rövşən Əliyev,**
**İsmayıllı rayonu, Lahıc qəsəbə tam orta məktəbinin müəllimi, əməkdar müəllim**

Müəllim hazırlığında əsas istiqamətlərdən biri də, fənlərarası inteqrasiyadan irəli gələn pedaqoji sistemin düzgün qurulmasıdır. Fənlər üzrə ümumi təlim nəticələri, əslində məzmunu müəyyən edən əsas standartlardır. Bu standartlar fənn kurikulumlarında tələb kimi bütün siniflər üçün dəyişməz qalır və alt standartlar vasitəsilə sinifdən-sinfə inkişaf edir.

Müəllim hazırlığında fizikadan fənlərarası inteqrasiya problemini yoxlamaq məqsədi ilə aşağıdakı eksperimenti həyata keçirdim. Bunun üçün VI sinfi seçdim. Sinfin seçilməsinin əsas məqsədləri:

1. VI sinifdə fizika ilk dəfə 44 ildən sonra yenidən tədris olunmağa başlamışdır.

2. VI sinif kurikulum proqramı əsasında I sinifdən VI sinfə qədər təlimə cəlb olunmuşdur.

3. VI sinif yeni təlim texnologiyaları əsasında qurulmuş tədris materialları ilə təmin olunmuşdur.

4. VI sinif “1 şagird-1 kompyuter” proqramına uyğun olaraq “Netbuk”larla təmin olunmuşdur.

5. VI sinfin “Fizika” dərslik komplektinin həmmüəllifi olduğuma görə: “Fizika” dərslik , “Müəllim üçün metodik vəsait” və VI sinif fizika iş dəftəri.

Eksperiment üçün məktəbin seçilməsi:

1. Təklif olunan məktəb eksperimentlərinin icrası üçün fənlərarası inteqrasiyaya daxil olan fənlərdən güclü maddi-texniki bazaya malik olması.

2. Şagirdlərlə dərsdənkənar işlərin sistematik olaraq həyata keçirilməsi üçün şəraitin olması.

3. Müəllimlərin kifayət qədər pedaqoji təcrübələrinin, tədqiqatçılıq qabiliyyətinin və yeni təlim texnologiyalarından istifadələrinin yüksək olması.

Eksperiment zamanı İsmayıllı rayonu Lahıc qəsəbə tam orta məktəbi və 1 nömrəli şəhər tam orta məktəbi seçilmişdir.

Bu məqsədlə aşağıdakı vəzifələr qarşıya qoyulmuşdur:

1. Həll olunacaq problemə uyğun pedaqoji tədqiqat metodlarının müəyyənləşdirilməsi.

2. Tədqiqatın həcminin seçilməsi.

3. VI sinifdə fizika, riyaziyyat, biologiya, həyat bilgisi, coğrafiya, texnologiya, informatika, musiqi, təsviri incəsənətə dair tədris materiallarının mövcud quruluş və məzmununun, məzmun xətlərinin və alt standartların təhlil edilməsi.

4. Şagirdlərin fizikadan və digər fənlərdən bilik səviyyələrinin müəyyənləşdirilməsi.

5. Şagirdlərin bu fənlərə və fizikaya maraqlarının müəyyənləşdirilməsi.

Bu eksperiment zamanı qarşıya qoyulmuş vəzifələri həll etmək üçün aşağıdakı tədqiqat metodlarından istifadə olunmuşdur:

1. Şagirdlərin biliklərinin müsahibə yolu ilə yoxlanması.

2. Şagirdlərin biliklərinin yazılı və praktik yoxlanması.

3. Şagirdlərin bilik və bacarıqlarının hissə-hissə analiz olunması.

4. Eksperimentator müəllimlərin cavabları, məsləhət və arzuları.

Fənlərarası inteqrasiya. Müəllim hazırlığında fizikanın digər fənlərlə inteqrasiya imkanlarından istifadənin səmərəli yollarını araşdırmaq fizikanın tədrisi metodikasının mühüm tədqiqat istiqamətlərindən biridir. Bu sahədə apardığımız araşdırmalardan fizikanın aşağıdakı fənlərarası əlaqəsini müəyyən etdik. Fənlərarası inteqrasiya olduqca böyük əhəmiyyətə malikdir. Fizikanın digər fənlərlə inteqrasiya imkanları özünəməxsus xüsusiyyətlərə malikdir:

1. **Riyaziyyat**. Fizika və riyaziyyat kurslarının əlaqəsini xüsusilə qeyd etmək lazımdır, çünki elmi metod kimi riyaziyyatın əhəmiyyəti fizikanın tədrisində geniş əks olunur. Fizikanın qanunları riyazi düsturlarla ifadə olunur. Fizika qanunlarından nəticə çıxaranda, onun bəzi müddəalarını isbat edəndə, laboratoriya işlərində riyaziyyatdan istifadə olunur.

2. **Biologiya.** Biologiya kursunda fizika qanunları, hadisələri və anlayışları illüstrasiya edən çoxlu miqdarda maraqlı misallar vardır. Bu misallardan istifadə olunması şagirdlərə təbiət qanunlarının vahidliyini, təbiət hadisələrinin aydınlaşdırılmasında fizikanın əhəmiyyətini göstərməyə, bu hadisələri düzgün izah etməyi öyrətməyə, yəni fizikanın həyatla əlaqəsini göstərməyə imkan verir.

3. **Kimya.** VI sinifdə kimya fənni tədris olunmasına baxmayaraq, fizika və kimya kurslarının əlaqəsi üçün anlayışların öyrənilmə və izahı vaxtının uyğunlaşdırılması, bu fənlər üçün anlayışların və qanunların tədricən formalaşdırılması, materialın öyrənilməsində eyni işin təkrarının aradan qaldırılması kimi fikirlər çox vacibdir. Kimyanı öyrənməyə başlayana qədər artıq şagirdlər fizika kursundan molekul və onun tərkibi haqqında biliklər, bacarıqlar qazanırlar.

**4. Həyat bilgisi.** Materiyada, maddə, cisim, canlı və cansız təbiətdə baş verən bütün proseslərin müəyyən qanunauyğunluqlarını fizika məhz şagirdlərin həyat bilgisindən öyrəndiyi biliklərə əsaslanaraq əlaqələndirir.

**5. Coğrafiya.** Fizika ilə coğrafiya kursunun əlaqələri olduqca geniş miqyaslıdır. Belə ki, bir çox qarşılıqlı əlaqəsi olan hadisələr məsələn, küləyin əsməsi, cisimlərin üzməsi və s. fiziki baxımdan izahat tələb olunan proseslərdir. Məhəldə cəhətlərin təyin edilməsində, alət və cihazlardan istifadə olunmasında fiziki biliklərin əhəmiyyəti olduqca böyükdür. Böyük su dövranını öyrənəndə də bu fənlər üzrə qazanılan biliklər çox əhəmiyyətlidir.

**6. Texnologiya.** Fizikanın tədrisi ilə texnologiyanın özünəməxsus əlaqəsi ondan ibarətdir ki, araşdırmaları icra etdikdə, materialları izah etdikdə əmək təlimindən qazanılmış praktik biliklərə və şagirdlərin özlərinin yerinə yetirdiyi işlərə istinad etmək lazımdır.

**7. İnformatika**. İnformatikadan qazanılmış bütün texniki biliklər fizikaya əsaslanır. Şagirdlər informasiya və kommunikasiya texnologiyalarının inkişafında fizikanın rolunu əlaqələndirirlər.

**8. Musiqi.** Fizikanın səs bölməsini öyrənəndə musiqi dərsindən öyrəndiklərini səslərlə əsaslandıraraq əlaqə yaratmaq olar.

**9. Təsviri incəsənət.** Fizikanın optika bölməsində təsviri incəsənətdən qazanılmış biliklər çox böyük əhəmiyyətə malikdir.

Fənlərarası inteqrasiya haqqında cədvəlin göstərişləri üzərində ayrıca dayanmaq lazımdır. Onlar fizika müəlliminə şagirdlərin başqa fənlərdən qazandığı hansı biliklərdən hər mövzunun öyrənilməsində

istifadə edə bilməsini təyin etməkdə kömək edir. Müəllim dərsə hazırlaşanda fənlərarası inteqrasiya cədvəlində göstərilmiş materialı bilməsi məqsədəuyğundur. Bu zaman müəllimin zəhmətinin bəhrəsi üzə çıxır və müəllimin nüfuzu yüksəlir. Eyni zamanda bu məktəbdə işləyən müəllimlərin arasında əlaqənin yaranmasına və güclənməsinə xidmət edir.

Eksperiment üç mərhələdə həyata keçirilmişdir:

**FƏNLƏRARASI İNTEQRASİYA CƏDVƏLİ**

| BÖLMƏ VƏ MÖVZULAR | | FƏNNİN ADI VƏ ALT STANDARTLARIN NÖMRƏSİ |
|---|---|---|
| 1. Fizika nəyi öyrənir | 1. Fizika nəyi öyrənir | C.2.1.1., C.2.1.4., B.4.2.1. B.2.1.3., Riy.1.2.5., C.2.1.6. C.2.1.3., İnf.1.2.3.,B.4.1.1.T-i 2.1.3. Tex1.3.2. |
| | 2. Fizika təbiət hadisələrini nə üçün öyrənir | C.2.1.1., C.2.1.4., B.4.2.1. B.2.1.3., Riy.1.2.5., C.2.1.6 Tex1.3.2. |
| | 3. Fizikada öyrənmə metodları | B.1.1.3., C.1.3.1., C.1.3.2., C.3.2.2. C.2.1.3., Riy.4.1.1., Riy.4.2.1. Tex1.3.2. |
| | 4. Fiziki kəmiyyətlər və onların ölçülməsi | B.2.1.3., Riy.1.2.5., C.2.1.6 B.1.1.3., C.1.3.1., C.1.3.2., C.3.2.2. C.2.1.3., Riy.4.1.1.,Riy.4.2.1. Tex1.3.2. |
| | 5. Olçü cihazları | B.1.1.3., C.1.3.1., C.1.3.2., C.3.2.2. C.2.1.3., Riy.4.1.1.,Riy.4.2.1. Tex.2.2.1. |
| | 6. Ölçmələrdə dəqiqlik | B.1.1.3., C.1.3.1., C.1.3.2., C.3.2.2. Tex1.3.2. |
| 2.Materiya | 7. Materiya: Maddə və fiziki sahə | C.2.1.1., H.-b.1.1.1., C.2.1.3., C.2.1.5. , B.4.1.1., B.4.2.2. İnf.2.1.1., İnf.2.1.2. B.2.1.2. Riy.4.1.1.,Riy.4.2.1. |
| | 8. Maddə və cisim | C.2.1.8., B.4.1.1., Inf.1.2.2., Inf.2.1.3. C.2.1.3., Riy.4.1.1., Riy.4.2.1. Tex1.3.2. |
| | 9. Atom və atom nüvəsi | B.4.1.1., B.3.2.1. C.2.1.3., Riy.4.1.1., Riy.4.2.1. Tex1.3.2. |
| | 10. Molekul. Makrocisim | B.4.1.1.,B.3.2.1. C.2.1.3., Riy.4.1.1., Riy.4.2.1. |
| | 11. Maddə. Maddənin aqreqat halları | C.2.1.8., B.4.1.1., İnf.1.2.2., İnf.2.1.3. C.2.1.3., Riy.4.1.1., Riy.4.2.1. Tex1.3.2. |
| 3. Maddə və onun xas-sələri | 12. Diffuziya | C.2.1.8. , B.4.1.1., İnf.1.2.2., İnf.2.1.3. B.4.1.1.,B.3.2.1. C.2.1.3., Riy. 4.1.1., Riy.4.2.1. |
| | 13. Maddənin istidən genişlənməsi | C.2.1.8. , B.4.1.1., İnf.1.2.2., İnf.2.1.3. B.4.1.1.,B.3.2.1. C.2.1.3., Riy. 4.1.1., Riy.4.2.1. |
| | 14. Cismin həcmi və onun ölçülməsi | B.1.1.3., C.1.3.1., C.1.3.2., C.3.2.2. C.2.1.3., Riy.4.1.1.,Riy.4.2.1. Tex.2.2.1. |
| | 15. Cismin kütləsi | C.2.1.8. , B.4.1.1., Inf.1.2.2., Inf.2.1.3. C.2.1.1., H.-b.1.1.1., C.2.1.3., C.2.1.5. , B.4.2.2. Inf.2.1.1., İnf.2.1.2. B.1.1.3., C.1.3.1., C.1.3.2., C.3.2.2. Tex1.3.2. |
| | 16. Cismin sıxlığı | C.2.1.8. , B.4.1.1., İnf.1.2.2., İnf.2.1.3. B.1.1.3., C.1.3.1., C.1.3.2., C.3.2.2. Tex.2.2.1. |
| | 17. Temperatur | B.4.1.1.,B.3.2.1. B.1.1.3., C.1.3.1., C.1.3.2., C.3.2.2. C.2.1.3., Riy.4.1.1.,Riy.4.2.1. Tex1.3.2. |
| 4. Qarşılıqlı təsirlər və hərəkət | 18. Qarşılıqlı təsirlər.Toxunma ilə baş verən təsirlər | C.2.1.3., Riy.4.1.1., Riy.4.2.1. Tex1.3.2. |
| | 19. Qravitasiya qarşılıqlı təsir-Günəş sistemi | C.2.1.1., H.-b.1.1.1., C.2.1.3., C.2.1.5. , B.4.2.2. Inf.2.1.1., Inf.2.1.2. B.2.1.2., İnf.2.1.1., . B.4.1.1.,B.3.2.1. |
| | 20. Elektrik qarşılıqlı təsir | C.2.1.1., C.2.1.4., B.4.2.1.C.2.1.1., H.-b.1.1.1., C.2.1.3., C.2.1.5. , B.4.1.1., B.4.2.2. İnf.2.1.1., İnf.2.1.2 ,B.3.2.1. |
| | 21. Maqnit qarşılıqlı təsir | C.2.1.1., C.2.1.4., B.4.2.1.C.2.1.1., H.-b.1.1.1., C.2.1.3., C.2.1.5. , B.4.1.1., B.4.2.2. İnf.2.1.1., İnf.2.1.2 ,B.3.2.1. Tex1.3.2. |
| | 22. Hərəkət. Mexaniki hərəkət | C.2.1.6., Riy.3.1.1., Tex.1.2.3., B.1.1.1.., Inf.1.2.3., B.4.1.1. C.2.1.3., Riy. 4.1.1. ,Riy.4.2.1. |
| | 23. Istilik hərəkəti | C.2.1.1., C.2.1.4., B.4.2.1. B.2.1.3., Riy.1.2.5., C.2.1.6. C.2.1.3., Inf.1.2.3.,B.4.1.1., Riy.4.1.1., Riy. 4.2.1. |
| | 24. Elektrik hərəkəti- Elektrik cərəyanı | C.2.1.1., C.2.1.4., B.4.2.1. B.2.1.3., Riy.1.2.5., C.2.1.6. C.2.1.3., İnf.1.2.3.,B.4.1.1., Riy.4.1.1.,Riy.4.2.1. |
| | 25. Enerji | C.2.1.6., Riy.3.1.1., Tex.1.2.3., B.1.1.1. C.2.1.3., Riy.4.1.1.,Riy.4.2.1. Tex1.3.2. |

*Az.d.-Azərbaycan dili, riy.–riyaziyyat, h-b. həyat bilgisi, tex.–texnologiya, t-i.–təsviri incəsənət, x-d. – xarici dil, inf. – informatika, f-t. – fiziki tərbiyə, mus. – musiqi, az.t. – azərb. tarixi, c.-coğrafiya, əd.-t. – ədəbiyyat, üm.t. - ümumi tarix, rus d.-rus dili*

1. Təsbitetdirici eksperiment.
2. Axtarıcı eksperiment.
3. Öyrədici eksperiment.

Bu zaman VI sinif şagirdləri ilə nəzəri və praktik suallardan ibarət anket sorğuları keçirilmiş, bu anketlərə verilən cavablar öyrənilmiş, müəllimlərin dərs və dərsdənkənar işləri müşahidə olunmuşdur.

Eksperimental tədqiqatın məqsədi VI sinif fizika fənni ilə riyaziyyat, biologiya, həyat bilgisi, coğrafiya, texnologiya, informatika, musiqi, təsviri incəsənət fənləri ilə fənlərarası əlaqəni həyata keçirməklə biliklərin sistemləşdirilməsinin və şagirdlərin fənnə maraqlarına, biliklərin keyfiyyətinə təsir dərəcəsinin yoxlanmasından ibarətdir.

Bu məqsədlə 2013-cü ilin oktyabr ayında şagirdlərin bilikləri nəzəri və praktik yoxlanmışdır. Bu tapşırıqlarda şagirdlərin kurikulum proqramına əsaslanaraq qazandıqları biliklər əsasında riyazi, bioloji, həyati biliklərlə əlaqəli, coğrafi, texnoloji, informasiyalara əsaslanan testlər və praktik tapşırıqların nəticəsi aşağıdakı kimi qiymətləndirilmişdir.

Aparılmış ilkin səviyyənin yoxlanması aşağıdakı kimi nəticə vermişdir:

Məktəblərdə işləyən fənn müəllimləri bir araya gətirilmiş və nəticələr müzakirə olunmuşdur. Axtarıcı eksperimentə qədər olan müddətdə praktik və nəzəri biliklərin yüksəldilməsi üçün fənlərarası inteqrasiya cədvəllərinə uyğun olaraq görüləcək işlər planlaşdırılmışdır.

Axtarıcı eksperimentin əsas vəzifələri bunlar olmuşdur:

1. Tədris materiallarının şagirdlər tərəfindən qəbul edilməsinin səviyyəsinin yoxlanması, tədris materiallarının korrektə edilməsi, ilkin praktik və nəzəri yoxlamaların həyata keçirilməsi.

2. Həmin fənlərə dair sistemləşdiril-

| Məktəb | Sinif | Şagirdlərin sayı (n) | Qiymətlər | | | | Müvəffəqiyyət göstəricisi K= $\frac{(n_2+n_4)}{n}$ .100% |
|---|---|---|---|---|---|---|---|
| | | | 2 (n1) | 3(n2) | 4(n3) | 5 (n4) | |
| İsmayıllı rayonu Lahıc qəsəbə tam orta məktəbi | VI | 22 | 1 | 9 | 6 | 6 | 54,5 |
| Şəhər 1 nömrəli tam orta məktəbi | VI | 19 | 2 | 7 | 6 | 4 | 52,6 |

miş təlim materiallarının quruluş, məzmun və tədrisi metodikasının təkmilləşdirilməsi əsasında şagirdlərin fizikaya marağının inkişafının asılılığını aydınlaşdırmaq.

3. Şagirdlərin fizikadan əldə etdikləri biliklərin keyfiyyətcə inkişaf dərəcəsinin müəyyənləşdirilməsi.

Axtarıcı eksperiment 2014-cü ilin dekabr ayında nəzəri və praktik şəkildə həyata keçirilmişdir.

Məktəblərdə işləyən fənn müəllimləri bir araya gətirilmiş və nəticələr müzakirə olunmuşdur.

Öyrədici eksperiment:

Tədqiqatımızın nəticəsi olaraq öyrədici eksperimentin məqsədi də müəyyənləşdirilmişdir: Fənlərin tədris materiallarının quruluşu, məzmunu və tədrisi metodikasının təkmilləşdirilməsi nəticəsində VI sinif şagirdlərinin fizikaya maraqlarının və biliklərinin keyfiyyətinə təsir dərəcəsinin müəyyənləşdirilməsi.

Bu mərhələdə aşağıdakı vəzifələr həll olunmuşdur:

1. Sistemləşdirilmiş tədris materiallarının quruluşu, məzmunu və tədrisi metodikasının təkmilləşdirilməsi üçün təklif olunan üsul və metodların səmərəliliyinin yoxlanılması.

2. Tədris materiallarının təkmilləşdirilmiş quruluşu, məzmunu və tədrisi metodikasının şagirdlərin fizikaya maraqlarına və biliklərinin keyfiyyətinə təsir dərəcələrinin müəyyən edilməsi.

3. Kurikulum proqramına əsasən tərtib olunmuş fənlərarası inteqrasiyanın fizika fənninin tədris keyfiyyətinin yüksəlməsinə təsirinin müəyyənləşdirilməsi.

2014-cü ilin aprel ayında aparılmış nəzəri və praktiki yoxlamalar zamanı şagirdlərin bilik keyfiyyətləri aşağıdakı kimi olmuşdur:

| Məktəb | Sinif | Şagirdlərin sayı (n) | Qiymətlər | | | | Müvəffəqiyyət göstəricisi K= (n2+n4).100% / n |
|---|---|---|---|---|---|---|---|
| | | | 2(nl) | 3(n2) | 4(n3) | 5(4) | |
| İsmayıllı rayonu Lahıc qəsəbə tam orta məktəbi | VI | 22 | 1 | 9 | 6 | 6 | 54,5 |
| Şəhər 1 nömrəli tam orta məktəbi | VI | 19 | 2 | 7 | 6 | 4 | 52,6 |

Həmin yoxlamanın nəticəsi:

İsmayıllı rayonu Lahıc qəsəbə tam orta məktəbi və 1 nömrəli şəhər tam orta məktəbi üzrə fizikanın tədrisində fənlərarası inteqrasiyadan istifadə etməklə şagirdlərin bilik keyfiyyətinin yüksəlməsi aşağıdakı nəticəni vermişdir:






Fizikadan fənlərarası inteqrasiya problemi üzrə aparılmış yoxlamanın nəticələri:

| Məktəb | Sinif | Şagirdlərin sayı | Tədris ilinin əvvəlində keyfiyyət % | Tədris ilinin sonunda keyfiyyət % | Fizika fənninin tədrisinin keyfiyyəti yüksəlmişdir % |
|---|---|---|---|---|---|
| Lahıc qəsəbə tam orta məktəbi | VI | 22 | 54,5 | 81,81 | 27,31 |
| 1 nömrəli şəhər məktəbi | VI | 19 | 52,6 | 73,68 | 21,31 |

**Tədris ilinin əvvəlində:**

1. Şagirdlər fizikanın maraqlı olduğunu qeyd edir, problemə aid suallar verirlər, lakin onların hamısı tam fəallıq göstərmir, lakin fəal təlim metodlarında, fəal oxu və yazıda, habelə elmi araşdırma işlərində həvəslə iştirak edirlər.

2. Fiziki hadisələrin elmi izahına maraq göstərir, lakin fiziki qanunauyğunluqların elmi-texniki tərəqqidə rolunu və əhəmiyyətini kifayət dərəcədə təsəvvür etmirlər.

3. Müstəqil işləri bütün şagirdlər yerinə yetirə bilmir, yalnız keyfiyyət xarakterli məsələlərin həllinə maraq göstərirlər.

4. Problemin həllində çətinliklərlə qarşılaşdıqda onları aradan qaldırmaqda tam müstəqil fəaliyyət göstərmir, müəllimin, yaxud da yoldaşlarının köməyi ilə aradan qaldırırlar.

5. Biologiyadan, coğrafiyadan əlaqəli məsələlərin həllində çətinliklərlə qarşılaşırlar. Səbəbi bu fənlərin VI sinifdən tədris olunmağa başlaması ilə əlaqədardır.

6. Riyaziyyat, həyat bilgisi, texnologiya, informatika, musiqi, təsviri incəsənət fənləri ilə əlaqəli məsələlərə şagirdlər daha çox meyillidirlər. Səbəbi bu fənlərin aşağı siniflərdən tədrisi ilə bağlıdır.

7. Fənn müəllimləri fənlərarası inteqrasiya cədvəlindən düzgün istifadə etmirlər.

**Tədris ilinin sonunda:**

1. Şagirdlər fizikanı ən maraqlı fənn kimi digər fənlərdən fərqləndirirlər. Bütün növ dərs və dərsdənkənar işlərdə fəal iştirak edir, problemin həllinə dair tez-tez suallar verirlər.

2. Fiziki proses, hadisə və qanunların elmi əsaslarını öyrənməyə can atır, bu biliklərin elm, texnika və istehsalatın hansı sahələrində mühüm rol oynadığını dərk edirlər.

3. Müstəqil işləri böyük həvəslə yerinə yetirir, keyfiyyət və kəmiyyət xarakterli mürəkkəb məsələləri həll etməyə çalışırlar.

4. Özünü "təlimləndirməyə" müstəqil can atır, problem irəli sürüb onu həll etməyə, qarşılaşdıqları çətinlikləri müstəqil aradan qaldırmağa çalışırlar.

5. Riyaziyyat, biologiya, həyat bilgisi, coğrafiya, texnologiya, informatika, musiqi, təsviri incəsənət fənləri ilə əlaqəli məsələləri şagirdlər tam dolğun şəkildə axtarıcılıqla yerinə yetirirlər.

6. Bu zaman artıq müəllimlər fənlərarası inteqrasiya cədvəlindən düzgün istifadə etməklə digər fənn müəllimləri ilə pedaqoji işi düzgün qururlar.

Əlavə :

VI sinif üzrə məzmun standartları

VI sinfin sonunda şagird:

- hadisələri (mexaniki, istilik, elektrik) fərqləndirir, onlara dair sadə məsələlər həll edir;
- materiyanın formalarını fərqləndirir, maddələrin aqreqat hallarını izah edir və sadə məsələlər həll edir;
- təbiətdəki əlaqəli sistemləri fərqləndirir və qarşılıqlı təsirə dair müşahidələri izah edir;
- sadə təcrübələr aparır və ölçü cihazlarından təhlükəsiz istifadə edir;
- fiziki hadisələrə əsaslanan məişət qurğularından istifadə edir;

• fizika elminin inkişafında dünya alimlərinin roluna dair məlumatları təqdim edir.

**Məzmun xətləri üzrə əsas və alt standartlar:**

1. Fiziki hadisələr, qanunauyğunluqlar, qanunlar

Şagird:

1.1. Fiziki hadisələrə dair bilik və bacarıqlar nümayiş etdirir.

1.1.1. Mexaniki, istilik, elektromaqnit hadisələrini fərqləndirir.

1.1.2. Müxtəlif xarakterli fiziki hadisələrə dair sadə məsələlər həll edir.

1.1.3. Hərəkəti növlərinə görə qruplaşdırır.

1.1.4. Müxtəlif xarakterli təbiət hadisələrinə dair müşahidələrini təqdim edir.

2. Maddə və sahə, qarşılıqlı təsir, əlaqəli sistemlər

Şagird:

2.1. Materiyanın formalarına dair bilik və bacarıqlar nümayiş etdirir.

2.1.1. Maddələri quruluşuna (aqreqat hallarına) görə fərqləndirir.

2.1.2. Materiyanın formalarını fərqləndirir.

2.1.3. Materiyanın formalarına dair müşahidələrini sadə şəkildə təqdim edir.

2.1.4. Maddələrin quruluşuna (aqreqat hallarına) dair sadə məsələlər həll edir.

2.2. Təbiətdəki əlaqəli sistemlərdə qarşılıqlı təsiri mənimsədiyini nümayiş etdirir.

2.2.1. Təbiətdəki əlaqəli sistemləri və qarşılıqlı təsirləri fərqləndirir.

2.2.2. Təbiətdəki qarşılıqlı təsirə dair müşahidələrini təqdim edir.

3. Eksperimental fizika və müasir həyat

Şagird:

3.1. Təcrübələr aparır, nəticələri təqdim edir.

3.1.1. Sadə ölçü cihazlarından istifadə edir.

3.1.2. Sadə təcrübələr aparır, nəticələrini təqdim edir.

3.2. Müasir həyatın inkişafında fizika elminin rolunu mənimsədiyini nümayiş etdirir.

3.2.1. İş prinsipi fiziki hadisələrə əsaslanan məişət qurğularından istifadə edir

3.2.2. Fizika elminin inkişafında dünya alimlərinin roluna dair sadə məlumatı təqdim edir.

*Rəyçi: dos. Ə.Gərayev*

**Р.Алиев**

**Проблема межпредметной связи по физике в подготовке учителей**

**Резюме**

В статье говорится о проблеме межпредметной интеграции в подготовке учителей. Педагог обратился и к схемам, определяющим уровень знания учащихся.

**R.Aliyev**

**The problem of interdisciplinary integration on physics in teacher training**

**Summary**

The article is dedicated to the problem of Interdisciplinary Integration on Physics in teacher training. Some schemes determining students’ knowledge level are also introduced in this article.



# ƏDƏBİYYAT FƏNNİNİN TƏDRİSİNDƏ İNTEQRASİYADAN İSTİFADƏ

**Asya Bəkirova,**
***Təhsil Problemləri İnstitutunun aparıcı elmi işçisi, pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *standart, informasiya, təhsil, inteqrasiya, motivasiya, resurslar.*
***Ключевые слова:*** *стандарт, информация, образование, интеграция, мотивация, ресурсы.*
***Key words:*** *standards, information, education, integration, motivation, resources.*

Təhsil proqramında mövzunun daha dərindən mənimsənilməsi üçün inteqrasiya əsas məsələlərdən biri kimi təqdim edilir. Həmin proqramda inteqrasiya cədvəl şəklində verilir, məzmun, strategiya və qiymətləndirməyə dair bölmələr arasında sıx əlaqə yaradılır. Gənc nəslin elmli və bir şəxsiyyət kimi inkişaf edərək formalaşmasında ədəbiyyat dərslərinin mühüm əhəmiyyəti vardır. Əlbəttə ki, öyrənməyi öyrənən, öyrəndiyini həyatda tətbiq edən, hərtərəfli təfəkkürə, dünyagörüşünə malik şəxsiyyət yetişdirmək üçün ədəbiyyat müəllimlərinin üzərinə çox böyük məsuliyyət düşür. Heç şübhəsiz, yeni dövrün tələblərinə cavab verən müasir dərs müstəqil və məsuliyyətli pedaqoji ustalığa əsaslanır. Tədris edilən mövzulara fənn kurikulumlarının tələbləri baxımından yanaşmaq, şagirdlərin müstəqil fikir söyləmələri, dərindən düşünmələri, mühakimə yürütmələri üçün müxtəlif üsul və vasitələrdən istifadə etmək müəllimlərin ümdə vəzifəsidir.

Ona görə də bu yazımızda ədəbiyyat fənninin məzmun standartlarını daha səmərəli həyata keçirmək üçün dərs zamanı inteqrasiyadan istifadə ön plana çəkildiyindən, belə dərsləri təşkil etmək ədəbiyyat müəllimindən ciddi elmi-metodik hazırlıq və böyük zəhmət tələb edir. Axı, ədəbiyyat, daha doğrusu, bədii ədəbiyyat həyatın inikasıdır, həyat hadisələri bu və ya digər şəkildə öz əksini bədii nümunədə tapır. Məhz inteqrativlik də burada özünü göstərir.

Məlum olduğu kimi, inteqrativ üsuldan istifadə bir anlayış olaraq son dövrlərdə işlədilir və təlim prosesində istifadəsi tələb olunur. İnteqrasiya bədii materialın məzmunundadır, ədəbi-bədii nümunə də dərsliklərdə inteqrativ şəkildə verilir. Hər hansı bir ədəbi fakt bu və ya digər informasiya ilə əlaqələndirilərkən, həmin faktın dəqiqliyi xüsusi əhəmiyyət kəsb edir. Ona görə də inteqrasiya dəqiq olmalıdır. Dəqiq olmayan inteqrativ fikir şagirdlərin biliyinin əhatəliliyinə kömək edə bilməz. Aydındır ki, inteqrativlik iki şəkildə özünü təsdiq edir: fənlərarası və fəndaxili əlaqələr əsasında – ona yaxın olan fənlərin inteqrasiyasında və yaxud da fənnin daxilində məsələ öz həllini tapır. Ədəbiyyat elə bir fəndir ki, bütün fənləri, daha doğrusu, incəsənətin bütün sahələrini, eyni zamanda Azərbaycan dili, tarix, coğrafiya, həyat bilgisi, riyaziyyat, informatika, təsviri incəsənət və s. fənləri inteqrasiya edə bilir. Bu mənada dərsliklərimiz hazırlanarkən, ədəbiyyatımızın geniş imkanları

nəzərə alınır, şagirdlərin mənəvi aləminin zənginləşməsində, estetik zövqlərinin inkişafında, dünyagörüşlərinin formalaşmasında əhəmiyyətli dərəcədə təsirli ola bilən mövzular salınır ki, tədris zamanı müəllimlərimizin belə mövzulara inteqrativ şəkildə yanaşması, təhlil aparması zəruridir. Ədəbiyyat tədrisində inteqrasiya, ilk növbədə, eyni sinifdə və müxtəlif siniflərdə söz sənəti, hər hansı mövzu, problem üzrə əlaqələndirilməsi başa düşülür. Heç şübhəsiz, təcrübə də onu göstərir ki, şagirdlər yeni bilik və bacarıqları əvvəl qazanılmış bilik və bacarıqlar zəminində mənimsədikdə, dediyimiz kimi, mövzu daha mükəmməl, daha dərindən qavranılır, yaddaqalan olur, eyni zamanda dərslərin maraqlı və məzmunlu qurulması, onlarda tədqiqatçılıq meyillərinin yaranması üçün vacib şərt sayılır. Qazanılan bilik və bacarıqların əlaqələndirilməsində, fənn daxilində səpələnmiş faktların sistemləşdirilməsində, ədəbi materialların ayrı-ayrı tədris vahidlərində cəmləşdirilməsində inteqrasiya mühüm vasitədir. Təhsil islahatında reallaşan kurikulumda bu məsələ konseptual sənədlərdə standartlarla təmin olunmuş, fənn kurikulumlarında inteqrasiya imkanları nümunələrlə şərh edilmişdir. Əlbəttə ki, burada müəllimdən təlim işini planlaşdırarkən konseptual sənədlərdən səmərəli istifadə etmək bacarığı tələb olunur.

**Məsələn, VI sinifdə “Ədəbiyyat”dan Yusif Balasuqunlunun “Qutadqu bilik-səadət gətirən elm” mövzusu** - 1.1.1. Müraciət zamanı sualları cavablandırır; 1.1.2. Dinlədiyi mətndəki yeni informasiyanı müəyyən edir; 2.1.1. Öyrəndiyi yeni söz və ifadələrdən mövzuya uyğun istifadə edir; “Həyat bilgisi” - 3.1.1. Ünsiyyət mədəniyyətinin formalaşmasına təsir edən amilləri dəyərləndirir; “Azərbaycan dili”- 4.1.1. Sağlam həyat tərzinin əsas şərtlərini fərqləndirir. “İnformasiya - 3.1.3. Proqramların müxtəlif variantlarla icrasını şərh edir; 3.3.1. İnternetdə sadə axtarışları icra edir” və s. fənlərin qeyd edilən standartları ilə inteqrasiya olunur.

Bu baxımdan müəllim ədəbiyyat dərslərində, hər hansı sinifdə olursa-olsun, yeni mövzunun qavranılmasına zəmin yaratmaq üçün əvvəlcədən inteqrativ əlaqə imkanlarını rellaşdırmaq üzərində düşünərək dəqiqləşdirməli, dərsin hansı mərhələsində hansı üsuldan istifadə edəcəyi barədə düşünməlidir. Ədəbiyyatın digər fənlərlə əlaqəsi zamanı müəllim inteqrasiya olunan fənləri ən azı orta səviyyədə bilməli və əlavə ədəbiyyatlar oxumalıdır ki, istənilən nəticəni əldə edə bilsin. Ona görə də müəllim yaradıcı olmalı, öz üzərində daima çalışmalıdır. Bu gün artıq qohum fənlərin yox, bir-birinə az da olsa, yaxınlığı olan fənlərin inteqrasiyası şagirdlərdə daha böyük marağa səbəb olur. Bütün bunları nəzərə alaraq, təcrübə kimi dinlədiyimiz bir dərs nümunəsindən bəzi hissələri yazımızda əks etdirməyi lazım bilirik:

**Mövzu: V sinifdə N.Gəncəvinin “Kərpickəsən kişinin dastanı” əsərinin təhlili**

Standart: 1.2.2.; 1.2.4.; 1.1.2.; 3.1.3.

Məqsəd: Şagirdlərdə: 1. Yazılı və şifahi nitqi inkişaf edir. 2. Təhliletmə bacarıqları təkmilləşir. 3. Əməyə və əməkçi insanlara qarşı məhəbbət hissi yüksəlir.

İnteqrasiya: Azərbaycan dili: 2.2.3.; 3.1.2.; Azərbaycan tarixi: 5.1.2.; İnformatika: 3.3.2.

İş üsulu: Şaxələndirmə, “Venn diaqramı”, müzakirə, rollu oyun.

Resurslar: Dərslik, iş vərəqləri, əyani vəsaitlər, kompyuter, proyektor.

Dərsin gedişi: Dərsə fəallaşdırma ilə başlayıram. Hər bir şagirddən əmək, zəhmət, halallıq haqqında bir atalar sözünü söyləməsini xahiş edirəm.

I. Motivasiya

Proyektorla əvvəl dahi Nizaminin

portreti, sonra müxtəlif peşə sahiblərinin iş prosesindəki şəkilləri göstərilir. Şagirdlər slaydlara baxa-baxa həmin peşə haqqında məlumat verirlər. Onlara sual verirəm ki, bu peşələri birləşdirən ümumi cəhət nədir? Şagirdlər düşünərək cavab verirlər ki, bu peşələri birləşdirən ümumi cəhət əməkdir. Sonra proyektorla Nizami Gəncəvinin əsərləri göstərilir. "Sirlər xəzinəsi" və mövzu haqqında qısa məlumat verirəm.

**Tədqiqat sualı**

İnsan həyatında əməyin rolu nədən ibarətdir?

**II. Tədqiqatın aparılması**

Tapşırıq 1. N.Gəncəvinin "Kərpickəsən kişinin dastanı" şeirində tanış olmayan sözlərin mənasını lüğətdən istifadə etməklə aydınlaşdırın.

Tapşırıq 2. Hekayənin mövzusuna aid plan qurun.

Tapşırıq 3. Mətndən iki mürəkkəb söz və iki antonim söz seçin. Əmək mövzusunda yazılmış şeirlərdən bir bənd yazın.

Mürəkkəb sözlər: kərpickəsən, birdən-birə, ac-tox, qoca-cavan və s.

Beləliklə, müəllim fənlər arasında inteqrasiya yaratmaqla dərsi yekunlaşdırır və qeyd edir ki, bəli, əmək insan xoşbəxtliyinin açarıdır. Hər kəs öz həyatını əməyə bağlamalıdır. Dövlətimiz də əməyə, əmək adamlarına həmişə yüksək diqqət və qayğı göstərir.

Müəllim bilik və bacarıqları şagirdlərin iştirakı ilə müəyyən meyarlar üzrə qiymətləndirir və dərsdəki "Araşdırma müzakirə, yaradıcı iş" başlığı altında təklif olunmuş işin icrasını evə tapşırıq verir. Daha sonra inteqrativ yol seçərək dərs şagirdlərin ifasında "Sabahın ustaları" mahnısı ilə başa çatır və bununla da müəllim üç fənnin - Azərbaycan dili, musiqi, həyat bilgisi fənlərinin qovuşuğunda məqsədinə nail olur.

Başqa bir nümunə: Müəllim yuxarı siniflərdə N.Gəncəvinin tərcümeyi-halına dair məlumat verərkən inteqrasiya yolu ilə M.Ə.Rəsulzadənin "Azərbaycan şairi Nizami" adlı əsərində verdiyi məlumatdan da istifadə edə bilər. Fikrimizcə, M.Ə.Rəsulzadənin adı qeyd olan əsəri Nizami haqqında ən maraqlı tədqiqatlardandır. Bu əsərdə "Nizaminin tərcümeyi-halı" adlı xüsusi başlıq verilir. Həmin hissədə tədqiqatçı müxtəlif faktlara müraciət edərək, onun ömür boyu Gəncədə yaşadığı qənaətinə gəlir.

Biliyin inteqrasiyası müəllimdən müəyyən dərəcədə tədqiqatçılıq tələb edir. O, qarşıdakı dərsdə şagirdlərə çatdıracağı mövzu üzrə ciddi hazırlaşmalıdır. Onu da qeyd etməyi lazım bilirik ki, inteqrasiya mövzu ilə bağlı müxtəlif mənbələrdəki məlumata bələd olmaq deyil, toplanan materialı nəzərdə tutulan sinfin səviyyəsində standartlarda reallaşdırmaq, sistemləşdirmək və onları şagirdlərə çatdırmaq üçün daha səmərəli metod barəsində düşünmək tələb edir. İnteqrasiya pərakəndəliyə, sistemsizliyə yol vermək mənimsəməyə nəinki kömək etmir, əksinə bir qədər də çətinləşdirir.

İnteqrativ təşkil olunmuş dərs şagirdlərə öz yaradıcılıq bacarıqlarını, düşündüklərini həyata keçirmək imkanı qazandırır. Şagirdlər dərs prosesində sərbəst şəkildə öz fikir və mülahizələrini ifadə etməyi, əldə etdiyi təəssüratları yoldaşları ilə bölüşməyi bacarır. Ən əsası isə bu prosesdə şagirdlərdə idraki maraq və fəallıq artır, inkişaf edir. Ədəbiyyat fənni üzrə istənilən mövzu şagirdlərdən real həyatdan aldıqları bilik və bacarıqları inteqrativ dərs prosesində fəallaşdırılmasını tələb edir.

Müxtəlif mövzuların əlaqələndirilməsi öyrədilən materialların asan mənimsənilməsinə, obrazlı təfəkkürün inkişafına kömək edir. Belə əlaqələndirmə nəticəsində şagirdlər bir həqiqəti dərk edirlər ki, təbiətdə və cəmiyyətdəki hadisələr bir-biri ilə əlaqəli şəkildə baş verir.

Bütün bunlardan sonra hər hansı fən-

nin tədrisində şagirdlər nəyi öyrəndiklərini bilməli və bu dərsdən zövq alaraq şəxsiyyət kimi formalaşmağa istiqamətləndirilməlidirlər. Müəllim yaxşı nəticələrə nail olmaq üçün daim pedaqoji yenilikləri izləməli, metodiki hazırlığını, psixoloji fəaliyyətini yüksəltməyə səy göstərməlidir.

*Rəyçi: pedaqogika üzrə fəlsəfə doktoru Q.Əmircanova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri: Aydın Əhmədov, Ənvər Abbasov. Ümumi təhsildə inteqrasiya. Bakı: Mütərcim, 2014.
2. Əhmədov A., Abbasov Ə. Təhsilin prioritet istiqamətlərindən biri. //Azərbaycan məktəbi, 2014, № 5.
3. Mikayılov Ş., Bəkirova A. Ümumtəhsil məktəblərinin V-XI siniflərində ədəbiyyatın tədrisi metodikası. Bakı: Naksuana, 2008.
4. Mikayılov Ş., Bəkirova A. və b. Ədəbiyyat dərslərində inteqrasiyadan istifadənin imkan və yolları. Bakı, 2006.
5. Muradova S. Tarix fənninin digər fənlərlə inteqrasiyası. //Kurikulum, 2012, №1.
6. Haqverdiyeva K. “Həyat bilgisi” fənnində inteqrativlik. //Kurikulum, 2008, №2.
7. Rahmankulova S. Təhsildə İKT-dən istifadə və inteqrasiya imkanları. //Kurikulum, 2013, № 1.
8. Abbasov Ə. Ümumi təhsil strategiyaları: bəzi psixopedaqoji xüsusiyyətlər. //Azərbaycan məktəbi, 2014, № 6.
9. Həsənli B. Təhsilin inkişaf strategiyası və müasir dərsin təşkili problemləri. //Azərbaycan məktəbi, 2014, № 6.

**А.Бекирова**

**Использование интеграции на уроках литературы**
**Резюме**

Интеграция играет большую роль в усвоении содержания образования, практическом применении теоретических знаний и формировании мировоззрений учащихся.

В статье раскрывается сущность интеграции. Интерактивное обучение служит для продуктивности уроков и активности учеников в учебном процессе. В статье еще дано интеграция предмета Литературы с другими предметами как – Азербайджанский язык, История Азербайджана, Информатика, Музыка и Познание мира и т.д.

**A.Bekirova**

**Applying integration in teaching literature**
**Summary**

This article deals with the applying integration standards in teaching Literature and its effectiveness developing students’ life skills. Integration develops students’ theoretical knowledge into practice and scientific view to the life.

Today teaching literature required to integrate ICT skills or Music during learning process. This article presents different ways of integration into the classroom and motivates teachers and students for learning. The types of integration: inter-subject and intra-subject integration have been mentioned in this article and shown how to develop classroom activities effectively.



# MOTİVASİYANIN ZƏRURİLİYİ

**Lalə Lətifova,**
**Ağcəbədi şəhər 1 nömrəli tam orta məktəbin müəllimi**

Azərbaycan təhsilinin bütün pillələrində doğma dilimizin öyrədilməsi üçün hər cür şərait yaradılmışdır. Bu da təbiidir. Çünki öz məziyyətlərinə görə Azərbaycan dili qədim yazı ənənələri və sabitləşmiş ədəbi normaları olan dövlət dili statusundadır və artıq o, dünyanın inkişaf etmiş dilləri sırasında özünə yer tutmaq imkanlarına malikdir. Ölkəmizdə dilimizin inkişafına dövlət tərəfindən ardıcıl qayğı göstərilir.

Bu gün dövlət qayğısı ilə əhatə olunmuş təhsil ocaqlarımız doğma dilimizin saflığını qoruyan və inkişaf etdirən ən etibarlı məbədgahdır. Bir danılmaz həqiqəti də qeyd etmək lazımdır ki, ana dilimizin dövlət dili kimi tətbiqində, onun imkanlarının genişlənməsində və xalqımızın ən qiymətli sərvəti kimi dəyərləndirilməsində ulu öndər Heydər Əliyevin misilsiz xidmətləri olmuşdur.

Artıq hamıda belə bir fikir formalaşmışdır ki, ana dilini mükəmməl bilməyən, düzgün danışmağı, yazmağı, öz fikirlərini aydın ifadə etməyə qabil olmayan insanı mədəni insan hesab etmək olmaz. Hətta zəngin dili olmayan cəmiyyəti də mədəni cəmiyyət hesab etmək düzgün deyildir.

Bir danılmaz həqiqət var ki, ana dilimizin dövlət dili kimi tətbiqi, onun imkanlarının genişləndirilməsi və Azərbaycan xalqının ən böyük sərvəti kimi dəyərləndirilməsi müstəqillik illərində daha yüksək səviyyəyə qalxmışdır. Azərbaycan mədəniyyətinin və zəngin tarixi irsimizin dünya ictimaiyyətinə tanıdılması imkanlarının yaradılması öz təsirini göstərmişdir.

Dil tədrisində də motivasiya önəmli məsələdir. Tədrisdə motivasiya zəruri prinsiplərdəndir. Çünki o, fəal dərsin vacib komponenti olub təfəkkür prosesini hərəkətə gətirən və şagirdin idrak fəallığına təkan verən prosesdir. Tədrisdə həmişə müəllim qarşısında belə sual durmalıdır: “Motivasiyanı necə həyata keçirə bilərəm?”. Hər şeydən əvvəl, müəllimlər məsələlərin izahına ayrıca yer verməlidir. Şagirdlərə yeni biliklər verməlidir. Məsələn, dil hər bir fərdin, ümumilikdə isə xalqın mövcudluğunu şərtləndirir, onu bəşər mədəniyyətinə qovuşdurur. Azərbaycan dili təbiətən obrazlı dildir. Ahəngdarlıq, lirizm də dilimizin təbiətindən doğur. Bugünkü dilimiz öz vüsəti ilə zəngin tarixə, güclü ənənəyə malikdir. Ədəbi dilimiz isə ümumxalq dili inkişafının yeni mərhələsidir. Əslində ədəbi dil xalqın və onun yaratdığı bütün ədəbiyyatın - ədəbiyyat tarixinin dilidir ki, tarixən yaşamış görkəmli sənətkarların dilindən ayrı düşünülə bilməz. Ədəbi dil tarixinin də, tarixi qrammatikasının da tədqiqat materialı klassik ədəbi irsdir, yəni hər növ əlyazmalar, kitabələr, şifahi və yazılı, elmi və bədii əsərlərdir. Əlbəttə, folklor dili, xalqın şifahi-bədii yaradıcılıq dili də ədəbi dilin ilkin şəklidir. Yeri gəldikcə tarixi faktlara da müraciət olunmalıdır.

Motivasiyada dərsin nəticəsi onun müvəffəqiyyətlə həyata keçirilməsindən asılıdır. Dilin tədrisində unudulmamalıdır ki, həm şifahi, həm də yazılı ədəbi dil normaları bir-biri ilə həmahəng öyrədilməlidir. VIII əsrdən başlayaraq ərəb və fars dilləri rəsmi ədəbi dil kimi növbələşirdisə, Azərbaycan ədəbi dilinin daha qədim tarixə malik şifahi qolu heç bir təsirə məruz qalmadan xalq dili-

nin zəminində öz inkişafını davam etdirməkdədir. Buna görə də şifahi ədəbi dil müəyyən mənada yazılı ədəbi dilimizin əsası və ilki olmuşdur. Deməli, XIV-XV əsrlərdə yazılı ədəbi dil birdən-birə klassik səviyyəyə yüksəlməmişdir, onun güclü şifahi ədəbi dil zəmini olmuşdur. “Dədə Qorqud”un, “Qisseyi Yusif”in, “Əhməd Hərami dastanı”nın şifahi-bədii xalq yaradıcılığı ilə səsləşməsi həm də yazılı dilin folklorla qarşılıqlı əlaqədə inkişaf etdiyinin bariz ifadəsidir.

Dilimizin şagirdlərə sevdirilməsində ilk şifahi kitabımızın xatırladılması da maraqla qarşılanır. “Kitabi-Dədə Qorqud” dil tədqiqatı üçün zəngin material verən əsərdir. Birinci, ona görə ki, müəyyən əsrlərdə bir neçə dəfə yazıya alındığından orada bir neçə əsrin dil xüsusiyyətləri qorunub saxlanılıb.

İkinci, ona görə ki, burada dəyişdirilməyə məruz qalmayan şeirlər, söyləmələr və s. vardır. “Kitabi-Dədə Qorqud”un, “Türk dilləri qamusu”nun tapılması ümumtürk folklor tarixini də qədim dövrlərə aparıb çıxardı, yazılı və şifahi ədəbiyyatın ayrı-ayrı növlərinin qədim tarixə malik olduğu barədə yeni fikir söyləmək imkanlarını genişləndirdi.

“Kitabi-Dədə Qorqud”un çox orijinal üslubu, səpgisi var. Ərəb və farsdilli ədəbiyyat abidələrində bu üsluba, səpgiyə rast gəlmirik. Bəs bu üslub-ənənə haradan başlanıb gəlir? Bu, birdən-birə yarana bilməzdi. “Söz söylədi”, “boy boyladı” ifadələri böyük maraq kəsb edir. “Boy” janrı bizə məlum olan ədəbiyyatlarda yoxdur. Bəlkə, elə “Koroğlu” dastanındakı “səfərlər”, “qollar” bu “boy” janrının sonrakı şifahi davamıdır?! Dastanların dili ilə “Orxon-Yenisey” abidələrinin dili arasında olan güclü ümumilik onların qədimliyini bir daha təsdiq edir.

Mövzulara uyğun olaraq türk dillərini də yada salıram. Orta əsrlər dövrü Şərq dilçiliyində diqqəti cəlb edən alimlərdən biri Mahmud Kaşğaridir. Görkəmli türkoloq-alim M.Kaşğari XI əsrdə yaşamışdır. Bu dahi alimin türk dillərinin sintaktik quruluşuna həsr etdiyi “Kitabi-cəvahirul-nəhv-fil-lüğət-it-türk” adlı əsəri hələ də tapılmamışdır. M.Kaşğari “Divani-lüğət-it-türk” adlı əsəri yazmaq məqsədi ilə Türküstanı, Sibiri və Volqa çayı boyu ölkələri, şəhərləri bir-bir gəzib dolaşmış, türkdilli xalqları yaxından öyrənmiş, bu və ya başqa sözün ayrı-ayrı xalqlarda necə və hansı mənalarda işləndiyini dəqiq müəyyən etmiş, nəhayət, olduqca zəngin bir ədəbi abidə yaratmışdır.

Şagirdlərin qazandıqları biliklərə əsaslanaraq orta əsrlər ədəbi dilinə də ekskurs edirəm. XIV-XV əsrlərdə Azərbaycan şeir dili ərəb, fars dilləri ilə mübarizə şəraitində olsa da, öz əsl inkişaf yolunda idi. Türk dillərində danışan xalqlar da həm ərəb, həm də fars dilindən yaxa qurtarmaq istəyirdilər; özbəklərdən Əmir Əlişir Nəvai, azərbaycanlılardan Nəsimi, Füzuli və başqaları bu sahədə fədakarlıq göstərmişlər. Bu mərhələ Azərbaycan şeir dilinin inkişafı tarixində klassik mərhələ idi. Biz bunu Nəsimi mərhələsi də adlandıra bilərik. Ərəb və fars dili təsirinə qarşı Azərbaycan klassik şeir dili və üslubu ənənəsini möhkəmlətmək Nəsiminin üzərinə düşmüşdü. Dövrü nəzərə aldıqda Nəsiminin dili canlı ifadə, tələffüz tərzləri, məişət-danışıq səciyyəli söz və ifadələrlə zəngindir. Müasir dilimizlə Nəsiminin dili arasında bağlılıq yaradan bu cəhətlər maraq doğurur. Məsələn, təkcə “ey” nidası ilə deyilən xitablara nəzər salsaq, şairin xalq dilinin ifadə zənginliyinə dərindən bələd olduğu qənaətinə gələ bilərik:

“Sənsiz, ey can, könlüm aram eyləməz”
“Ey mələk surətli dilbər, can fədadır yoluna”.

Azərbaycan dilinin inkişafı tarixində dildə sözə qənaət, yığcamlıq keyfiyyəti dərin köklərə malikdir. Ədəbi dilin formalaşdığı ilk dövrlərdən – Dədə Qorquddan, Həsənoğludan, Nəsimidən bir ənənə şəklində davam edib gələn bu məziyyət XV-XVII

əsrlərdə Kişvərinin, Xətainin, Füzulinin, Sarı Aşığın, Qövsinin və b. şəxsində öz inkişafının zirvəsinə yüksəlmişdir.

Hikmətli sözlərə, şirin ibarələrə müraciət edib, fikri və düşüncəni obrazlı və yığcam şəkildə ifadə etmək keyfiyyəti Azərbaycan dilinin daxili məziyyətidir. Füzuli Azərbaycan xalq dilinin bu məziyyətini layiqincə dərk edən, onun ənənələrinə sadiq qalan sənətkar idi. O, fikri yığcam deməklə mətləbi uzatmaqdan qaçır. Ümumxalq dilinin əsl adi ifadə vasitələrindən danışıq dilinə məxsus tam, sadə söz və birləşmələrdən, məcazlardan istifadə şairin misra, beyt və bəndlərini həcmcə sıxmış, qiymətcə artırmışdır. Şairin:

“Nərgis ki, göz açdı bağə girdi,
Bir baxmağilən özün itirdi”

– beytində canlı tələffüz əsasında işlədilmiş baxmağilən sözü bir yana, “Nərgiz ki, göz açdı” ifadəsi bədii həqiqətə nə qədər uyğundur.

Azərbaycan şifahi xalq yaradıcılığı və yazılı ədəbiyyatda XVI əsrin sonlarından başlayaraq güclənən qüvvətli realist meyillər öz inkişafının zirvəsində Vaqifi yetirmişdi. Vaqif cəsarətlə şeirimizə ailə və yaşayış tərzi ilə sıx əlaqədar yeni söz və ifadələr gətirmişdir. Xalqın dərdi, həyat və mənafeyi ilə bağlılıq Vaqif şeirində xəlqiliyin mühüm əlaməti kimi meydana çıxmış olur.

Yuxarıdakıların mənimsədilməsi XX əsr ədəbiyyatının dilinə də maraq oyadır. C.Məmmədquluzadənin çoxcəhətli yaradıcılığı dildə sadəlik və realizm məsələsini bütünlüklə əhatə edir. Böyük ədib istər öz bədii əsərlərində, istərsə də başçılıq etdiyi “Molla Nəsrəddin” məcmuəsində ədəbi dilimizi dəyişdirə, onun inkişafına təkan verə biləcək bir istiqamət seçmişdi. Ə.Haqverdiyev, C.Cabbarlı, M.S.Ordubadi və başqalarının dili və üslubu bu realist istiqamətin yeni uğurlu addımları idi.

C.Məmmədquluzadə “Anamın kitabı”nda dövrün təlim-tərbiyə işinin vəziyyətini, milli məktəblərdə keçirilən ana dili və ədəbiyyat dərslərinin nə halda olduğunu bədii şəkildə ümumiləşdirib vermək istəmişdir. C.Məmmədquluzadəyə görə, kütləyə, camaata, xalqın tərəqqi və inkişafına xidmət etməyən bilik, elm, dərs, kitab və s. heç nəyə gərək deyil. Ədib hesab edir ki, ehtiyac olmadan ana dilində, xüsusilə əcnəbi sözlərin işlənməsi dili ümumxalq kütlələri üçün anlaşılmaz hala salır, oxumaq, elm öyrənmək və maariflənmək işləri çətinləşir.

XIX-XX əsrlərin elmi və dil üslubunun inkişafında M.F.Axundov, H.Zərdabi ilə birlikdə inkişaf yoluna düşən elmi dil və üslubun güclü təsiri olmuşdur. Xüsusən F.Köçərlinin əsərlərində milli dilin zəmini üzərində yaradılan elmi istilahlar xüsusi əhəmiyyət kəsb edir. Məsələn, azadəlik, hüriyyətpərəst, xoştərkib, ruhtəzələyən, fərəhgətirən və s. kimi yeni söz və ifadələrlə, canlı dil hesabına elmi terminalogiyanı zənginləşdirir. Onun “Azərbaycan tarixi materialları” adlı məhşur əsərinin ilk səhifələri nəzəri mülahizələri ilə başlayır. Azərbaycan ədəbi dil tarixində satira dili və üslubunun əlamətləri özünü məhz poeziya sahəsində daha erkən göstərmişdi. Bu satirik poeziya dili və üslubu M.Ə.Sabirlə zirvəyə yüksəldi və “ədəbi məktəb” şəklini aldı. “Şairəm, əsrimin ayinəsiyəm” – deyən şair dilə, danışmağa, sözə, ifadəyə də eyni mövqedən yanaşır. Şair sözü şax üzə deməkdən çəkinməzdi. O, yeni bir prinsip əsasında– tipləri danışdırmaqla ana dilinin geniş imkanlarına əl ata bilmiş və bununla Azərbaycan şeirinin ümumxalq xarakterini son dərəcə qüvvətləndirmişdi. Bu üslub  artıq nə Füzuli, nə də Vaqif üslubudur. Bu üslub novatorluqdur, ancaq Sabirə məxsus bir keyfiyyətdir.

Ulu öndər Heydər Əliyevin hakimiyyət yolunu şərəflə, ləyaqətlə davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin imzaladığı

"Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında" 23 may 2012-ci il tarixli sərəncamda nəzərdə tutulmuş tədbirlərin həyata keçirilməsi Azərbaycan dilinin cəmiyyətdə rolunun daha da möhkəmləndirilməsinə istiqamət vermişdir.

Bu işdə məktəblərin üzərinə böyük vəzifələr düşür. Uşaqlar məktəbdə ana dilinin incəliklərinə yiyələndikcə, dili də sevməyə başlayırlar.

Ümumtəhsil məktəblərində aşağı siniflərdə şagirdlərə Azərbaycan dilinə dair praktiki vərdişlər aşılanır. X-XI siniflərdə isə Azərbaycan dilinin tarixi inkişaf yoluna nəzər salınır, dilimizin məziyyətləri barədə şagirdlərdə aydın təsəvvürlər yaradılır. Yeri gəlmişkən qeyd etmək lazımdır ki, IX və X siniflər üçün "Azərbaycan dili" dərsliklərinin (müəlliflər akademik Tofiq Hacıyev, AMEA-nın müxbir üzvü Nizami Cəfərov, professor Nizami Xudiyevdir, elmi redaktoru isə dosent Nəcəf Nəcəfovdur) proqram tələblərinə tam riayət olunan mükəmməl dərsliklərdir. X sinfin dərsliyində "Dil haqqında ümumi məlumat", "Azərbaycan dilinin quruluşu", "Nitq mədəniyyəti", XI sinifdə "Morfoloji quruluş", "Sintaktik quruluş" kimi bölmələr vardır. XI sinifdə böyük bir bölmə "Üslubiyyət" adlanır. Burada şagirdlər "Bədii üslub", "Elmi üslub", "Məişət üslubu", "Fərdi üslub" və b. mövzular üzrə artıq dilimiz haqqında çox zəngin məlumata yiyələnirlər. Dərslərdəki materiallar əsasında motivasiyanın məqsədyönlülüyü öz yerini tutur.

Bu dərsliklər həm də materialla çox zəngindir. Burada Azərbaycan Respublikası Prezidentinin dil haqqında fərmanlarının mətni də verilmişdir. Müəlliflər çox sadə, lakin elmi dildə, hər fikrin aydın üslubda nəzərə çatdırılmasına diqqətlə yanaşmışlar. Necə deyərlər, kitab oxunaqlı dildə yazılmışdır. Təsadüfi deyildir ki, bu dərsliklər haqqında mətbuatda da ciddi iradlar getməmişdir. Nəticələr də fərəhləndiricidir. X və XI sinfin "Azərbaycan dili" dərslikləri dilimizi sevməyin hər kəsin mənəvi borcu olduğu qənaətini möhkəmləndirir. Ona görə də təhsilimizin məzmununda edilən dəyişiklikləri, yeni tələbləri nəzərə alaraq, şagirdlərimizə doğma dilimizi sevdirməyə ən ümdə vəzifələrdən biri kimi baxılmalıdır. Onun sevdirilməsi üçün fəal təlim üsullarından ardıcıl istifadə edilməlidir.

*Rəyçi: dos. B.Həsənli*

**İstifadə edilmiş ədəbiyyat**

1. Hacıyev T., Cəfərov N., Xudiyev N. Azərbaycan dili. X sinif üçün dərslik. Bakı: Aspoliqraf, 2005.

2. Hacıyev T., Cəfərov N., Xudiyev N. Azərbaycan dili. XI sinif üçün dərslik. Bakı: Aspoliqraf, 2005.

3. Xudiyev N. Heydər Əliyev və Azərbaycan dili. Bakı, 2004.

**Л.Лятифова**

**Мотивация необходима**

**Резюме**

В статье говорится об историческом развитии азербайджанского языка, о роли школьных учебников в этой области, а также повествуется о предстоящих задачах учителей азербайджанского языка.

**L.Latifova**

**Motivation is importance**

**Summary**

In this article it is spoken about the historical development of Azerbaijan language, the role of school textbooks and about Azerbaijan language teachers' duties on these issues.



# QƏRBİ AZƏRBAYCAN ŞİVƏLƏRİNDƏ QƏDİM SÖZLƏR

**İbrahim Bayramov,**
***filologiya üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *Qərbi Azərbaycan, şivə, qədim sözlər.*
***Ключевые слова:*** *Западный Азербайджан, наречие, древние слова.*
***Key words****: Western Azerbaijan, dialect, ancient words.*

Azərbaycan təhsilinin, Azərbaycan dilinin tarixinin, inkişaf yolunun öyrənilməsi zamanı Qərbi Azərbaycan ərazisi yaddan çıxarılmamalıdır. Çünki Qərbi Azərbaycan bütöv Azərbaycanın bir tərkib hissəsi olmuşdur.

İndi Ermənistan adlanan Qərbi Azərbaycan şivələrinin öyrənilməsi XX əsrin 60-cı illərinə təsadüf edir.

Qərbi Azərbaycanın Çəmbərək, Karvansaray, Basarkeçər, Böyük Qarakilsə, Dağ Borçalısı (Calaloğlu, Kalinino), Barana, Ağbaba, Quqark rayonunun Azərbaycan şivələri qərb ləhcələrinin, Dərələyəz, İrəvan, Zəngibasar, Qarakilsə (Sisyan), Meğri, Qafan rayonunun Azərbaycan şivələri isə cənub qrupu ləhcələrinin xüsusiyyətlərini özündə əks etdirir.

Qərbi Azərbaycan şivələrinin leksikası zənginliyi, qədimliyi ilə seçilir və diqqəti cəlb edir. Bu şivələrdə tarixin qədim qatları ilə səsləşən sözlər dilimizin tarixi üçün əhəmiyyət daşıyır.

Qərbi Azərbaycan şivələrində Orxon-Yenisey abidələri, “Kitabi-Dədə Qorqud” dastanı, M.Kaşğarinin “Divani-lüğət-it-türk” əsəri ilə səsləşən kifayət qədər sözlər qorunub saxlanmışdır.

Ağız sözü Çəmbərək, Karvansaray şivələrində “yenicə doğmuş inək, camış və qoyunun ilk südü” mənasında işlənir. Ağız Şəki, Zaqatala, Qax şivələrində “qaramalın doğandan sonra ilk südü”, Ağdaş, Qax, Zərdab və Şəki şivələrində həm də “yeni doğan qaramalın ilk südündən bişirilən yemək” (pendir kimi olur) mənalarını ifadə edir.

Ağız sözü M.Kaşğarinin “Divani-lüğət-it-türk” əsərində ağuc fonetik formasında işlənmişdir və lüğətdə göstərilir ki, ağuc “ağız südü”, “inək və ya qoyun doğandan sonra sağılan ilk süd” mənasını bildirir.

Aŋarı sözünə “o tərəf” mənasında Ağbaba şivəsində anari, Çəmbərək şivəsində aŋarı, anqarı fonetik formalarında rast gəlinir.

Aŋarı Gəncə, Qazax, Şəmkir, Tovuz şivələrində “o tərəf, o yan”, “o biri tərəf”, “kənar” mənalarında aŋarı formasında işlənir. Aŋarı “Kitabi-Dədə Qorqud” dastanında “o tərəf” mənasında işlənmişdir.

Arı sözü Qərbi Azərbaycanın Çəmbərək, Dərələyəz, Kalinino şivələrində “təmiz, saf, pak” mənasını bildirir. Arı sözünün Qazax, Quba, Füzuli, Ağdam, Şahbuz, Şəmkir, Tovuz şivələrində də eyni mənada işləndiyinə rast gəlinir. Bu söz Bakı, Xaçmaz şivələrində ari fonetik formasında işlənir. Arı sözünə “Kitabi-Dədə Qorqud” dastanında “təmiz” mənasında həm arı, həm də aru fonetik formalarında rast gəlinir.

Qədim leksik vahid kimi arı

M.Kaşğarinin "Divani-lüğət-it-türk" əsərində eyni mənada arığ formasında işlənmişdir.

Arı Qərbi Azərbaycanın Ağbaba, Qarakilsə (Sisyan), Çəmbərək, eləcə də Azərbaycanın Qazax, Şəki şivələrində "təmizləmək" mənasında işlənən arıtdamax, müasir Azərbaycan ədəbi dilində işlənən arıqlamaq sözündə də arı öz izini qoruyub saxlamışdır.

Qərbi Azərbaycan şivələrində işlənən qədim sözlərdən bir də aş sözüdür. Aş Qərbi Azərbaycanın Çəmbərək, Zəngibasar şivələrində "plov", Basarkeçər şivəsində plovla yanaşı "əriştə" mənasını bildirir.

Aş "Kitabi-Dədə Qorqud" dastanında "xörək", "yemək", "bişmiş", M.Kaşğarinin "Divani-lüğət-it-türk" əsərində "yemək", "aş" mənasında işlənmişdir.

Qərbi Azərbaycanın Çəmbərək, Vedibasar, Zəngibasar şivələrində bağır sözü "bağır, qucaq, sinə, ürək" mənalarını bildirir. Bu sözə "ürək, qəlb" mənasında Quba, Şəki, Ağdam, Cəlilabad, Füzuli şivələrində rast gəlinir.

Bağır "Kitabi-Dədə Qorqud" dastanında "ürək, qəlb" mənasında işlənmişdir.

Qərbi Azərbaycanın Meğri şivəsində "boyummax" sözü işlənir və bu söz "varlanmaq" mənasını bildirir. Bu sözə Meğri şivəsində həm də "boyınmaq" formasında rast gəlinir. "Kitabi-Dədə Qorqud"da "dövlətlənmək", "zəngin olmaq" mənasında bayımaq sözü işlənir.

Bozdamaq sözü Qərbi Azərbaycanın Qarakilsə (Sisyan) şivəsində "oxşaya-oxşaya ağlamaq" mənasını bildirir. Bozdamax Gəncə, Şəmkir şivələrində "ucadan oxumaq və ya çalmaq", Füzuli, İmişli, Mingəçevir şivələrində, Qax şivəsində "oxşaya-oxşaya" ağlamaq mənasını bildirir.

"Oxşaya-oxşaya axlamaq" mənasında işlənən bozdamax "Kitabi-Dədə Qorqud" dastanında "uca səslə ağlamaq" mənasında bozlamaq formasında işlənmişdir.

Qərbi Azərbaycanın Çəmbərək, Kalinino rayon şivələrində işlənən ertə "tezdən" mənasını bildirir.

Ertə qədim türk dilində "səhər tezdən" mənasında işlənmişdir. M.Kaşğarinin "Divani-lüğət-it-türk" əsərində ertə elə ertə kimi tərcümə edilmişdir.

Qərbi Azərbaycanın Çəmbərək şivəsində küz sözü "payız" mənasını bildirir. Bu söz eyni mənada Ordubad, İmişli, Qax, Borçalı şivələrində işlənir.

M.Kaşğarinin "Divani-lüğət-it-türk" əsərində küz "payız fəsli", "son bahar" mənasında işlənmişdir.

Qərbi Azərbaycanın Qafan şivəsində örən sözü işlənir ki, "əkilməmiş sahə, yer" mənasını bildirir. Örənə Qarakilsə (Sisyan) şivəsində "çox otarılmaq nəticəsində otu qurtarmış, otsuzlaşmış yer" mənasını ifadə edir. Bu sözə eyni mənada, yəni Qarakilsə (Sisyan) şivəsində ifadə etdiyi mənada Cəbrayıl, İmişli, Zəngilan şivələrində rast gəlinir. Bununla yanaşı, Qərbi Azərbaycanın Ağbaba, Kalinino şivələrində "xam torpaq" mənasında örənə, Çəmbərək, Karvansaray şivələrində "otu qurtarmaq, otsuzlaşmaq" mənasında örənməx sözü işlənir ki, hər iki sözün kökündə örən sözü dayanır.

Qərbi Azərbaycanın Ağbaba, Hamamlı, Vedi, Zəngibasar şivələrində öynə "dəfə, bir dəfə, bir oturun", Çəmbərək şivəsində "günorta yeməyi", Dərələyəz şivəsində vaxt, mal-qaranın sağıldığı vaxt, heyvanlara ot-ələf verilən vaxt mənalarını bildirir.

Öynə Qazax, Beyləqan, Cəbrayıl, Göyçay, Şərur, Borçalı şivələrində "dəfə", Gəncə, Qazax, Gədəbəy, Lənkəran, Oğuz, Salyan, Tovuz, Ucar, Zərdab, Borçalı şivələrində "günorta yeməyi vaxtı" mənalarını bildirir. M.Kaşğarinin "Divani-lüğət-it-türk" əsərində "günorta vaxtı" mənasında öylə sözü işlənmişdir.

Qərbi Azərbaycanın Basarkeçər, Çəmbərək, Kalinino şivələrində "daş atmaq

üçün meşindən hazırlanan qoşa uzunqollu silah" mənasında rast gəlinir.

Sapand "Kitabi-Dədə Qorqud" dastanında sapan formasında, "daş atmaq üçün qədim silah" mənasında işlənir.

Qərbi Azərbaycanın Basarkeçər, Çəmbərək, Hamamlı şivələrində işlənən sayri "xəstə" mənasını bildirir. Sayrı sözünə eyni mənada İmişli, Borçalı şivələrində rast gəlinir.

Bu söz "Kitabi-Dədə Qorqud" dastanında sayrı, sayru formasında "xəstə" mənasında işlənmişdir.

Qərbi Azərbaycanın İrəvan, Üçkilsə, Vedi, Zəngibasar şivələrində sazdıx sözü "qamışlıq" mənasını bildirir. Sazdıx sözünün kökü saz sözü ilə bağlıdır və saz qədim Azərbaycan dilində "qamışlıq" mənasını bildirmişdir.

Qərbi Azərbaycanın Dərələyəz şivəsində tuş "yuxu" mənasını bildirir.

Bu söz "yuxu" mənasında "Kitabi-Dədə Qorqud"da, Şah İsmayıl Xətainin əsərində düş formasında işlənmişdir.

Aydır: Bilürmisin, qarındaşım
Qaragünə düşim nə göründi?

Qərbi Azərbaycanın Zəngibasar şivəsində işlənən yaxınkeş "ət qızartmaq üçün qab" mənasını bildirir.

Yaxnıkeş sözünün birinci komponenti olan yaxnı qədim türk dilində "ətdən hazırlanan xörək" mənasında işlənən yəxni sözünün fonetik variantıdır.

Qərbi Azərbaycanın Çəmbərək, Karvansaray, Vedi, Zəngibasar şivələrində "sifariş göndərmək", "xəbər göndərmək" mənasında ismarramax sözünə rast gəlinir. İsmarramax ismarlamaq sözünün dialekt variantıdır. "Kitabi-Dədə Qorqud" dastanında ismarlamaq elə ismarlamaq formasında işlənmişdir: Oğlanı həkimlərə ısmarlayub Dərsə xandan saqladılar.

İsmarlamaq Azərbaycan dilinin qərb ləhcəsinə daxil olan Qazax, Gədəbəy, Tovuz şivələrində də "sifariş, xəbər göndərmək" mənasını bildirir.

İsmarlamaq və eyni kökdən olan ismarıc XX əsrin sonlarında müasir ədəbi dilimizi şivə sözü kimi zənginləşdirmişdir.

Qərbi Azərbaycanın Çəmbərək şivəsində səyirtmək "atı çapmaq, atı sürətlə qaçırtmaq" mənasını bildirir. Bu sözə "Kitabi-Dədə Qorqud" dastanında eyni mənada səgirtmək formasında rast gəlinir.

Qərbi Azərbaycanın Çəmbərək, Dərələyəz, Vedi, Zəngibasar şivələrində ağıl yaylaqda qoyunların "saxlandığı yer", "hər tərəfi hasarlanmış yer" mənalarını bildirir.

Ağıl sözü "Kitabi-Dədə Qorqud"da eyni mənada işlənilmişdir.

Ağıl Balakən, Biləsuvar, Cəbrayıl, Beyləqan şivələrində "yayda mal-qara saxlamaq üçün ətrafı hasarlanmış üstü açıq yer", Şirvan şivəsində "qışlaqda qoyunlar üçün qamışdan tikilən yer", Şəki şivəsində isə "tövlə" mənasını bildirir.

Qərbi Azərbaycanın Çəmbərək, İrəvan, Qarakilsə (Sisyan) şivələrində "çörəyi çeynəmək", "çörəyi yavan yemək", Vedi, Zəngibasar şivələrində "iştahsız yemək" mənalarını bildirir.

Gəvələmək sözünə "Kitabi-Dədə Qorqud" dastanında gəvəzləmək fonetik formasında rast gəlinir: Gəldiŋ ol kim soldıran soydır, sapandaca yerindən uru turar, əlinyüzin yumadan toquz bazlamac ilən bir küvlək yoğurd gəvəzlər. Bu cümlə müasir Azərbaycan dilinə uyğunlaşdırılarkən gəvəzləmək gəvələmək formasında verilmişdir.

Qərbi Azərbaycanın Çəmbərək, Kalinino şivələrində suç sözü "günah" mənasını bildirir. Suç "Kitabi-Dədə Qorqud" dastanında eyni mənada işlənmişdir: Dərsə xan aydır: "...Bənim suçum nə oldı kim, qara otağa qondurdı?" – dedi.

Bu söz Azərbaycanın Cəbrayıl, Gədəbəy, Qax, Tovuz, Zaqatala şivələrində "təqsir, günah" mənasında işlənir.

Qərbi Azərbaycanın Çəmbərək şivəsində “yoğun kəndir” mənasında sijim sözü var. Sijim sicim sözünün dialekt variantıdır. “Kitabi-Dədə Qorqud” dastanında sicim sözünə rast gəlinir.

Qarğamaq sözünə Qərbi Azərbaycanın Çəmbərək şivəsində rast gəlinir və “nifrin tökmək, bəddua etmək” mənasını bildirir. Qarğamaq eyni mənada “Kitabi-Dədə Qorqud” dastanında işlənmişdir:

Qaçar keyiklərinə qarğamağıl,
Qazlıq tağınıŋ günahı yoqdır.
Arslanla qaplanına qarğamağıl,
Qazlıq tağınıŋ suçı yoqdır.
Qarğarsaŋ, babama qarğa,
Bu suç, bu günah babamdandır, - dedi.

Müasir Azərbaycan ədəbi dilində işlənən qarğış elə qarğamaq sözü ilə eyniköklü sözdür.

Azərbaycanın Çəmbərək şivəsində ağırramax formasında “əzizlənmək, hörmətlə qarşılamaq” mənasını bildirir. Ağırlamaq İraq-türkman ləhcəsində “hörmət göstərmək” mənasında özünü göstərir. “Kitabi-Dədə Qorqud” dastanında ağırlamaq sözü “əzizlənmək” mənasında işlənmişdir: Uç gün təmam ağırladı.

V.V.Radlovun lüğətində ağırlamaq sözünün 4 mənada işləndiyi verilir. 4-cü mənada ağırlamaq sözünün “hörmət etmək” mənasında işləndiyi göstərilir.

Qərbi Azərbaycanın Çəmbərək şivələrinə daxil olan Toxluca şivəsində bəniz “üz, sifət” mənasını bildirir. Bəniz “Kitabi-Dədə Qorqud”da eyni mənada işlənmişdir.

Çözələmək sözü Qərbi Azərbaycanın Çəmbərək, Meğri, Vedi, Zəngibasar şivələrində “ipi açmaq” mənasında işlənir. Çözələmək sözünün kökündə çözmək sözü dayanır. Məhz “Kitabi-Dədə Qorqud” dastanında, Şah İsmayıl əsərində çözmək “açmaq” mənasında işlənmişdir: Qazana bu söz xoş gəldi. Atından endi, çobanıŋ əllərin çözdi (KDQ, s.46).

Dedim ki, əya, səba, indi;
Asudə otur çözüb kəməndi (Ş.İ.Xətai).

Çözmək sözünün qədim türk dilində də “açmaq” mənasında işləndiyinə rast gəlirik.

Dişarı sözü Qərbi Azərbaycanın Çəmbərək və Kalinino şivələrində “bayır, çöl” mənasını bildirir.

“Kitabi-Dədə Qorqud” dastanında tışarı, tarşa formasında da işlənmişdir.

V.V.Radlovun lüğətində türk dilində həm tışkarı, həm də dışarı sözünün işləndiyi göstərilir və müxtəlif fonetik formalarda işlənən dışarı “kənar”, “çöl”, “bayır” mənalarını bildirir.

Eşik sözü Qərbi Azərbaycanın Ağbaba, Böyük Qarakilsə, Calaloğlu, Çəmbərək, Kəvər, Vedi, Zəngibasar şivələrində “həyət, bayır”, “qapı-baca” mənalarını bildirir. Eşik eyni mənada “Kitabi-Dədə Qorqud”da işlənmişdir.

Eşik Naxçıvan, Oğuz, Tovuz, Zaqatala şivələrində “həyət” mənasında işlənir.

V.V.Radlovun lüğətində eşik həm əşik, həm də eşik formasında verilmişdir və “həyat”, “evin kənar tərəfi” mənasında işləndiyi göstərilir.

Göy sözü Qərbi Azərbaycanın Çəmbərək və Kalinino şivələrində “kürəkən” mənasını bildirir.

Göy sözü İraq-türkman ləhcəsində də “kürəkən” mənasında işlənir. Göy//küəy – “kürəkən”, “yeznə” mənası bildirən bu söz, demək olar ki, şivələrimizin əksəriyyətində işlənən qohumluq terminidir.

“Kitabi-Dədə Qorqud” dastanında göygü formasında “kürəkən” mənasında işlənilmişdir.

Örkən sözü Qərbi Azərbaycanın Çəmbərək şivəsində “kəndir”, Dərələyəz şivəsində “ulağın, atın, qatırın palanını bərkitmək üçün ipdən hazırlanan kəndir” mənasını bildirir. Örkən “Kitabi-Dədə Qorqud” dastanında orğan fonetik forma-

* 5

sında işlənmişdir.

V.V.Radlovda orğan sözünün "qalın kəndir" (Толстая веревка) mənasında işləndiyi göstərilir.

Qərbi Azərbaycanın Çəmbərək şivəsində öymək sözünə rast gəlinir və bu söz "tərifləmək" mənasını bildirir. Öymək "Kitabi-Dədə Qorqud" dastanında ögmək formasında "tərifləmək" mənasında işlənmişdir.

Yağı sözünə Qərbi Azərbaycanın Çəmbərək şivəsində rast gəlinir və "düşmən" mənasını bildirir. Yağı eyni mənada "Kitabi-Dədə Qorqud"da işlənmişdir: Qazanıŋ bəgləri baqdılar, gördilər kim, yağı gəlür.

Yağı Orxon-Yenisey abidələrində həm "düşmən", həm də "düşmən olmaq" mənalarında işlənmişdir. Onu da qeyd edək ki, Orxon-Yenisey abidələrində yağı sözünə həm də yağıt//yagıdi fonetik formalarında rast gəlinir.

Yağı sözünün V.V.Radlovun lüğətində "düşmən", "müharibə" mənasında işləndiyi göstərilir.

Qərbi Azərbaycanın Çəmbərək, Dərələyəz şivələrində yazı "çöl", "düzənlik" mənalarında işlənir. Bu sözə eyni mənada Ağdam, Cəbrayıl, Qazax, Laçın, Oğuz, Ordubad, Şahbuz, Tərtər, Zəngilan şivələrində rast gəlinir. Yazı "çöllük" mənasında "Kitabi-Dədə Qorqud" dastanında işlənmişdir.

Orxon-Yenisey abidələrində yazı "çöl", "səhra" mənasında işlənmişdir.

Yuxarıdakılardan göründüyü kimi, Azərbaycan dilində işlənən dialektlər qədim bir tarixə malikdir. Azərbaycan dilinin lüğət fondu və lüğət tərkibinə daxil olan qədim sözlər dilimizin zənginliyini göstərir. Bədii əsərlərdə, yaxud şifahi nitqdə bu sözlərin işlənməsini nəzərə alaraq, Azərbaycan dili və ədəbiyyat müəllimləri onların izahını verməli, şagirdlərin diqqətini dialekt sözləri ilə ədəbi-bədii sözlərin bir-birindən fərqləndirilməsinə cəlb etməlidir.

*Rəyçi: prof. N.Abdullayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan dilinin dialektoloji lüğəti. Bakı: Şərq-Qərb, 2007.
2. Bayramov İ. Qərbi Azərbaycan şivələrinin leksikası. Bakı: Elm və təhsil, 2011.
3. Əhmədov B. Azərbaycan dilinin qısa etimoloji lüğəti. Bakı: Mütərcim, 1999.
4. Kitabi-Dədə Qorqud (tərtib edənlər: F.Zeynalov, S.Əlizadə). Bakı: Yazıçı, 1988.
5. Mahmud Kaşğari. Divani-lüğət-it-türk (tərcümə edən: R.Əskər), I c., Bakı: Ozan, 2006.
6. Древнетюркский словарь. Ленинград, 1969.
7. Радлов В. Опыт словаря тюркский наречий, т. I, ч. 1-2, СПб, 1893.

**И. Байрамов**

**Древние слова в западно-азербайджанских говорах**

**Резюме**

В статье анализируются в сравнительно историческом аспекте древние слова (ağız, aŋarı, arı, aş, bağır, boyummaq, bozdamaq, ertə, küz, örən, öynə, sapand, sayrı, sazdıx, tuş, yaxnıkeş, ismarlamaq, döşürmək и др.) орфография фонетика, дедукция, индукция.

**I. Bayramov**

**Ancient words in the western Azerbaijan dialects**

**Summary**

In the article ancient words used in the Western Azerbaijan dialects (ağız, aŋarı, arı, aş, bağır, boyummaq, bozdamaq, ertə, küz, örən, öynə, sapand, sayrı, sazdıx, tuş, yaxnıkeş, ismarlamaq, döşürmək and so on) are investigated in the historical – comparative aspect.



# YENİ ELMLƏRARASI İSTİQAMƏT (SİNERGETİKA)

**Əziz Məmmədov,**
***Bakı Dövlət Universitetinin professoru, fəlsəfə elmləri doktoru***

**Açar sözlər:** *sinergetika, paradiqma, mürəkkəblik, dissipativlik, bifurkasia.*
***Ключевые слова:*** *синергетика, парадигма, сложность, диссипативность, бифуркация.*
***Key words:*** *synergetic, paradigm, complexity, dissipative, bifurcation.*

Sinergetika mürəkkəb sistemləri öyrənən mürəkkəb elmdir. Hakenin etirafına görə, sinergetika müasir elmin sinergetik ideyaları sayəsində yaranmış, müxtəlif qohum fənlərin ümumi anlayışlarının, vahid tədqiqat prinsiplərinin və metodlarının yaradılması naminə onların inteqrasiya olunması zərurətindən doğulmuşdur. Bir sözlə, sinergetik ideyalar konkret elmlərə məxsus spesifik anlayış və prinsiplərin ümumiləşdirilməsi və inkişafının nəticəsidir, belə ki, özünütəşkiletmə prosesləri ilk dəfə ayrı-ayrı konkret fənlərdə (fizika, kimya, kibernetika və s.) məhz bu elmlərdə müəyyən edilmişdir. Özünütəşkiletmə vahid sistem təşkil edən böyük sayda elementlərin qarşılıqlı təsirlərinin məhsuludur.

Sinergetikanın əsas məzmunu onun predmetində əks olunur: Sinergetika özünütəşkiledən mürəkkəb, açıq, qeyri-xətti, dissipativ, tarazlıq halından uzaq yerləşən sistemlərin ümumi qanunauyğunluqlarını öyrənən elmdir (1, səh. 37-41). Sinergetikanın tədqiqat obyektini təşkil edən və elmin bu vaxtadək öyrəndiyi sadə və özünütənzimləyən mürəkkəb sistemlərdən özlərinin özəllikləri ilə fərqlənən bu tipli sistemlər sinergetik sistemlər adlanır.

Elmi dövriyyəyə 1973-cü ildə daxil edilmiş “sinergenatika” termini qədim yunan dilinə məxsus “synegeticas” sözündən alınmışdır. Hərfi mənası “kollektiv”, “birgə fəaliyyət” deməkdir. G.Hakenin elmi dairələrə yaxşı məlum olan və bir çox dillərə tərcümə olunmuş “Sinergetika” kitabının girişində bu elmin mahiyyəti belə açıqlanır: “Mən öz təlimimi ona görə “sinergenatika” adlandırdım ki, əvvəla, onda sistemin bir çox elementlərinin birgə fəaliyyəti tədqiq olunur, həm də ona görə belə adlandırdım ki, özünütəşkiletməni idarə edən ümumi prinsiplərin tapılması üçün müxtəlif təlimlərin birgə fəaliyyəti zəruridir” (10, səh. 24-25).

Hakenin fikrindən aydın görünür ki, müasir anlamda “sinergenatika” sözünün iki mənası vardır: burada söhbət, bir tərəfdən sistemin elementlərinin kooperativ, birgə təsirindən, digər tərəfdən biliyin müxtəlif sahələrində fəaliyyət göstərən alimlərin birgə elmi əməkdaşlığından gedir. Sinergetikanın ikinci mənası təsadüfi olmayıb, bu elmin özünün mürəkkəb, çoxaspektli təbiəti ilə şərtlənir, belə ki, sinergenatika yeni elmlərarası istiqamət olmaq etibarilə

müxtəlif elmlərin, o cümlədən fizika, riyaziyyat, kimya, biologiya, sistemotexnika, kibernetika, informatika, sosiologiya və s. bilik sahələrinin qovuşmasından yaranmışdır. Buna görə də yalnız bir ixtisasa yiyələnməklə bu elmin qanunauyğunluqlarını dərk etmək mümkün deyil.

Yuxarıda verdiyimiz xarakteristikadan aydın olur ki, sinergetik sistemlər müəyyən tip sistemlər olub, ümumiyyətlə, sistemlərin malik olduğu ümumi əlamətlər ilə (tamlıq, emercent xassələr, hissələr, elementlər, struktur, kompozisiya, funksiya və s.) yanaşı, bir sıra özəl, təkrarsız xüsusiyyətlərə də malikdirlər. Sinergetik sistemlər haqqında oxucuda daha aydın təsəvvür yaratmaq üçün onun səciyyəvi əlamətlərinin də nəzərdən keçirilməsi vacibdir.

Sinergetik sistemlərin mühüm əlamətlərindən birincisi onların mürəkkəb olmasıdır. Sistemin mürəkkəbliyi onun elementlərinin say çoxluğu, bu elementlərin qarşılıqlı təsirlərinin zənginliyi, sistemin struktur mürəkkəbliyi, sistem funksiyalarının rəngarəngliyi, ətraf mühitin təsirlərinə sistemin reaksiyasının mürəkkəbliyi və s. amillər ilə müəyyən olunur.

Sinergetik sistemin ikinci əlaməti onun özünütəşkiletməsidir. Qeyd edək ki, istər cansız təbiətdə, istərsə də canlı aləmdə təkamülün hər bir addımı materiyanın atributu sayılan özünütəşkiletmə prosesləri ilə bağlıdır. Özünütəşkiletmə anlayışı mürəkkəb sistemlərdə baş verən özünüstrukturlandırma, özünütənzimləmə, özünühasiletmə proseslərini ifadə edir.

Sinergetik sistemlərin üçüncü əlaməti onların açıq sistemlər olmasıdır. Açıq sistemlər elə sistemlərdir ki, onlar xarici mühitdən fasiləsiz olaraq maddə, enerji və informasiya qəbul edir və bu mübadilə hesabına özlərinin qeyri-tarazlıq hallarını qoruyub saxlayırlar.

Sinergetik sistemlərin mühüm əlamətlərindən birini də onların qeyri-xəttiliyi təşkil edir. Professor D.İ.Trubetskov qeyri-xəttiliyin obrazını aşağıdakı sözlərlə ifadə edir: "Elmi tədqiqatın əsrimizə gətirdiyi fəxri titullar arasında ən az ahəngdarı, lakin ən çox əhəmiyyətlisi qeyri-xəttilikdir" (9, səh. 314).

Sinergetikada öyrənilən sistemlərin nüvəsini "qeyri-xətti mühit" təşkil edir. Qeyri-xətti mühit elə mühitdir ki, onun xassələri həmin mühitdə cərəyan edən proseslərdən asılıdır, onun hərəkəti isə qeyri-xətti (iki və ya daha çox tərtibli) riyazi tənliklərlə təsvir olunur. Özünütəşkiledən mürəkkəb sistemlərin həssaslıq həddini nümayiş etdirən qeyri-xəttilik, həm də bu sistemlərin təkamül yollarının diskretliyini yaradaraq mühitdə məcburi və ya spontan dəyişmələrin baş verməsini təmin edir.

Sinergetik sistemlərin beşinci əlaməti onların termodinamik tarazlıq halından kifayət qədər uzaqda olmasıdır. Əgər sistem tarazlıq nöqtəsində və ya ona yaxın bir nöqtədə qərar tutmuşdursa, bu halda o özünün xaos və ya nizamsız halına uyğun maksimum entropiyaya malik olacaqdır.

Nəhayət, sinergetik sistemlərin mühüm əlamətlərindən biri də dissipativlik xassəsidir. İ.Priqojininin təbirincə, dissipativliyin ən sadə izahı bundan ibarətdir ki, sinergetik sistem açıq olduğundan ətraf mühitdən qəbul etdiyi enerjini özünün hər hansı bir nöqtəsində və yaxud kiçik bir həcmində kristallaşdırmayıb, bütün həcmi boyunca elementləri və alt sistemləri arasında yayır. Açıq sistemlərin elementləri dissipatsiya aktları hesabına kollektiv və kooperativ fəaliyyətə başlayaraq özlərini spontan surətdə təşkil edirlər. Mürəkkəb sistemlər məhz dissipativlik hesabına xaosdan, nizamsızlıqdan nizama, qaydaya, özünütəşkiletməyə keçirlər (11, səh. 108-110).

Bir elm kimi sinergetikanın bəşəriyyətin mənəvi həyatında rolu ondadır ki, o,

özünütəşkiletmənin materiya təşkilinin bütün səviyyələrində meydana gəlməsi imkanını müəyyən etmişdir. Buna görə də özünütəşkiletmə materiyanın universal xassəsidir.

Müasir elmi idrakda özünütəşkiletmə paradiqmasından geniş istifadə edilməsi bir sıra mühüm fəlsəfi-metodoloji problemlər irəli sürür. Həmin problemlərdən biri özünütəşkiletmənin aləmin ümumi təkamül prosesində və onun mexanizminin müəyyənləşdirilməsindəki rolunun açıqlanmasından ibarətdir.

Bəşəriyyətin inkişaf tarixindən məlumdur ki, cəmiyyətin yaranması və insanların maddi nemətlər istehsalında şüurlu, məqsədəuyğun fəaliyyətinin başlanması ilə əlaqədar olaraq təşkilolunmanın da yeni üsulu meydana çıxmışdır. Təşkilatlanmanın bu yeni forması özünütəşkiletmə idi. Özünütəşkiletmə cəmiyyətin bir sıra sferalarında kortəbii baş verdiyi təqdirdə, onun nəticələri insanlar tərəfindən irəlicədən dərk olunmamış müəyyən ictimai və dövlət təşkilatları ilə şüurlu surətdə formalaşaraq ayrı-ayrı insan qruplarının, xalqların və dövlətlərin konkret məqsəd və maraqlarını izləmişlər. Buradan isə cəmiyyətin təkamülü prosesində özünütəşkiletmə ilə təşkiletmənin fərqləndirilməsi, onların düzgün nisbətinin və qarşılıqlı təsirinin müəyyənləşdirilməsi zərurəti doğmuşdur. Özünütəşkiletmənin tədqiqi müxtəlif təbii və sosial sistemlərin təkamül mexanizminin aydınlaşdırılması üzərinə əlavə işıq salır. Biz intuitivcəsinə anlayırıq ki, sistemlərin inkişaf səviyyəsi onların mühitlə qarşılıqlı təsirindən əhəmiyyətli dərəcədə asılıdır. Darvinin təkamül nəzəriyyəsi başlıca diqqəti canlı orqanizmlərin təkamülünə, xarici şəraitin təsirinə yönəldirdi. Açıq sistemlərin müasir konsepsiyası isə sistemlərin mühitə əks təsirini ön plana çəkərək təkamülün cərəyan etdiyi ümumi şəraiti daha geniş bucaq altında görməyə əlverişli imkan yaradır.

Özünütəşkiletmə başlığı altında sinergetikanın əsas ideyaları tarixin dərinliklərinə gedib çatır (8, səh. 29-37). Antik fəlsəfəyə göstərilən maraq xatirinə qeyd edək ki, hələ Aristotel tərəfindən aydın dərk olunan bu problem ondan xeyli əvvəllər də qədim yunanların kosmoqonik təsəvvürlərinin inkişafında önəmli rol oynamış, mifoloji təfəkkürə heç də pis yiyələnməmiş qədim yunan biliciləri dünyanın formalaşmasına kosmosun və ya nizamın xaosdan və ya hərcmərclikdən, nizamsızlıqdan yaranması fikrinə şərik çıxmışlar. Lakin bu ümumi ideya antik yunan təfəkküründə eksperimental təbiətşünaslığın olmaması üzündən elmi cəhətdən əsaslandırılmış hipotezadan daha çox dahiyanə gümandan başqa bir şey olmamışdır. Avropanın mənəvi-intellektual həyatında mühüm mərhələ təşkil edən Yeni dövr mədəniyyətində sadə mexaniki sistemləri öyrənmək məqsədi ilə irəli sürülən prinsip və metodlar da ictimai həyat hadisələrini, sosial sistemləri öyrənmək üçün yaramadı. Məhz buna görə də təəccüblü deyildir ki, sosial-iqtisadi və humanitar elmlər meydana gəldikləri ilk vaxtlarda belə özünütəşkiletmə problemi ilə qarşılaşdılar.

Belə bir sual da xüsusi maraq kəsb edir ki, insanların maraq və məqsədlərinin müxtəlifliyinə, hətta əksər hallarla onların əksliyinə baxmayaraq, bazarda kiminsə tərəfindən planlaşdırılmayan spontan qaydalar, nizam necə yaranır? Biz mənəviyyat normaları haqqında da düşündükdə eyni sualla rastlaşırıq: görəsən, bu normalar yuxarıdan diqtə olunur, yoxsa onlar insanların mədəni-tarixi inkişafının gedişində dəyişən həyat şəraitinin təsiri altında formalaşırlar? Özünütəşkiletmənin intuitivcəsinə anlaşılması ilə bağlı olan bu suallar bir o qədər də aydın və dəqiq olmayan formada ilk dəfə məhz sosial-iqtisadi və humanitar elmlərdə söylənilmişdir. Buna görə də bu sualların rasio-

nal-analitik xarakter daşımasından daha çox intuitiv xarakter daşıması onların sinergetik baxışlarının sonrakı inkişafı üçün əhəmiyyətini heç də azaltmır. Təsadüfi deyil ki, müasir alimlər klassik siyasi iqtisadın banisi A. Smiti kibernetikanın müjdəçisi adlandırır və öz mövqelərini belə bir dəlillə əsaslandırırlar ki, müasir kibernetikanın əsas prinsiplərindən sayılan "mənfi əks-əlaqə prinsipi", bir o qədər də aydın olmayan şəkildə olsa da, ilk dəfə məhz A.Smit tərəfindən söylənilmişdir. Alman filosofu İ.Kant özünütəşkiletmə probleminə təbiətdə daxili məqsədəuyğunluq məsələsi ilə bağlı təbii və süni obyektlərin fərqini araşdırdığı "Mühakimənin tənqidi" əsərində fəlsəfi dünyagörüşü kontekstində toxunmuşdur. Kantın təbirincə, təbiət elə təşkil olunmuşdur ki, onun, sanki hər bir hissəsi öz mövcudluğu üçün yalnız digər hissələrə borcludur və o, ancaq bu hissələrinin hesabına mövcuddur. Sistemin elementləri yalnız bu şərt daxilində özünütəşkil edən varlıqlar kimi mövcud ola bilirlər. Təəssüflər olsun ki, canlı və sosial sistemlərin öz-özünə funksiyalaşması və təkamülü haqqında yeni radikal ideyalar maarifçilik fəlsəfəsində və onunla bağlı olan rasionalizmdə özünün sonrakı inkişafını tapmadı. Rasionalizmin "dünyanı ağıl idarə edir" ehkamı cəmiyyət və onun obyektiv inkişaf qanunları haqqında həqiqi təsəvvürlərin formalaşdırılmasını uzun müddətə ləngitdi.

Özünütəşkiletmə prinsipinin dərinliyinin və ümumiliyinin dərkinə təbiət və ictimai elmlərin müxtəlif sahələrində fəaliyyət göstərən tədqiqatçıların pərakəndəliyi də az mane olmamışdır. Bu dövrdə təbiət və ictimai elmlərin metodlarının bir-birinə qarşı əks qoyulması, həmçinin pozitivistlər tərəfindən idrakın təbii-elmi metodların sosial və humanitar elmlərə daxil edilməsi cəhdləri də buna geniş meydan açırdı. Bu müdaxilə isə sosial-humanitar elmlərin nümayəndələri tərəfindən kəskin etirazlarla qarşılanırdı. Bütün bunlara baxmayaraq, müxtəlif elmlərin ayrı-ayrı problemlərinin həllində özünütəşkiletmə prinsipi özünü bu və ya başqa formada göstərirdi. Məsələn, U.Kennon fiziologiyada məşhur homeostaz prinsipi formulə etmişdi. Bu prinsipə görə, canlı orqanizmlər dəyişilən xarici şəraitə adaptasiya (uyğunlaşma) prosesində özlərini bir qayda olaraq həyat fəaliyyətlərinin parametrlərinin dayanıqlığını qoruyub saxlaya biləcək bir tərzdə dəyişirlər (2, səh.183-185).

Mənfi əks-əlaqə prinsipini ümumiləşdirən kibernetikanın yaranması da özünütəşkiletmə proseslərinin tədqiqinə yeni impuls vermişdir. Bu prinsip sayəsində dinamik sistemlərdə dayanıqlı halların mövcudluğunu, onların homeostazını, bazarda tələb və təklif arasındakı tarazlığı tənzimləyən spontan nizamlı və bir çox digər proses və hadisələri izah etmək mümkün olmuşdur. Lakin əks-əlaqə prinsipi dinamik sistemlərdə dayanıqlıq və nizamın necə yaranmasını deyil, yalnız saxlanmasını izah edə bilirdi. Halbuki adına uyğun olaraq özünütəşkiletmə sistemdə yeni nizam və strukturların təşkili, onların dəyişilməsi, sistemdə elementlərin qarşılıqlı təsirləri sayəsində yeni təşkilin və strukturların meydana gəlməsi deməkdir. Başqa sözlə, elementlərin davranışlarındakı hər cür dəyişikliyin və özünütəşkiletmənin səbəbini sistemlə mühitin qarşılıqlı təsirində, onların maddə, enerji və informasiya mübadiləsində axtarmaq lazımdır. Lakin kibernetikada quraşdırılan avtomatlar və texniki qurğular həqiqətdə xarici təşkilə əsaslanır, onlarda baş verən "özünütəşkiletmə" prosesləri irəlicədən insan-konstruktor tərəfindən planlaşdırılır. Kibernetik qurğulardan fərqli olaraq canlı təbiətdə və cəmiyyətdə özünütəşkiletmə və ona əsaslanan təkamül yalnız dinamik tarazlığın saxlanılmasına müncər edilmir (5, səh. 7-11). Sistemin təkamülü gec və ya tez, bu və ya digər dəyişikliklərlə müşayiət olunur. Bu

dəyişikliklərin sırasına onların parametr və strukturlarında baş verən və yeninin yaranmasına gətirib çıxaran hər cür kəmiyyət və keyfiyyət dəyişiklikləri də aiddir. Canlı və cansız aləm arasındakı məhz bu dərin fərq uzun müddət klassik termodinamika (fizika) ilə Darvinin təkamül nəzəriyyəsi (biologiya) arasında həll edilməmiş ziddiyyət kimi mövcud olmuşdur.

Sinergetikanın müasir elm qarşısında ən böyük xidməti ondadır ki, bu elm sistemlərin və strukturların yaranma mexanizmini açmaq üçün keyfiyyətcə mənfi əks-əlaqə prinsipindən fərqlənən müsbət əks-əlaqə prinsipindən istifadə edir. Bu prinsipə görə, köhnə sistemdə baş verən dəyişikliklər sistemdən kənarlaşdırılmayıb, əksinə, bir yerə toplanaraq, daha da gücləndirilir (7, səh. 3-15). Bütün hallarda olduğu kimi sinergetik sistemlərdə də tədricən kəmiyyət dəyişmələri sistem çərçivəsində köklü keyfiyyət dəyişmələrinə başlanğıc verir və bu dəyişikliklər son nəticədə yeni strukturlu, yeni xassəli sistemlərin yaranmasına gətirib çıxarır.

Sinergetika yeni elmi istiqamət olmaq etibarilə dərin fəlsəfi məzmuna malikdir. Sinergetikanın bu keyfiyyəti təsadüfi olmayıb, bütün elmlər üçün səciyyəvi olan ümumi bir cəhətdən irəli gəlir. Həmin ümumi cəhət isə bundan ibarətdir ki, hər bir elmin məzmunu üç blokdan - elmin mənzərəsindən, onun xüsusi metodologiyasından və fəlsəfi əsaslarından ibarətdir.

Bütün elmlər kimi sinergetikada gerçəkliyi qanunlar, anlayışlar, kateqoriyalar, idealar, prinsiplər və nəzəriyyə formasında əks etdirir. Sinergetikanın anlayış və kateqoriyaları, ehtiva etdiyi idea və nəzəriyyələr onun gerçəkliyə münasibətini ehtiva edib sinergetikanın elmi mənzərəsini formalaşdırır.

Bir elm olmaq etibarilə sinergetikanın həm də özəl, özünəməxsus metodologiyası vardır. Özünütəşkiledən mürəkkəb sistemləri öyrənmək üçün sinergetika özünün xüsusi, təkrarsız metodlarından istifadə edir. Həmin metodlar məcmusu isə sinergetikanın xüsusi metodologiyasını yaradır.

Sinergetikanın məzmununda onun fəlsəfi əsasları xüsusi yer tutur. Sinergetikanın fəlsəfi əsasları onun fəlsəfə ilə qarşılıqlı münasibətinin ifadəsi kimi çıxış edərək onun dünyagörüşünün mahiyyətini təşkil edir.

Biliyin müxtəlif formaları olmaq etibarilə sinergetika və fəlsəfə arasında qarşılıqlı əlaqə mövcuddur. Sinergetika və fəlsəfənin bu əlaqəsi təsadüfi olmayıb, belə bir ümumi cəhətə malikdir ki, istər sinergetika, istərsə də fəlsəfə eyni bir dünyanı öyrənir. Lakin bununla belə sinergetika və fəlsəfənin predmeti heç də üst-üstə düşmür. Sinergetika ilə müqayisədə fəlsəfə daha universal elm statusunda çıxış edir. Sinergetikanın mərkəzində nizam və xaosun qarşılıqlı əlaqəsi məsələsi, fəlsəfənin nüvəsində isə əlaqə, hərəkət və qarşılıqlı təsir münasibətləri dayanır. Bu baxımdan, fəlsəfənin qanun və kateqoriyaları sinergetikanın müvafiq qanun və kateqoriyalarından daha ümumi səciyyə daşıyır. Sinergetika yalnız mürəkkəb sistemləri, fəlsəfə isə eyni zamanda həm sadə, həm də mürəkkəb sistemləri də öyrənir. Sinergetika yalnız özünütəşkiledən prosesləri, fəlsəfə isə həm özünütəşkiletməyən, həm də özünütənzimləyən və özünütəşkiledən prosesləri öyrənir. Bu baxımdan, fəlsəfə sinergetikaya nisbətən daha geniş, daha ümumi səciyyə daşıyan elmdir. Sinergetika isə fəlsəfənin təbii elmi əsaslarından yalnız biridir. Sinergetika fəlsəfənin inkişafına gətirdiyi bir sıra yeniliklər ilə diqqəti çəkir. Sinergetika ilə fəlsəfənin qarşılıqlı əlaqəsini əks etdirən həmin yeniliklərə qısaca da olsa nəzər yetirək.

Fəlsəfə nizam və xaosun nisbəti məsələsində nizam, bir qayda olaraq, harmoniyanın, xaos isə qaydasızlığın, intizam-

sızlığın göstəricisi rolunu oynamışdır. Deməli, fəlsəfə nizam ilə xaos arasında sədd çəkmiş, onları bir-birindən qəti surətdə ayırmışdır. Fəlsəfədən fərqli olaraq sinergetika nizam ilə xaosun əlaqəsini əks etdirir. Sinergetika sübut etmişdir ki, nizam ilə xaos arasında keçilməz sərhəd yoxdur: Nizamın daxilində xaos, xaosun daxilində isə nizam vardır. Xaos nizamdan, nizam isə xaosdan törəyir. Təbiətdə ən mükəmməl nizam məhz xaosun yaratdığı nizamdır. Fəlsəfəyə görə ,xaos destruktiv, yəni dağıdıcı, nizam isə konstruktiv və yaradıcı səciyyə daşıyır. Fəlsəfəyə görə, nizamın mütəşəkkil strukturu olduğu halda, xaosun strukturu yoxdur. Sinergetika isə sübut edir ki, xaos heç də dağıdıcı, destruktiv deyil, onda yaradıcılıq, konstruktivlik əlaməti, özünəməxsus keyfiyyət vardır. Sinergetika, həmçinin sübut edir ki, nizam kimi xaosun da strukturu vardır. Fərq bundadır ki, nizamın strukturu dayanıqlı, xaosun strukturu isə dayanıqsızdır.

Sinergetika və fəlsəfənin qarşılıqlı əlaqəsini zərurət və təsadüf kateqoriyalarının münasibətlərində də görmək olar. Dialektik fəlsəfə kursunda mükəmməl öyrənilən bu problemin həllində üstünlük bir qayda olaraq zərurət kateqoriyasına verilir. Fəlsəfədə oxucuya belə bir fikir aşılanır ki, zərurət və təsadüfün münasibətində zərurət birinci və əsas, təsadüf ikinci və törəmədir. Burada zərurətin təsadüf üzərində üstünlüyü özünü həm də belə bir cəhətdə göstərir ki, bütün təsadüflərin arxasında zərurət yerləşir. Yəni zərurət təsadüflərin yaradıcısı, bir növ onların formalaşmasının əsasını təşkil edən generatordur. Sinergetikaya gəldikdə isə vəziyyət kökündən dəyişilir. Belə ki, sinergetikada zərurətin təsadüf üzərində hökmranlığı aradan qaldırılır, təsadüf daha geniş nisbi müstəqilliyə malik olan fenomen kimi təqdim olunur. Sinergetikaya görə, proses və hadisənin funksiyalaşmasında və inkişafında zərurətlə yanaşı təsadüfün də rolu böyükdür. Bu prosesdə təsadüf zərurəti, hətta üstələyə də bilir. Gerçəklikdə proses və hadisələrin meydana gəlməsində təsadüflərin rolu kifayət qədər böyükdür. Təsadüflər haqda nəzəriyyə stoxastik və ya ehtimal nəzəriyyəsi adlanır. Bu nəzəriyyənin prinsip və müddəaları sinergetikada öz təsir dairəsini genişləndirərək proseslərin cərəyan etməsində özlərinin aparıcı mövqeyini ortaya qoyur.

Sinergetika və fəlsəfənin qarşılıqlı əlaqəsinin digər bir cəhəti öz ifadəsini təkamül anlayışında tapır. Fəlsəfədə təkamül anlayışı ilə biz kəmiyyət dəyişmələrinin keyfiyyət dəyişmələrinə keçməsi qanununda rastlaşırıq və bu nəzəriyyədə təkamül inkişafın formalarından biri kimi, arasıkəsilməz, tədricən kəmiyyət dəyişmələri kimi çıxış edir. Sinergetikada isə təkamül anlayışı tamamilə yeni məzmun, yeni məna kəsb edir. Belə ki, əgər fəlsəfəyə görə təkamül yalnız bir istiqamətdə, yalnız bir trayektoriya boyunca baş verirsə, sinergetikada bifurkasiya nöqtəsində sistemin təkamülü müxtəlif trayektoriyalar boyunca istiqamətlənir və bu istiqamətlərin hər biri sistemin gələcəyi ilə bağlı olur. Burada artıq gələcəyin fəlsəfi və sinergetik anlamları arasında kəskin fərq yaranır. Belə ki, əgər fəlsəfədə sistemin yalnız bir gələcəyi varsa, sinergetikada onun gələcəyi çoxmənalı və müxtəlifdir.

Sinergetika ilə fəlsəfənin fərqinin digər bir cəhəti də bundan ibarətdir ki, əgər fəlsəfəyə görə sistemin inkarı böhran nöqtələrində baş verirsə və hər bir ölçü daxilində belə böhran nöqtələrinin sayı sağ və solda olmaq etibarilə ikidirsə, sinergetikada sistemin köhnədən yeniyə keçidi bifurkasiya adlanan yalnız bir nöqtədə baş verir. Əgər fəlsəfədə sistemin böhran nöqtələrinə yaxınlaşması kəmiyyət dəyişmələri vasitəsilə yaranırsa, sinergetikada sistemin bifurkasiya nöqtəsinə yaxınlaşması fluktasiyalar vasitəsi ilə baş verir. Fluktasiya dedikdə sistemdə baş verən kiçik harmonik rəqslər başa düşü-

lür. Fluktasiyalar, ümumiyyətlə, sistemlərin ayrılmaz səpkiləri olub, hər bir zaman baş verməkdədirlər. Sinergetikaya görə sistem tarazlıq vəziyyətindən uzaqlaşdıqda öz funksiyalarını artıraraq bifurkasiya nöqtəsinə çatır və bu nöqtədə sistemin fluktasiyaları güclənərək onun təkamül yolunun şaxələnməsinə, sistemin təkamülünün müxtəlif trayektoriyalar boyunca səpələnməsinə səbəb olur. Bu göstərir ki, hər bir sistemin gələcəyə düşməsi bir mənalı olmayıb, çoxmənalı xarakter daşıyır.

Sinergetikanı fəlsəfədən fərqləndirən mühüm cəhətlərdən biri də zaman anlayışı ilə bağlıdır. Klassik fizikaya görə zaman geriyə dönən, kvant fizikasına görə zaman geridönməzdir. Priqojinin rəhbərliyi ilə Belçika məktəbi belə bir kəşfə imza atmışdır ki, zaman istər makro, istərsə də mikro aləmdə geridönməzdir, yəni dünyada yalnız bir "zaman oxu" vardır. Bu zaman vektoruna görə zaman keçmişdən indi vasitəsi ilə gələcəyə doğru axır.

Beləliklə, biz görürük ki, yeni elmlərarası istiqamət, yəni dünyagörüş olmaq etibarilə sinergetika fəlsəfə ilə sıx bağlıdır. Bu mənada sinergetikanı fəlsəfənin təbii elmi əsaslarından biri kimi qəbul etmək olar.

**İstifadə edilmiş ədəbiyyat**

1. Qurbanov F. Sinergetika: Xaosun astanasında. Bakı: Bakı Universiteti, 2004.

2. Səmədova R., Məmmədov Ə. Sistemli yanaşma və sinergetik paradiqma. Bakı, 2012.

3. Аршинов В. Синергетика как феномен постнеклассической науки. М: Ифран, 1999.

4. Гайденко П. Проблема рациональности на исходе XX века. // Вопросы философии, 1991, №6.

5. Князева Е., Курдюмов С. Основания синергетики. М.: УРСС, 2005.

6. Князева Е. Синергетика как новое мироведение: диалог с Пригожиным .//Вопросы философии, 1992, №12.

7. Николис Г., Пригожин И. Познание сложного. М.: Едиториал УРСС, 2003.

8. Пригожин И., Стенгерс И. Квант, Хаос, время. К решению парадокса времени. М.:УРСС, 2003.

9. Трубецков Д. Введение в синергетику Хаос и структуры. М УРСС, 2004.

10. Хакен Г. Синергетика. М.: Мир, 1980.

**А.Мамедов**

**Новое межнаучное направление (синергетика)**

**Резюме**

В статье рассматриваются основные понятия и представления современной междисциплинарной теории самоорганизации и коэволюции сложных систем. Синергетические идеи живо иллюстрируются образами из фактов разнообразия в живой природе.

В статье также рассматривается диалектическая взаимосвязь синергетии и философии. В этом аспекте раскрывается значение синергетики для философии, а также философии для синергетики.

**A. Mammadov**

**New inter scientific direction (Synergetic)**

**Summary**

The article deals with the main concepts and the ideas of modern inderdisciplinary theory of organization and coevolution of diffucult systems. Synergetic ideas illustrate characters of different datas in vivid nature.

The article also considers with dialectical interaction of synergetic and philosophy. In this aspect the mean of synergetic is explained for philosophy.



# TƏHSİL FƏLSƏFƏSİNİN ELMİ BİLİK SAHƏSİ KİMİ TƏŞƏKKÜLÜ

**Şelementyeva Tatyana Valeryevna**
***Novosibirsk Dövlət Memarlıq-İnşaat Universiteti***

***Açar sözlər:*** *təhsil, biliklər, inteqrasiya, təhsil paradiqması.*
***Ключевые слова:*** *образование, знания, интеграция, парадигма образования.*
***Key words:*** *education, knowledge, integration, training paradigm.*

Elmdə "təhsil" məfhumunun tərifinə bir neçə yanaşma məlumdur.

Fəlsəfi nöqteyi-nəzərindən bu, cəmiyyətin bir şəxs, yaxud qrupdan digərinə dəyərlərini, təcrübələrini, biliklərini ötürməsinin rəsmiləşdirilmiş prosesidir. Vətəndaşın təhsil alması dedikdə, fəlsəfə biliyi subyektinin sənədlə təsdiqlənən müəyyən maarif səviyyəsinə çatması nəzərdə tutulur (1, səh.150). Filosofların fikrincə, "fəlsəfə ,proqram hazırlanarkən qərar vermənin başlanğıc nöqtəsidir və proqramla əlaqədar veriləcək qərarların əsasını təşkil edir" (J.Soodlanda).

Hal-hazırda klassik təhsil modelinin müasir cəmiyyətin tələblərinə cavab vermədiyi barədə fikirlər də vardır. Təhsilin fəlsəfi dərk edilməsi "təhsil fəlsəfəsi" adında müstəqil fənnin formalaşmasında öz inikasını tapmışdır.

Elmi biliyin müstəqil sahəsi kimi təşəkkül prosesində olan təhsil fəlsəfəsi, ümumi fəlsəfənin nəzəri-metodoloji aparatını birləşdirib konkretləşdirərək və xüsusi elmlərdə toplanan biliklərdən istifadə edərək pedaqoji gerçəkliyə, onun məsələləri və ziddiyyətlərinə münasibəti təkmilləşdirir və bu gerçəkliyə müəyyən mənalar qazandırıb, dəyişdirilməsinin mümkün konseptual variantlarını irəli sürür (2, səh.24).

Klassik təhsil paradiqmasına tarix boyunca müxtəlif dəlillər verilmişdir. Klassik paradiqmaya xas olan ideal və normalar modifikasiya edilmiş, tamamlanmış, dəyişdirilmişdir. İbtidai və orta təhsil sistemində ifadəsini tapan universal təhsil istiqaməti sonradan başqa bir ideya – şəxsiyyətin təbii hüquqları, o cümlədən təhsil hüququ ideyası ilə təkmilləşdirildi. Bizim ölkəmizdə şəxsiyyətin təbii hüquqları ideyasına uzun zaman heç əhəmiyyət verilməmişdir. Dövlət sistemində müəyyən (olduqca orta) təhsil səviyyəsi əvvəllər siniflər üzrə fərqləndirilmiş, sonra ümumi təhsil olaraq bərabərləşdirilmişdir. Eyni zamanda şəxsiyyətin təhsili seçmə hüququna malik olduğu tamamilə nəzərdən qaçırılmışdır.

Bununla belə təhsilliliyin başa düşülməsinə yanaşmalar da dəyişilir. İnsan və təhsillilik barəsində ənənəvi fikirlərdən əlavə yeni fikirlər formalaşır, pedaqogikanın antropoloji əsaslarının əvəz olunması gerçəkləşir. Təhsilli insan, hətta dünyagörüşü formalaşmış olsa belə, "bilən insan" olmaqdan daha çox həyata hazırlanmış, müasir mədəniyyətin mürəkkəb məsələlərinə bələd olan, həyatda yerini dərk etməyə qabil insan olur (3, səh.27). Təhsil azad şəxsiyyətin formalaşması, digər insanları başa düşməsi, təfəkkürün, ünsiyyətin formalaşması və

nəhayət, insanın əməli iş və hərəkətləri üçün şərait yaratmalıdır.

Zəmanəmiz üçün önəmli olan daha bir tələb yad mədəniyyətin başa düşülməsi və qəbul edilməsidir. Bunu elə mənada anlamaq olar ki, o, öz daxilində dərk edilməz; yalnız müxtəlif mədəniyyətlərlə qarşılıqlı əlaqədə, görüş, dialoq içərisində öz mədəniyyətinin əsasları, xüsusiyyətləri qarşılıqlı və ya açıq anlaşılan olur. Bu deməkdir ki, təhsilli insan mədəni insandır və o mənada özgə mədəni mövqelərini, dəyərlərini anlayır və qəbul edir, güzəştə getməyi bacarır, təkcə özünün deyil, həm də özgənin müstəqilliyinin dəyərini dərk edir.

Daha bir təkidli tələb əxlaqlı, məsuliyyətli insanın formalaşmasıdır. Həmin tələb bu gün insanın xeyir və şər, özünün həyatda yeri, bilik, təbiətdən, mədəniyyətin taleyindən, öz yaxınlarından məsuliyyətlilik və s. əxlaqi gerçəklikləri dərk etməsi nöqteyi-nəzərindən, başqa sözlə, ilk növbədə humanitar cəhətdən qoyulur. Təbiyyat dünyagörüşü müasir mədəniyyət və təhsil vasitəsilə, demək olar ki, hər ikinci adama aşılanır, lakin dünyaya humanitar münasibətin əskikliyi getdikcə daha çox hiss olunur və ən zəruri ideal kimi dərk edilir.

Təhsili fəlsəfi kateqoriya kimi nəzərdən keçirərək təhsilin cəmiyyətə təsir dərəcəsini müəyyən etmək lazımdır ki, bu, cəmiyyətdə təhsilin funksiyalarının təhlili ilə mümkün olur:

1) Mədəniyyətin cəmiyyətə ötürülməsi və yayılması onların arasında ən önəmli olanıdır. Bunun mənası odur ki, təhsil təsisatı vasitəsilə sözün ən geniş mənasında başa düşülən mədəniyyətin dəyərləri (elmi biliklər, incəsənət sahəsində nailiyyətlər, əxlaqi dəyər və normalar, davranış qaydaları, müxtəlif peşələrə xas olan təcrübələr və s.) nəsildən-nəslə ötürülür. Bəşəriyyətin tarixi boyunca təhsil biliklərin başlıca mənbəyi, cəmiyyətin maarifləndirilməsinin vasitəsi olmuşdur. Bunu da unutmaq olmaz ki, hər xalqın mədəniyyəti öz milli-etnik köklərinə malikdir, buna görə də milli mədəniyyətin və eləcə də onun təkraredilməz, unikal xüsusiyyətlərinin yaşadılması və qorunmasında təhsil sisteminin müstəsna rolu vardır; sözügedən xüsusiyyətlərdə iştirak edən fərd milli şüurun və milli psixologiyanın daşıyıcısı olur.

2) Bu cəmiyyətdə hakim olan məqsədlərin, dəyərlərin, həyat ideallarının gənc nəsildə formalaşması. Bu sahədə gənclər cəmiyyətin həyatında fəal iştirak edir, ictimailəşir, sosial sistemə inteqrasiya edilirlər. Öz ana dilinin, vətəninin tarixinin, ədəbiyyatının, mənəvi-əxlaqi prinsiplərinin öyrənilməsi gənc nəsildə hamı tərəfindən qəbul edilmiş dəyərlər sisteminin formalaşması üçün zəmin yaradır; bu sahədə gənc nəsil başqa insanları və özlərini başa düşməyi öyrənir, ölkənin şüurlu vətəndaşları olur.

Təhsil sistemi tərəfindən həyata keçirilən uşaqların ictimailəşdirilməsi və tərbiyələndirilməsi prosesinin məzmunu cəmiyyətdə hakim olan dəyər standartları, əxlaq, din, ideologiyadan xeyli çox asılıdır. Sənayedən əvvəlki cəmiyyətlərdə dini tərbiyə məktəb təhsilinin tərkib hissəsi idi. Müasir sənaye cəmiyyətində din (kilsə) dövlətdən ayrıdır və formal təhsil sistemi dövlətin nəzarəti altındadır, buna görə dini təhsil və tərbiyə ya ailə çərçivəsində, ya da xüsusi qeyri-dövlət tədris müəssisələrində gerçəkləşdirilir.

3) Sosial seleksiya formal təhsil təsisatının ən mühüm funksiyalarından biridir. Təhsil prosesinin strukturu elə təşkil edilmişdir ki, artıq ilk mərhələlərdə oxuyan şəxslərə diferensial yanaşmaq imkanını verir (təhsil prosesinin "çətin" deyilən subyektlərinə təhsil vermə strategiyasının dəyişdirilməsi, istedadlı və qabiliyyətli olanların həvəsləndirilməsi).

4) Sosial və mədəni dəyişikliyin

funksiyası müasir təhsil təsisatının üstünlüyüdür.

Yuxarıda bəhs olunan funksiyanın həyata keçirilməsinin ən azı iki mexanizmini ayırırlar:

1. Ali təhsil müəssisələrinin elmi-tədqiqat işi çərçivəsində keçirdikləri elmi tədqiqatlar. Ali məktəb elmi tərəqqiyə yardım etməklə yanaşı, cəmiyyətin mədəni irsinin zənginləşməsi və genişlənməsinə də çox önəmli töhfə verir. Bundan əlavə, universitetlərin sənaye ilə sıx əlaqəsinə görə Qərb ölkələrinə xas olan elm, ali təhsil və istehsalın inteqrasiyası baş verir və bu inteqrasiya, elmi-texniki tərəqqinin sürətləndirilməsi ilə nəticələnir.

Universitetlər getdikcə daha çox elmi-tədqiqat mərkəzlərinə çevrilir, dövlət müəssisələri və sənaye şirkətlərinin sifarişi ilə nəzəri və tətbiqi tədqiqatlar həyata keçirir. Bununla yanaşı, ali təhsil müəssisələrində elmi tədqiqatların inkişaf etməsi ali təhsil sisteminin təkmilləşməsinə zəmin yaradır, çünki yeni elmi fikirlər və kəşflər tədris proqramlarına daxil edilib, mütəxəssislərin keyfiyyətinin artırılmasını təmin edir.

Beləliklə, təhsil təsisatının başlıca təsir istiqamətləri cəmiyyətin mədəni sahəsinə təsiri və öz fəaliyyətini təkmilləşdirməsindən ibarətdir. Bununla belə innovasiya texnologiyaları diqqət mərkəzində olur və təhsil islahatı da bunları tətbiq etmək məqsədi ilə aparılır. Bununla bağlı olaraq ali təhsil müəssisələrinin beynəlxalq və xarici iqtisadi fəaliyyət kimi inkişaf istiqaməti xüsusi diqqət kəsb edir.

Rusiyanın təhsil sisteminin vahid Avropa məkanına inteqrasiya çərçivəsində gerçəkləşdirilən bu istiqamət təhsil sahəsində mövcud olan bir sıra məsələlərin həllinə yardım edir.

Təhsil islahatını fəlsəfi cəhətdən nəzərdən keçirərkən təhsil sahəsində ən azı üç əsas meyli xüsusilə qeyd etmək olar. Birincisi, əsas təhsil paradiqmasının bütün dünyada dəyişməyə meyli (klassik təhsil modeli və sisteminin böhranı, təhsil fəlsəfəsi və sosiologiyasında, humanitar elmdə yeni təməl ideyaların işlənməsi, eksperimental və alternativ məktəblərin yaradılması). İkincisi, ali təhsil müəssisəsinin və təhsilin dünya mədəniyyətinə inteqrasiya istiqamətində hərəkət etməsi (ali təhsilin demokratizasiyası), fasiləsiz təhsil sisteminin yaradılması, təhsilin humanitarlaşması və kompyuterləşməsi, təhsil proqramlarının azad seçilməsi, orta və ali məktəblərin müstəqilliyi əsasında müəllimlər, şagirdlər və s. cəmiyyətlərinin meydana gəlməsi. Lakin qeyd olunmuş strategiyanın tərəfdarları üçüncü meyilə xüsusi əhəmiyyət verirlər ki, bu da rus məktəb və təhsil ənənələrinin bərpa olunmasıdır (4, səh. 27).

Lokal birliklərin formalaşmasının indiki mərhələsində, yəqin ki, müstəqilliyin, ayrılığın öhdəsindən gəlməyə diqqət yetirmək lazımdır. Tarixi taleyin ümumiliyini, ərazi, iqtisadi, siyasi və s. ümumiliyin dərk edilməsi getdikcə böyük rol oynayır. Buna görə də təhsil strategiyalarına bu cür yanaşmanın tərəfdarlarının fikrincə, mədəniyyət və təhsil sahəsinin vəzifəsi məhz bu proseslərin davam etdirilməsidir.

İslahatın ümumi mənası təhsilin cəmiyyətlə əlaqəsinin bərpa olunmasındadır. İslahatlara etiraz edənlər çox vaxt deyirlər ki, bizim yaxşı ənənəmiz var, dəyişməyə gərək yoxdur (5, səh.42). Lakin məsələ orasındadır ki, təhsilin həm iqtisadiyyat, həm müəssisələr, həm də oxuyan və oxumaq istəyən adamlarla əlaqəsi itirilmişdir.

Təhsildəki böhranı və onun öhdəsindən gəlməsinə dair fəlsəfi doktrinin olmamasını etiraf etməyin özü önəmlidir, ilk öncə alimlərin və ictimaiyyətin bu problemə diqqətinin cəlb edilməsi baxımından əhəmiyyət kəsb edir. Lakin konstruktiv yanaşma: nəinki təhsil fəlsəfəsi sahəsində, həm də təhsil

fəaliyyətinin bütün komponentlərinə və eləcə də bu fəaliyyətin təhsilin bütün səviyyələrində maliyyə, maddi-texniki, kadr, elmi-metodik və informasiya təminatına görə təhsil siyasəti və strategiyası sahəsində prioritet problematikasının və ən başlıcası, işləyə bilən praktikayönümlü konsepsiyaların əsaslandırılması daha çox önəmlidir.

Bu son dərəcə mürəkkəb və çox zəhmət tələb edən məsələlərin həlli kollektiv səylər tələb edir. Bununla bağlı olaraq, ali təhsil müəssisələrinin maliyyələşdirilməsi və elmi potensialından yetərli dərəcədə istifadə olunmaması məsələsini daha təfərrüatla nəzərdən keçirmək istərdik.

Ölkədə ödənişli təhsilin inkişafı sayəsində, müxtəlif növ ali təhsil müəssisələrinin təhsil xidmətlərinin müştərilərini cəlb etməkdə rəqabəti artıran təhsil xidmətləri bazarı formalaşmışdır və eyni zamanda hər bir ali məktəbin müasir şəraitdə inkişafı üçün rəqabət mühitinin yaradılmasının faydalılığını aktuallaşdırmışdır. Gələcək demoqrafik vəziyyət, dövlətin mütəxəssislərin hazırlanması üçün sifariş verməsi təhsil müəssisələri arasındakı rəqabəti daha da kəskinləşdirəcək, çünki onlar təhsil xidmətlərinin müştərisi olan tələbələri qəbul etməyə haqq qazanmalı olacaqlar (4, səh.26). Belə rəqabət şəraitində mütəxəssislərin hazırlanmasının keyfiyyəti, şübhəsiz, müasir Rusiya ali məktəbinin təhsil fəaliyyətinin aparıcı meyarı olacaq.

Məlumdur ki, təhsil sisteminin ünsürü kimi ali məktəb sosial-mədəni təsisatının, cəmiyyət sivilizasiya yolunda irəlilədikcə rolu artan xüsusi bir növüdür.

İnsanın inkişaf dərəcəsi, cəmiyyətdə mədəniyyət və mənəviyyat səviyyəsi, iqtisadi, elmi-texniki, ictimai-siyasi tərəqqinin templəri, cəmiyyətin idarə edilməsinin effektliliyi məhz dövlətin sosial-təhsil siyasəti və mütəxəssislərin hazırlanması keyfiyyətindən xeyli çox asılıdır. Ali təhsil təsisatının sosial məqsədi bir yandan cəmiyyətin yüksəkixtisaslı əmək subyektlərinə olan tələbatı, digər yandan da fərdlərin biliklərin müəyyən spektr və səviyyəsinə yiyələnməyə olan tələbatının təmin edilməsindən ibarətdir. Bu gün təhsil təsisatının cəmiyyətin həyatı və tərəqqisində xüsusi, müstəsna yerini sübut etməyə gərək yoxdur. Bununla belə, müasir elm, mədəniyyət və informatikanın əldə edilmiş olan böyük imkanları ilə bunların bütün cəmiyyətin həyatında gerçəkləşdirilməsi arasında meydana gələn çox böyük uyğunsuzluq həm ayrı bir ölkədə, həm də dünya miqyasında yalnız təhsil sisteminin genişlənməsi və keyfiyyət səviyyəsinin qaldırılması əsasında uğurla aradan qaldırıla bilər.

Müasir ali təhsilin qarşısında duran vəzifələrdən biri müasir iqtisadiyyatın dəyişən şərtlərinə cavab verə biləcək, yüksəkkeyfiyyətli təhsili təmin edə biləcək, məzunların əmək bazarında rəqabətə qabil olmalarına şərait yarada biləcək təşkilat-idarə mexanizminin yaradılmasıdır. Lakin ictimai proseslər sosial statusa, həmçinin əks təsir göstərə bilər.

Tarixdə təsdiq olunmuşdur ki, təhsil cəmiyyətin inkişafını müəyyən edən, cəmiyyət həyatının prioritet dəyərlərindən biridir. Ali məktəbdə şəxsiyyətin inkişafının əsası kimi sabit ictimailəşmə prosesini götürsək, dediyimizi belə dəqiqləşdirə bilərik: ali məktəbin təhsil fəaliyyətinin məqsədi təhsil keyfiyyətinin inkişaf etdirilməsidir ki, o da effektli təhsil texnologiyaları, biliyin əldə edilməsi vasitələri kimi təhsil metodlarından; kadr potensialı, professor-müəllim heyətinin peşəkarlığı və ali məktəbin fəaliyyətinin əsas şərti kimi elmi fəaliyyətindən birbaşa asılıdır (6, səh.43).

İnkişafın perspektiv istiqamətlərindən biri ali təhsil müəssisələrinin beynəlxalq və xarici iqtisadi fəaliyyətidir.

Bu istiqamətin əhəmiyyəti aşağıda

qeyd olunan bir sıra cəhətlərlə şərtləşdirilmişdir. Birincisi, ali təhsil müəssisələrinin beynəlxalq və xarici iqtisadi fəaliyyəti xarici ölkələrin təhsil müəssisələrinin təcrübəsindən faydalanmağa yol açır və bu təcrübə həm vətən, həm də dünya xidmət bazarı üçün mütəxəssislərin hazırlanmasında həyata keçirilə bilər. İkincisi, olduqca mühüm milli ixracat resurslarından olan mövcud təhsil potensialından effektli istifadə ali təhsil müəssisələrinin fəaliyyətlərinin maliyyələşdirilməsi üçün yeni vəsaitlər cəlb etməsinə imkan verəcək. Üçüncüsü, Avropa təhsil məkanına inteqrasiya vətən təhsil sahəsinə investisiya vəsaitlərinin cəlb olunmasına zəmin yaradacaq, bu da, şübhəsiz, aparılan təhsil islahatının məqsədlərinə uyğundur.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Закон РФ от 10 июля 1992 г. № 3266-I “Об образовании” (ред. от 23 июля 2008 г.) // СЗ РФ. 1996, №3, с. 150.

2. Фишер М. Философия образования и комплексные исследования образования/М.И.Фишер// Вопросы философии. 1995, № 11, с. 24.

3. Зотов А. Образование в конце XX века (материалы круглого стола) А.Ф.Зотов, В.И.Купцов, В.М. Розин, А.Р.Марков [и др.]. // Вопросы философии. 1992, № 9, с. 27.

4. Григорьева И. Философские аспекты образования. И.Григорьева //Социальные проблемы образования: методология, теория, технологии. Саратов, 1999, с. 27.

5. Александрова Р. Философия образования Российского зарубежья: духовно-нравственные искания /Р.И.Александрова, А.И.Белкин. //Российское зарубежье: образование, педагогика, культура, 20-50-е годы XX века. Саранск, 2003, с.42.

6. Крикунов А. К анализу концепции образования В.В.Розанова /А.Крикунов // Alma mater. 1998, № 4, с.43.

**Ш.Т.Валеревна**

**Философия образования как с формированная область на основе научных знаний**

**Резюме**

В статье говорится о философии образования и предстоящих задачах в этой области.

Затрагиваются проблемы комплексного исследования образования в высшей школе; пути совершенствования подготовки выпускников, востребованных на сегодняшний день.

**Sh.T.Valeryevna**

**Establishment of education philosophy as a field of science**

**Summary**

In this article it is noted that education philosophy effects the changes of developing scientific, cultural and moral virtues in the society. Education philosophy is introduced as a process of understanding scientific knowledge which existed as a process of independent sphere of knowledge.

***Tərbiyə məsələləri***



# TƏHSİLALANLARLA TƏRBİYƏ İŞİNİN TƏŞKİLİ TEXNOLOGİYALARI

**Şəhla Cəlilzadə,**
***Azərbaycan Müəllimlər İnstitutunun doktorantı (Salyan şəhəri)***

***Açar sözlər:*** *tərbiyə texnologiyası, mənəvi tərbiyə, qloballaşan dövr, tələbə şəxsiyyəti, məqsədyönlü, planlı, mütəşəkkil.*

***Ключевые слова:*** *образовательная технология, нравственное воспитание, эпоха глобализации, личность студента, целеустремленный, планирующий, организованный.*

***Key words:*** *educational technology, moral education, the era of globalization, the identity of the student, purposeful, planned, organized.*

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı fəaliyyət planı"nda aydın göstərilmişdir ki, təfəkkürün və şəxsiyyətin inkişafına yönəldilmiş innovativ təlimdə təhsilalanların fərdi xüsusiyyətləri nəzərə alınmalı, yeni kurikulumlara və informasiya-kommunikasiya texnologiyalarına əsaslanan mexanizmlər yaradılmalıdır. Bu baxımdan müasir dövrdə tərbiyə sisteminin formalaşdırılmasına ciddi ehtiyacın olduğu bir zərurət kimi çıxış edir. Əlbəttə, bu, ilk növbədə dünyada baş verən qloballaşma prosesi ilə şərtləndirilməlidir. Artıq ali məktəblərdə bu sahədəki işlər sürətləndirilməyə başlanmışdır. Azərbaycan Müəllimlər İnstitutunda "Müasir tərbiyə sisteminin vəziyyəti: axtarışlar, problemlər, təkliflər" mövzusunda keçirilən respublika konfransı da məhz bu aktual məsələyə həsr olunmuşdu. Üç istiqamətdə (Təlim-tərbiyə prosesinin elmi-nəzəri və praktik məsələləri; tərbiyənin psixoloji problemləri və onun şəxsiyyətin formalaşmasına təsiri; müasir dövrdə mənəvi-əxlaqi tərbiyənin ümumi problemləri) işləyən bölmələrdə müzakirə olunan 159 tezisin hər biri konkret mövzu ətrafında müəyyən olunan tədqiqat nəticələri bu sahədə dəyərli mənbə kimi əhəmiyyət daşıyır.

Cəmiyyətdə tərbiyənin başlıca vəzifələrindən biri xalqın milli-mənəvi dəyərlərindən təsirli vasitə kimi istifadə etməkdir.

Ulu öndər Heydər Əliyevin problemlə bağlı dediyi konseptual fikirlər bütün dövrlər üçün dəyərlidir: "Mənəvi tərbiyə prosesinin elmi təşkili, onun məqsəd və vasitələrinin qarşılıqlı münasibəti məsələləri, əhalinin müxtəlif sosial və yaş kateqoriyalarının tərbiyəsi xüsusiyyətlərinin aydınlaşdırılması aktual əhəmiyyətə malikdir" (3. səh.105).

Tərbiyə haqqında bütün dövrlərdə nəzəriyyələrin irəli sürülməsinə baxmayaraq onların praktik həllini reallaşdırmaqda texnologiyaların yaradılmasına ehtiyac olmuşdur. Çünki daha yaşlı nəsil həmişə özünün təcrübəsini, enerjisini, inamını böyüyən nəslə ötürmək üçün səmərəli yollar, texnologiyalar axtarmaq məcburiyyətində olmuşdur.

Qloballaşan dövrdə tərbiyənin texnologiyasının müasir tələblər səviyyəsində

qurmaq və onu tədqiq etmək alimlərin diqqətini cəlb etmişdir.

Pedaqoji ədəbiyyatda bu məsələ ilə əlaqədar ilk dəfə keçən əsrin 30-cu illərində A.S.Makarenko tərəfindən müəyyən fikirlər söylənildiyi bildirilsə də, XX əsrin 50-ci illərində "pedaqoji texnologiya" termini ABŞ-da yaranmışdır.

İstehsalat və tərbiyə proseslərinin texnologiyaları müvafiq üsul və vasitələrin səmərəli tətbiqinə yönəlməsinə baxmayaraq ,baş verən proses və nəticə bir-birindən tam fərqlidir. Tərbiyə prosesi həmişə bütöv və tam xarakter daşıyır.

Ali məktəbdə təhsilalanların tərbiyə işinin texnoloji mahiyyətini təhsil illərində onun əsas xüsusiyyətlərini ehtiva edən şüurlu motivlərin güclənməsi, davranışın sabitləşməsi, özünütəhlil, özünüqiymətləndirmə və özünütərbiyə məqsədləri təşkil edir.

Ali məktəbdə çalışan hər bir müəllim bilməlidir ki, "tələbə" sözünün dilimizdə hərfi mənası "tələb edənlər" deməkdir. Bu baxımdan, gələcəyin yüksəkixtisaslı mütəxəssisi kimi hazırlanan bir şəxs müasir tələblərə uyğun olaraq tərbiyə olunmalı, bütün zəruri bilik və bacarıqlara, davranışlara yiyələnməlidir (4, səh.433).

İnsan amilinin əsas yer tutduğu hazırkı dövrdə gənc nəslin elmi dünyagörüşə, yüksək əxlaqi keyfiyyətlərə malik olan, ahəngdar inkişaf etmiş, ictimai cəhətdən fəal olan, mənəvi zənginliyi, əxlaqi saflığı və fiziki kamilliyi özündə birləşdirən şəxsiyyət kimi tərbiyə olunması, formalaşdırılması ən vacib, təxirəsalınmaz bir problem kimi qarşıda durur. Tərbiyə şəxsiyyətin formalaşdırılmasına yönəldilmiş xüsusi fəaliyyət sahəsi olub, onun daxili və xarici amillərin təsiri altında baş verən inkişafının idarə olunmasıdır. Ona görə də şəxsiyyətin necə formalaşması, bu prosesə təsir edən amillər diqqəti cəlb edən əsas cəhətlərdəndir. Bu baxımdan, ilk növbədə nəyi tərbiyə etmək məsələsi, başqa sözlə, şəxsiyyətin strukturu, əlamət və keyfiyyətləri, xassələrini dəqiqləşdirmək lazım gəlir.

Bu baxımdan, müəllim hazırlığında keyfiyyət göstəricilərinin yüksəldilməsinə təsir edən yeni pedaqoji texnologiyaların səmərəli tətbiqi tərbiyənin müasir tələblər səviyyəsində inkişafına təminat verir.

Müəllim hazırlığı ilə məşğul olan təhsil müəssisələrində tədris olunan fənlərin rolunun yüksəldilməsində, onların tərbiyəvi təsir imkanlarının gücləndirilməsində pedaqogika elmi nəzəri və praktik əsasa malikdir. Pedaqogikanın digər fənlərin tədrisində rolu və onun tədrisi keyfiyyətinin yüksəldilməsində fəal təlim metodlarından istifadənin texnoloji imkanları təmin etməsi xüsusilə qeyd olunmalıdır.

Açıq etiraf etməliyik ki, ali məktəblərdə pedaqoji yönümlü fənlərin tədrisi ümumilikdə cəmiyyətdə tərbiyə probleminin keşiyində dayanan müəllimin səriştə və peşəkarlığını yüksəldən mühüm amillərdəndir.

Unutmaq olmaz ki, təlim prosesində baş verən bütün əməliyyatlar, tərbiyənin insan şəxsiyyətinin formalaşmasına yönəldilməsində optimallıq yaradan üsul, vasitə, texnika, metodların düzgün tətbiqini özündə əks etdirən texnologiyaların öyrənilməsi müasir dövrdə pedaqoq alimlərin daha çox diqqət göstərdiyi tədqiqat sahəsinə çevrilmişdir.

Məlum olduğu kimi, şəxsiyyətin hər bir keyfiyyəti bir-biri ilə ayrılmaz şəkildə bağlı olan bir vahiddir. Ona görə də şəxsiyyətin hər bir əlaməti başqa xüsusiyyətləri ilə əlaqəsindən asılı olaraq çox vaxt tamamilə fərqli xarakter daşıyır, özünəməxsus əhəmiyyət kəsb edir.

Ali pedaqoji məktəblərdə texnoloji olaraq iki əsas istiqamətdə (təlim və təlimdənkənar) tərbiyə işi həyata keçirilir. Qeyd olunan bu iki istiqamət dialektik vəhdət təş-

kil edib bir-birini tamamlayır. Ali məktəbdə təlimin tələbə şəxsiyyətinə tərbiyələndirici təsiri onların müstəqilliyinə, təşəbbüskarlığına, özfəaliyyətinə geniş imkanlar yaratmalıdır. Tərbiyə texnologiyası dedikdə, müntəzəm olaraq ümumiləşən münasibətlərin məqsədyönlü formalaşdırılması üçün əməliyyatların məcmusu kimi başa düşülür.

Pedaqoji təsirlər tərbiyənin ümumi məqsədlərinə yönəlsə də, bir qayda olaraq, insanın fərdi psixi xüsusiyyətləri ilə bağlıdır.

Görkəmli pedaqoq A.S.Makarenko bu məsələdən bəhs edərək yazırdı ki, tərbiyənin məqsədi dedikdə, insan şəxsiyyətinin, xarakterinin proqramını başa düşürəm; tərbiyə işində ümumi, “standart” proqram qəbul etməklə yanaşı, ona fərdi düzəlişlər də olunmalıdır.

Buna görə də tərbiyə işinin səmərəsi üçün hər bir tələbənin fərdi xüsusiyyətlərini nəzərə almaqla ona fəal təsir göstərmək, onda müəyyən maraqlar və tələbatlar formalaşdırmaq zərurəti yaranır.

Müasir pedaqoji nəzəriyyədə tələbələri fəaliyyət və ünsiyyət prosesində onlarla birgə iş zamanı, habelə inkişafda öyrənmək vacibdir. Yəni öyrənərək tərbiyə etmək, tərbiyə edərək öyrənmək lazımdır (8, səh.178).

Təhsilalana sosial təcrübənin mənimsədilməsi məqsədi ilə mütəşəkkil və planlı tərbiyə texnologiyasının təsir mexanizmi aşağıdakı bir çox mərhələni özündə birləşdirir:

• tələbəni (fərdi xüsusiyyətlərini) öyrənmək;

• davranış və əməllərinin motivlərini, səbəblərini müəyyənləşdirmək;

• tələbə qarşısında konkret tərbiyə mədsədi qoymaq;

• məqsədə çatmağın vasitə və yollarını müəyyənləşdirmək;

• müsbət emosional vəziyyət yaratmaq;

• məqsədin həyata keçirilməsində tələbəyə kömək və nəzarət etmək;

• ilk uğurları qiymətləndirmək, həvəsləndirmək;

• tələbəni özünənəzarət və özünütərbiyəyə cəlb etmək (8, səh.182).

Hər bir yaş dövrünün tərbiyə ilə bağlı öz tələbləri vardır. Tələbənin tərbiyəsi deyərkən, onun dünyagörüşünün, qabiliyyətlərinin, şüurluluğunun, məsuliyyət hissinin, intizamlılığının, özünütənqid və özünütərbiyənin, özünüdərk və özünüidarə etməyin, adamlarla işləmək bacarığının və şəxsi keyfiyyətlərinin inkişafı məqsədi ilə onun psixologiyasına, fəaliyyət və davranışına edilən məqsədəuyğun təsirlər başa düşülür (4, səh. 308-309).

Ali məktəbə xas olan aşağıdakı tərbiyə prinsiplərinin pedaqoji prosesdə reallaşdırılması vacibdir:

• tələbənin yaş, sosial, psixoloji və fərdi xüsusiyyətlərinin nəzərə alınması;

• ali pedaqoji məktəbdə təhsilalanın tərbiyəsinin ictimai-istehsal və elmi-tədqiqatçılıq fəaliyyəti ilə əlaqələndirilməsi;

• ali pedaqoji məktəbdə tərbiyənin peşə-ixtisas istiqamətli olması;

• təhsilalanın ali məktəb təhsilindən sonrakı praktik fəaliyyətə hazırlanması.

Həmçinin ali məktəbdə tərbiyə işinin xüsusiyyətləri nəzərə alınarkən aşağıdakılara diqqət artırılması məqsədəuyğundur:

• hər bir kursda tərbiyə işinin özünəməxsus istiqamətləri müəyyənləşdirilməli;

• tərbiyə işində tələbələrin yaş xüsusiyyətləri nəzərə alınmalı;

• birinci kurs tələbələri ilə aparılan tərbiyəvi işlərə xüsusi diqqət yetirilməli.

Birinci kursda adaptasiya prosesi başlanır, tələbənin peşəni düzgün, məqsədəuyğun, yaxud təsadüfi seçməsi, nəyə qadir olması və bir çox məsələlər aşkarlanır. İlk növbədə, birinci kursda təhsilalanlara əqli əməyin təşkili, mədəniyyəti, gigiyenası

* 6

barədə müvafiq məlumatlar verilməklə onların mühazirələrdə qeydlər götürməsi, seminar məşğələlərinə, kollokviumlara, məqbul və imtahanlara hazırlıq məsələləri şərh olunmalıdır.

Təhsilalanların tərbiyəsi işində əməksevərlik tərbiyəsinin imkanlarından bacarıqla istifadə olunmalıdır. Çünki əmək tərbiyəsi tələbənin təhsilinin səmərəliliyini təmin edən zəruri bilik və bacarıqların mənimsəməsini və digər ictimai fəaliyyət növlərinə fəal surətdə qoşulmasını, eləcə də gələcək peşə və ixtisasla bağlı yarana biləcək çətinliklərin aradan qaldırmasını təmin edir.

O da unudulmamalıdır ki, təlim ağıla, zəkaya və təfəkkürə şamildirsə, tərbiyə qəlbə, vicdana, əxlaqa və mənəviyyata aiddir. Şəxsiyyətin formalaşması bu iki təkamül ilə gerçəkləşir.

Tələbədə peşə etikasının formalaşdırılması tərbiyə işinin ayrılmaz tərkib hissəsidir. Qarşıda duran başlıca vəzifə tələbəyə dərs deyən müəllim tərəfindən ümumi əxlaqi normaları konkret situasiyalara tətbiq etməklə ona peşə etikası aşılamasıdır.

Ali məktəbdə tələbələrin milli və hərbi vətənpərvərlik ruhunda tərbiyəsi pedaqoji prosesin məqsədində sistemli olaraq əksini tapmalıdır.

İctimai əhəmiyyət kəsb edən mənəvi keyfiyyətlərin tələbələrə aşılanması sosialyönümlü işlərlə həllini taparaq onlardavətəndaşlıq, şüurlu intizam, mərdlik, mütəşəkkillik, diqqətlilik və həssaslıq, qətiyyət və nəzakətlilik tərbiyə edir.

Ali məktəbdə təhsilalanların elmitədqiqat işlərinə cəlb edilməsi onlarla aparılan tərbiyə işinin mühüm vasitələrindəndir. Tələbələrin elmi ideyaların və işlərin müzakirələrində iştirak etmələri nəticəsində qazanmış olduqları məlumatların onların mənəviyyatca zəngin mütəxəssis kimi formalaşmasında əhəmiyyətli rolu vardır.

Təcrübə göstərir ki, pedaqoji prosesdə müəllimin oxuduğu mühazirə əvəzolunmayan tərbiyə formasıdır. Bu zaman tələbələrin əqlinə və hislərinə qüvvətli təsir edilərək onların fəal qavramaları təmin olunur. Müasir pedaqogika tərbiyəyə şəxsiyyətin ahəngdar formalaşması və inkişafı prosesi kimi baxır.

Ali məktəbdə tərbiyənin başlıca məqsədi ahəngdar inkişaf etmiş şəxsiyyət - vətəndaş yetişdirməkdir. Tələbələrdə həmin keyfiyyətlərin formalaşmasında tərbiyənin ayrı-ayrı tərkib hissələri aparıcı rol oynayır. Məsələn, intellektual keyfiyyətlər (əqli tərbiyə), ideya-mənəvi yetkinlik (ideya-mənəvi tərbiyə), əmək və peşə hazırlığı (əmək tərbiyəsi), estetik zövq (estetik tərbiyə), fiziki sağlamlıq, gümrahlıq (fiziki tərbiyə), ekoloji, hüquq və iqtisadi mədəniyyət (ekoloji, hüquq və iqtisadi tərbiyə). Tələbənin hərtərəfli inkişafı üçün göstərilən tərbiyə sahələri kompleks şəkildə həyata keçirilməlidir. Bunun üçün ali məktəbdə müvafiq şərait yaradılmalı, planlı və sistemli iş aparılmalıdır.

Tələbələrin bütün fəaliyyətlərinin və davranışının şüurlu, ideyaca əsaslanmış olması, onların əqidələrinin, həyat mövqelərinin cəmiyyətin məqsəd, mənafe və mövqeləri ilə eyni olması tərbiyə prosesinin əsas nəticələridir (5, səh.166).

İstedadlı tələbələrlə aparılan tərbiyə işinin texnologiyasında fərdi yanaşmaya xüsusi diqqət göstərilməlidir. Belə tələbələrin daha çox diqqət və qayğıya ehtiyacı var. Necə deyərlər, "istedadlara hökmən kömək lazımdır, istedadsızlar özlərinə yol tapacaqlar" deyimi nəzərdən qaçırılmamalıdır. Tarixi təcrübədən məlum olur ki, bəzi istedadlı adamlar müəyyən əhəmiyyət kəsb etməyən məsələlərin həllində müvəffəqiyyət qazana bilmirlər. Məsələn, Ç. Darvinin Edinburq universitetindən xaric edilməsi, A. Eynşteynin Sürix politexnikumuna, C.

Berdinin Milli konservatoriyaya qəbul imtahanlarından keçə bilməmələri və b.

Tərbiyə həmişə hər dövr üçün təkamül prosesi keçirən psixoloji bir sistemdir. Onun alt sistemi kimi texnoloji səciyyə daşıyan aşağıdakı cəhətləri mühüm əhəmiyyət kəsb edir:

- maddi və mənəvi şərait;
- fəaliyyətin bütün növləri;
- tədris planı;
- sistemli rəhbərlik (6, səh.68).

Tərbiyə məqsədyönlü, planlı, mütəşəkkil, çoxamilli, ziddiyyətli və mürəkkəb proses olduğu üçün bu cəhətlər tələbə şəxsiyyətinin formalaşmasında həmişə diqqətdə saxlanmalıdır (7, səh.111).

Azərbaycanda təhsilin inkişafı üzrə Dövlət Strategiyası tərbiyə işinin texnologiyası məsələlərinin də yenidən işlənməsini, təkmilləşdirilməsini, ümumiyyətlə, Dövlət Strategiyasının həyata keçirilməsi üçün nəzərdə tutulmuş fəaliyyət planının tərbiyə sahəsində, demək olar ki, bütün parametrlərdə yenilənməsini bir vəzifə kimi qarşıya qoyur.

*Rəyçi: dos. H.Cəfərov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, № 5.

2. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı. //Azərbaycan, 2015, 20 yanvar.

3. Heydər Əliyev: mədəniyyət, mənəvi dəyərlər, mənəvi tərbiyə. Bakı: Müəllim, 2008.

4. Rüstəmov F., Dadaşova T. Ali məktəb pedaqogikası. Bakı: Nurlan, 2007.

5. Bəşirov V. Ali məktəb didaktikası. Bakı: Maarif, 1992.

6. Mirzəcanzadə A. İxtisasa giriş. Bakı: BDU, 1990.

7. Ağayev Ə. və b. Pedaqogika. Bakı: Adiloğlu, 2006.

8. İsmixanov M., Bəxtiyarova R. Ali məktəb pedaqogikası. Bakı: BDU, 2011.

9. Füyuzat, 2014, №6.

**Ш.Джалилзаде**

**Технология организации воспитательной работы с обучающимися**

**Резюме**

В статье описаны характерные особенности, связанные с темой и пояснены цельи, процессы и результаты темы.

**Sh.Calilzadeh**

**Organizational technologies of students training**

**Summary**

The article describes the characteristics of the subject matter and explained the purpose, process and the result of the topic.



# QABİLİYYƏTİN İNKİŞAFINA FƏRDİ YANAŞMA

**Səlahət Əsədova,**
***Bakı şəhəri MLK-nın ingilis dili müəllimi, Amerika Təhsil Şurası "Təhsildə əməkdaşlıq" proqramının məzunu, "Ən yaxşı müəllim" müsabiqəsinin qalibi***

***Açar sözlər:*** *çoxşaxəli qabiliyyət, incəsənət qabiliyyəti, fiziki qabiliyyət, musiqi qabiliyyəti, məntiqi qabiliyyət, fərdlərarası qabiliyyət, fərddaxili qabiliyyət, naturalist qabiliyyət, linqvistik qabiliyyət, dahi, bütövlüklə dərketmə.*

***Ключевые слова:*** *множественность интеллектов, пространственный интеллект, кинестетический интеллект, музыкальный интеллект, логический интеллект, межличностный интеллект, внутриличностный интеллект, натуралистический интеллект, лингвистический интеллект, гений, мета познание.*

***Key words:*** *multiple intelligence, spatial intelligence, kinesthetic intelligence, musical intelligence, logical intelligence, interpersonal intelligence, intrapersonal intelligence, naturalistic intelligence, linguistic intelligence, genius, meta cognitionы.*

Hər il on minlərlə gənc tam orta məktəbi bitirib bilik və qabiliyyətlərini sınamaq üçün ali təhsil müəssisələrinə üz tutur. Eləcə də hər il minlərlə gənc universitetləri bitirib maraqlarına uyğun iş axtarırlar. Ali və orta ixtisas məktəblərinə daxil ola bilməyənlər isə heç bir peşəyə yiyələnmədikləri üçün bir sıra çətinliklərlə üzləşirlər. Ona görə də hazırda təhsilimizdə hər bir gəncin qabiliyyət və bacarığının aşkarlanması və uyğun fəaliyyət istiqamətinə yönləndirilməsi işi xüsusi aktuallıq kəsb edir.

Bu problemin həllinə yönəlmiş istiqamətlər təhsilimizə dair ən mükəmməl sənəd olan "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda öz ifadəsini tapmışdır. Strategiyada:

- səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsil məzmununun yaradılması;
- innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksəknüfuzlu təhsilverənin formalaşdırılması;
- ilk peşə-ixtisas təhsil müəssisələrinin infrastrukturunun inkişafına yönəlmiş və dövlət – biznes partnyorluğuna əsaslanan sosial xarakterli Müasir Azərbaycan Peşəkarları Layihəsinin həyata keçirilməsi kimi, çox mühüm fəaliyyət istiqamətləri müəyyənləşdirilmişdir.

Şəxsiyyətyönümlü təhsil və innovativ təlim metod və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksəknüfuzlu təhsilverənin (müəllimin) yetişdirilməsi kurikulum islahatı ilə birgə reallaşır.

Müasir Azərbaycan Peşəkarları Layihəsinin həyata keçirilməsi təhsil sahəsində yaranmış problemlərin həllinə yönəl-

miş mühüm bir addımdır. Bu layihənin reallaşması ilə bağlı ümumtəhsil məktəb müəllimlərinin də üzərinə çox böyük vəzifələr düşür. Belə ki, şagirdləri qabiliyyət və maraqlarına uyğun olaraq müxtəlif peşələrə yönəltmək vəzifəsi məhz ümumtəhsil məktəbindən başlayır. Doğrudan da, hər bir şagirdin fərqli qabiliyyətinin üzə çıxarılması və ona uyğun peşə seçimi çox böyük uğurdur. "Qabiliyyət" adlandırdığımız bu məfhuma isə fərqli baxışlar daxildir. XIX əsrin 80-ci illərinə qədər hər kəsin yalnız bir qabiliyyətindən danışılırdısa, 1983-cü ildə Harvard Universitetinin professoru Dr.Howard Gardner fərqli bir nəzəriyyə - çoxşaxəli qabiliyyət nəzəriyyəsini işləyib hazırladı. Dr. Gardnerə görə qabiliyyət oxu, yazı və riyazi bacarıqlara uyğun olaraq ölçülür və insanın gələcəyi də, əsasən, buna görə müəyyən edilir. O, ilk kitabı olan "Beyinin çərçivələri" (Frames of Mind) adlı əsərində yazır ki, hər bir fərd özündə 8 fərqli qabiliyyətin birini deyil, bir neçəsini birləşdirir. Hətta zehni qüsuru olan bir uşağın dili ilə bağlı çatışmazlıqları olarsa, o, çox yaxşı bir rəsm çəkər və ya hər hansı bir musiqi alətində çox gözəl ifa edə bilər. Dr. Gardnerin nəzəriyyəsinə uyğun olaraq öyrətmə üsullarının geniş diapazonu imkan verir ki, müəllimlər və valideynlər uşaqların zəif və güclü tərəflərini (qabiliyyətlərini) onların maraqlarına görə istiqamətləndirə bilsinlər. Dr. Gardnerin müəyyən etdiyi 8 fərqli qabiliyyət aşağıdakılardan ibarətdir:

1) İncəsənət qabiliyyəti (Spatial Intelligence) 2) Fiziki qabiliyyət (Kinesthetic Intelligence) 3) Fərddaxili qabiliyyət (Intrapersonal Intelligence) 4) Fərdlərarası qabiliyyət (Interpersonal Intelligence) 5) Məntiqi qabiliyyət (Logical Intelligence) 6) Linqvistik qabiliyyət (Linguistic Intelligence) 7) Naturalist qabiliyyət (Naturalistic Intelligence) 8) Musiqi qabiliyyəti (Musical Intelligence).

İncəsənət qabiliyyətinə malik olan uşaqlar hər hansı bir obyekti daha sürətlə qavrayırlar. Bura şəkillər, diaqramlar, filmlər, flaş kartlar, flip-çatlar daxildir. İnformasiyanı şəkil və təsvirlərdən daha tez qəbul etdikləri üçün onların əla motorik qabiliyyətləri olur. Bu cür uşaqlar müxtəlif növ krossvord, şəkil və formalardan həzz alırlar. Belə uşaqlar kitabı oxumazdan əvvəl onun şəkillərinə baxırlar. Bu cür qabiliyyəti inkişaf etmiş uşaqlar üçün yararlı peşələr aşağıdakılardır: tikişçi, dulusçu, zərgər, qrafik dizayner, rəssam, heykəltəraş, fotoqraf, cərrah və s.

Fiziki qabiliyyətli öyrəncilər toxunma, əllə hissetmə kimi fiziki təcrübələrdən faydalanırlar. Beyinləri ilə bədənləri arasında xüsusi harmoniya olduğu üçün onlar dünyanı daha çox toxunma və hərəkətlə dərk edirlər. Bu cür uşaqlar daha çox bədən üzvlərini hərəkət etdirərək öyrənir, əllə bağlı hərəkətləri yaxşı yerinə yetirir, oynaqların, əzələlərin, sinir və digər bədən hissələrinin diqqətli və sürətli kordinasiyasını təmin edirlər. Bəzən onları hiperaktiv və diqqəti toplaya bilməyən kimi qiymətləndirirlər. Bu cür uşaqları məktəbdə nəyisə öyrənməyə cəlb etmək müəllimlər üçün çox çətin olur. Çünki onların enerjisini sərf etməyə tənəffüs bəs eləmir və enerjisini sərf edə bilməyən şagird dərsdə əsəbi və cansıxıcı olur. Bu cür uşaqlara uyğun gələn peşələr aşağıdakılardır: məşqçi, atlet, rəqqas (rəqqasə), aktyor (aktrisa), hərbçi, yanğınsöndürən və s.

Fərddaxili qabiliyyətli öyrəncilər öz vaxtlarını şəxsi məqsədlərinə sərf etməyi





xoşlayırlar. Bəzən başqalarından utancaq görünür, sakit şəraitdə işləyirlər. Onlar müstəqildirlər və vaxtlarını yalnız düşünmək və işləməklə keçirməkdən məmnundurlar. Bu cür uşaqlar özlərinin zəif və güclü cəhətlərini bilirlir, ancaq böyüyəndə kim olacaqlarını müəyyən edirlər. Bu öyrəncilər dinlə və ya incəsənətlə, musiqi ilə, yaradıcılıqla yaxud gündəlik yazmaqla öz daxili hislərini ifadə edə bilərlər. Onlar gələcəkdə yaxşı filosof, nəzəriyyəçi, ixtiraçı, humanitar sahədə işçi, tədqiqatçı, psixoloq və ya yazar olurlar.

Fərdlərarası qabiliyyətli öyrəncilər işləməkdən, öyrənməkdən, kömək etməkdən, insanların arasında olmaqdan həzz alırlar. Onların həmçinin dostluq əlaqələri geniş olur, müxtəlif komandalara üzv olur, komandalarda oynayır, bölüşməyi sevirlər. Bu cür uşaqlar digərlərinin qeydinə qalır, məsləhət verir və onları müdafiə edə bilirlər. Onlar ehtiyacı olan qonşuya kömək edir, məktəbə gələn təzə uşaqla dostluq edir ki, o özünü tənha hiss etməsin. Bu qabiliyyətdə olan uşaqlar yaxşı müəllim, terapevt, psixiatr, siyasətçi, polis, həkim, psixoloq, sosioloq və s.ola bilirlər.

Məntiqi qabiliyyətli öyrəncilər çoxlu sual verir və yaxşı krossvord həll edirlər. Onlar təcrübə aparmağı, işlərində məntiqi nəticə çıxarmağı bacarır, dizayn problemlərini, hər hansı mexanizmin iş prinsiplərini öyrənməyə can atırlar. Bu cür öyrəncilər riyaziyyatı, kompyuter texnologiyalarını daha çox sevirlər. Onlar öz əşyalarını təmiz saxlayır, işlərini planlı şəkildə həyata keçirir, bir iş görməzdən əvvəl nəticəsini düşünürlər. Onlara uyğun gələn peşələr aşağıdakılardır: mühasib, tədqiqatçı, proqramçı, mühəndis, ixtiraçı, p.

Linqvistik qabiliyyətli öyrəncilər sözə daha çox üstünlük verirlər. Onlar yaxşı təsvir edir, izah edir, oxumaqdan həzz alır, yazmağı, hekayə uydurmağı və danışmağı xoşlayır, diskussiya və debatlarda iştirak edirlər. Bu cür uşaqlar sakit, ağıllı və yaxşı dinləyici olurlar. Çox sayda eşitmə və nitq qüsuru olan uşaqlar da beyinlərinin bu hissəsini daha çox işlədirlər. Onlara uyğun ən yaxşı karyera jurnalist, kitabxanaçı, şərhçi, tərcüməçi, müəllim, hüquqşünas, şair, yazıçı, dramaturq, ictimai xadim, redaktor, media məsləhətçisi, televiziya-radio diktoru, satıcıdır.

Naturalist qabiliyyətli öyrəncilər fiziki qabiliyyətli öyrəncilər kimi toxunmağı, hiss etməyi, tutmağı xoşlayırlar, ancaq bunları təbiətdə və heyvanlar arasında etməyi üstün tuturlar. Naturalistlər ətraf mühitlə bağlı hər şeylə maraqlanırlar. Onlar daha çox açıq havada vaxt keçirmək, xırda daşlar, balıqqulaqları toplamaq, heyvanlara qulluq etmək, heyvanlar və ətraf mühiti qorumaq və öyrənməkdən həzz alırlar. Bu cür uşaqlar evdə kiçik ev heyvanı saxlayır, ətraf mühiti çirkləndirənləri xoşlamır, bəzən də vegeterian olurlar. Bu cür uşaqlara uyğun gələn peşələr aşağıdakılardır: arxeoloq, bağban, fermer, bioloq, heyvan təlimçisi, ətraf mühit mühafizəçisi, balıqçı, fotoqraf, baytar, zooloq.

Musiqi qabiliyyətli öyrəncilər informasiyanı səslər, mahnılar, musiqi, cingilti və ritmlər vasitəsilə almağı xoşlayırlar. Onlar musiqiyə qulaq asmaq, bəstələmək və zümzümə etməkdən zövq alırlar. Bu cür uşaqlar hər növ musiqini sevirlər və hara gedirlərsə, başlarında bir musiqi parçası olur. Onlar üçün ən yaxşı peşələr bunlardır: musiqişünas, müğənni, bəstəkar, ifaçı, musiqi müəllimi, alət ustası, orkestrdə ifaçı, dirijor, musiqi tənqidçisi, DJ, film prodüssir, məzhəkəçi.

Göründüyü kimi, şagirdlərimiz fərqli qabiliyyətə malikdirlər. Bu qabiliyyətlərinə görə də onlar fərqli öyrənirlər. Əgər biz onlardan bacarmadığı, sevmədiyi bir işi görməyi tələb etsək, nələr baş verər? Dahi A.Eynşteynin bu statı sualımıza çox gözəl cavabdır: "Hər kəs dahidir, ancaq əgər sən

balığı ağaca çıxmaq qabiliyyətinə görə mühakimə etsən, o, ömrü boyu özünün küt olduğuna inanaraq yaşayacaq”. Ona görə də şagirdlərimizin fərqli qabiliyyətlərini üzə çıxararaq onların maraqlarını nəzərə alıb düzgün istiqamətləndirmək çox vacibdir. Həm də şagirdlərimizin fərqli qabiliyyətlərini nəzərə alaraq müxtəlif öyrətmə üsullarından istifadə etməliyik. Bu da bir faktdır ki, onları eyni üsulla öyrətmək mümkün deyil, çünki hər birinin fərqli öyrənmə bucağı var. Müəllimlər isə onların uğurlarını təmin etmək üçün fərqli öyrətmə üsullarını bacarmalıdırlar. Ona görə də Gardnerin təklif etdiyi fərqli öyrətmə üsullarından sinifdə istifadə etməklə çox faydalanmaq olar. Fərqli öyrətmənin təcrübədə öz təsdiqini tapmış faydalı nəticələri mövcuddur ki, onun da bir neçə cəhətlərini nəzərə çatdırmaq yerinə düşərdi:

1) Çoxşaxəli qabiliyyəti inkişaf etdirən fərqli öyrətmə üsullarından istifadə şagirdlərin uğurlarına kömək edir, məsələn, müəllimin özünün linqvistik qabiliyyətə malik olması heç də o demək deyildir ki, onun şagirdləri də belə olsun. Yəni onlar müəllimin danışığına qulaq asmaqla, suallara yazılı və şifahi cavab verməklə, müzakirələrdə iştirak etməklə öyrənməlidirlər.

2) Çoxşaxəli qabiliyyəti inkişaf etdirən fərqli öyrətmə üsullarından istifadə bir çox hallarda sinfin idarə olunması ilə bağlı problemləri aradan qaldırır. Belə ki, sinifdə şagird tapşırığı yerinə yetirməkdə çətinlik çəkəndə ümidsizləşir və tapşırıq ona darıxdırıcı görünür, bu zaman da davranış problemləri başlayır. Əgər müəllim tapşırıqlara qabiliyyətin bir neçə növünü daxil etsə, şagirdlərdə çalışmaya maraq oyanar və onu yerinə yetirməyə həvəsləri artar.

3) Çoxşaxəli qabiliyyəti inkişaf etdirən fərqli öyrətmə üsullarından istifadə şagirdlərin gələcəkdə bütün qabiliyyətlərinin inkişafına kömək edir. Araşdırmalar göstərir ki, şagirdlərimizin hamısında bu qabiliyyətlər müəyyən dərəcədə mövcuddur. Məsələn, ola bilər ki, ingilis dili müəllimi digər fənləri inteqrasiya etməyi üstün tutsun, yaxud mövzu ilə bağlı müxtəlif klip-çatlar, video, musiqi, riyazi çalışmalar və s.-dən istifadə etsin. Bu, o deməkdir ki, fiziki qabiliyyətli öyrəncilərin həm də musiqi, məntiqi-riyazi qabiliyyətləri də inkişaf etdirilməlidir. Çünki fərqli öyrətmə üsulları şagirdlərə hər hansı bir materialı bütövlükdə dərk etmək imkanı verir. Bunun üçün də şagirdlərdə necə öyrənmək istədikləri barədə düşünmə imkanı yaranır. Onlar fərqli öyrənmə üsullarından xəbərdar olmalı və necə öyrənmək istədiklərini özləri seçməlidirlər.

Fərqli qabiliyyətləri aşkara çıxaran aşağıdakı test nümunələrindən də faydalanmaq olar:

Test nümunələri

1) Məktəbdə sevdiyin fənn:

A) rəsm B) bədən tərbiyəsi
C) ədəbiyyat Ç) riyaziyyat
D) nitq və debat E) musiqi
Ə) zoologiya F) psixologiya.

2) Boş vaxtlarında xoşlayırsan:

A) oxumağı
B) idmanla məşğul olmağı
C) rəsm çəkməyi
Ç) riyazi məsələ həll etməyi
D) düşərgəyə, dağlara, bağçaya getməyi
E) musiqi dinləməyi
Ə) vaxtını tək keçirməyi
F) qonaqlıqlara getməyi

3) Televizor proqramlarından adətən hansına baxırsan?

A) Musiqi proqramlarına
B) klassik əsərlərin səhnələşdirilməsinə
C) elmi proqramlara
Ç) dizayn və stil proqramlarına
D) idman xəbərlərinə
E) tok şoulara
Ə) təbiətə aid proqramlaraa

F) sənədli proqramlara

4) İstirahət günün gözəl bir yay gününə təsadüf edir, daha çox nə edərdin?
A) özün-özünə sakit bir gün keçirərdin
B) incəsənət muzeyinə gedərdin
C) maraqlı bir kitab oxuyardın
Ç) konsertə gedərdin
D) dostlarınla futbol (voleybol) oynayardın
E) ev təsərrüfat büdcəni nəzərdən keçirərdin
Ə) dostlarınla ticarət mərkəzində dolaşardın
F) təbiət qoynuna bir günlük səfər edərdin

5)Yeni bir layihə üzərində işləmək istərkən daha çox nədən ilhamlanardın?
A) öz ideyalarını başqaları ilə müzakirə edərdin
B) evinə yaxın ətrafda qaçardın
C) seçimlərini beynində tədqiq edərdin
Ç) mövzu ilə bağlı məqalələr oxuyardın
D) layihənin üzərində sakitcə düşünərdin
E) bağında işləyərdin
Ə) alternativləri sıralayıb müxtəlif faktorlara əsaslanaraq bal verərdin
F) sevdiyin musiqilərə qulaq asardın

6) Qonaqlıqda daha çox nə edərdin?
A) sevdiyin müəllif haqqında müzakirələr aparardın
B) kimisə oxatma oynuna dəvət edərdin
C) mümkün qədər çox insanlarla söhbət edərdin
Ç) bütün axşamı qonaqlığın neçəyə başa gəldiyini hesablamaqla keçirərdin
D) ev sahibinin evinin arxitekturası ilə maraqlanardın
E) sakitcə başqalarını müşahidə edərdin
Ə) ev sahibinin bağında gəzişərdin
F) ev sahibinin CD kolleksiyasını nəzərdən keçirərdin

7) Diş həkiminin qəbulunda növbə gözləyirsən. Vaxtının tez keçməsi üçün nə ilə məşğul olardın?
A) kitab oxumaqla
B) Milli Coğrafiya jurnalının hər hansı bir nömrəsini nəzərdən keçirməklə
C) kağız üzərində cızma-qara şəkillər çəkməklə
Ç) həyətdə gəzişməklə
D) MP3 pleyerinə qulaq asmaqla
E) sudoku (riyazi oyun) oynamaqla
Ə) dostlarınla mesajlaşmaqla
F) psixologiyaya aid məqalə oxumaqla

8) Səni tamaşada iştirak etməyə dəvət ediblər. Hansı rolu seçərdin?
A) hər hansı bir alətdə çalardın
B) ssenari yazardın
C) rejissorluq edərdin
Ç) səhnə avadanlıqları, geyimləri və digər resurslarla məşğul olardın
D) tamaşaçı kimi tamaşanı seyr edərdin
E) büdcəni planlaşdırardın
Ə) rəqs edərdin
F) səhnəni quraşdırardın

9) Dostlarınla oyun oynamağa hazırlaşırsan. Hansı işi öz üzərinə götürərdin?
A) mahnının sözlərini xatırlamaq
B) bitki və heyvanları müəyyən etmək
C) komanda yoldaşlarına ipucu vermək üçün şəkil çəkmək
Ç) məşhur sitatın kimə məxsus olduğunu tapmaq
D) qrupa liderlik etmək
E) fiziki hərəkətlər etmək (məs., səbətə top atmaq)
Ə) tapmacaları tapmaq
F) riyazi məsələ həll etmək

10) Sabahkı testə hazırlaşmaq üçün materialları təkrar etməlisən. Hansı öyrənmə üsulundan istifadə edərdin?
A) sinif yoldaşlarınla birgə məşğul olardın
B) materialı məntiqi cəhətdən anlamağa çalışardın
C) oxuyub qeydlər edərdin
Ç) biliyi təcrübədən əldə etməyə çalışardın
D) otağına qapılıb sakitcə məşğul olardın
E) materialı ümumiləşdirən diaqram və cədvəl hazırlayardın
Ə) nəzəriyyələri asan yadda saxlamaq üçün müxtəlif kateqoriyalara bölərdin
F) müxtəlif nəzəriyyələri yadda saxlamaq

üçün onlara mahnı yazardın

Bu cür test nümunələri ilə şagirdlərin bir deyil, bir neçə qabiliyyətini aşkara çıxarmaq mümkündür (belə ki bir neçə düzgün cavab qəbul edilməlidir). Hər kəsin maraq və qabiliyyətini müəyyənləşdirdikdən sonra isə fərqli qabiliyyətlərə uyğun çalışmalardan istifadə edə bilərik. Məsələn, linqvistik öyrəncilər sözləri daha çox sevdikləri üçün onlara düşünmə, problemi həll etmə imkanları verməli və onları aşağıdakı kimi tapşırıq və layihələrdə çalışdırmaq lazımdır:

- lüğətdən istifadə etməklə krossvordları tamamlamaq,
- sinif qəzeti üçün kiçik hekayə, esse yazmaq,
- məktəb divar qəzeti üçün kiçik məqalə yazmaq,
- yarışmaları keçirmək,
- yaxşı natiqlik müsabiqəsi keçirmək,
- inşa müsabiqəsi keçirmək,
- debat və müzakirələrdə iştirak.

Məntiqi-riyazi qabiliyyətli öyrəncilər rəqəmlər və kompyuter texnikası ilə daha çox maraqlandıqları üçün aşağıdakı fəaliyyət növlərindən istifadə edilməsi məqsədə uyğundur:

- riyazi oyunlar (şahmat, şaşki və s.) keçirmək;
- elmi nəzəriyyələr əsasında təcrübələr aparmaq (riyazi hesablamaqla);
- məntiqi oyunlar keçirmək;
- məsələlər həll etmək;
- elmi proqramlar üçün “özün düzəlt” dəstlərindən istifadə etmək;
- əlifba və rəqəmlərdən ibarət qaydalar müəyyən etmək;
- analogiyalar tərtib etmək.

İncəsənət qabiliyyətli öyrəncilər informasiyanı şəkil və təsvirlərdən daha tez qəbul etdiklərindən onlar üçün aşağıdakı fəaliyyət növləri daha önəmlidir:

- məktəb və sinif qəzetinə xəbər bülletenləri üçün fotolar çəkmək;
- yeni mövzu ilə bağlı şəkillərlə modellər (məs., Venn Diaqramı, xəritə ) çəkmək;
- coğrafi xəritələr tərtib etmək;
- şeirlərə, hekayələrə illüstrasiyalar, şəkillər çəkmək;
- mövzu ilə əlaqəli sxemlər, diaqramlar hazırlamaq.

Musiqi qabiliyyətli öyrəncilərə uyğun fəaliyyət növləri aşağıdakılardır:

- mövzu ilə bağlı öz şeirlərini yazmaq;
- orijinal şeirlərə musiqi bəstələmək;
- müxtəlif tarixi dövrlərin musiqisinə qulaq asmaq;
- sevdikləri şeirə musiqi bəstələmək;
- mövzu ilə bağlı prezentasiyalarda arxa fona musiqi vermək.

Fiziki qabiliyyətli öyrəncilər daha çox hərəkətli olduqları üçün onlara uyğun öyrənmə çalışmaları aşağıdakılardır:

- rollu oyunlar üçün maska, kostyum və s. hazırlamaq;
- səhnəciklərdə iştirak etmək;
- tamaşalarda səhnələr qurmaq, dekorasiya etmək;
- mövzu ilə bağlı kublardan, leqolardan obyektlər hazırlamaq;
- əllə düzəldilən konstruktor dəstləri ilə tapşırıqlar vermək.

Fərdlərarası öyrəncilər ünsiyyətə çox can atdıqları üçün onlara uyğun fəaliyyət növləri aşağıdakılardır:

- layihələrdə qrup daxilində iştirak etmək;
- faktları cütlərlə öyrənmək;
- mövzu ilə bağlı fərqli insanlardan müsahibə götürmək;
- rollu oyunlarda iştiraka cəlb etmək;
- zəif sinif yoldaşlarını və ya aşağı sinif şagirdlərini öyrətmək.

Fərddaxili öyrəncilər daha çox öz hislərinə, ideyalarına, məqsədlərinə aludə

olduqları üçün onlara uyğun gələn fəaliyyət növləri aşağıdakılardır:

- mövzu ilə bağlı öz təəssüratlarını yazmaq;
- tarixi şəxsiyyətlər barədə esselər yazmaq;
- öz həyatlarına dair ədəbi avtobioqrafiyalar yazmaq;
- öz məqsədlərini yazmaq və ona çatmaq üçün gələcək planlar hazırlamaq;
- kompyuter proqramlarından istifadə etməklə müstəqil tapşırıqlar vermək;
- illik jurnal tərtib etmək.

Naturalist öyrəncilərin marağı daha çox ətraf mühitə olduqları üçün onlara uyğun gələn fəaliyyət növləri aşağıdakılardır:

- sinifdəki gül-çiçəklərə qulluq etmək;
- ətraf mühitlə bağlı müşahidələr aparmaq;
- məktəbdənkənar tədbirlərə (məktəbyanı sahədə ağaclara, güllərə qulluq etmək) cəlb etmək;
- məktəbyanı sahədə iməcilik təşkil etmək.

Bu cür çalışmalardan istifadə olunduqda şagirdlərin fərqli qabiliyyətləri onların maraqlarına uyğun daha da inkişaf etdirilər. Nəticədə isə cəmiyyətimiz üçün faydalı şəxsiyyətlər yetişdirməkdə müəllimlik missiyası daha səmərəli bir şəkildə yerinə yetirilər.

Yuxarıda deyilənləri ümumiləşdirsək, demək olar ki, bütün bunlar bizim məqsədimizdir, elə təhsilimizin əsas məqsədi də, həyati bacarıqlara yiyələnən qabiliyyətli şəxsiyyətlər yetişdirməkdir.

*Rəyçi: prof. İ.Novruzlu*

**İstifadə edilmiş ədəbiyyat**

1) Howard Gardner. “Frames of Mind”:The Theory of Multiple Intelligences. 1983.

2. Howard Gardner. “Intelligences Reframed”. 2000.

3. Thomas Armstrong. “Multiple Intelligences: Eight Ways to Approach Curriculum”. 1994.

4. Thomas Armstrong. “Multiple Intelligences in the Classroom”. 2009.

5. “Brain Based strategies to Reach Every Learner”. Dianne Connell Published by Scholastic Teacher Store. 2010.

6. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”. //Azərbaycan məktəbi, 2013, № 5.

**С.Асадова**

**Индивидуальный подход к развитию способности**

**Резюме**

В статье говорится о теории множественности интеллекта, которая была разработана профессором Гарвардского университета, доктором Ховардом Гарднером. Отмечается важность использования данной методики в классе и даны примеры техники преподавания, связанные с 8-ми интеллектами.

**S.Asadova**

**Individual approach to intelligences**

**Summary**

In the article it is spoken about the Multiple Intelligence Theory which was developed by Dr. Howard Gardner, professor of education at Harvard University. The importance of implementing multiple intelligence in the classroom is noted and teaching activities that connect with 8 Intelligences are given as an example.



**<u>İnnovasiyalar</u>**

# ОБ ИННОВАЦИОННОЙ ПАРАДИГМЕ НАЦИОНАЛЬНОЙ ИДЕИ

**Лачин Гасанова,**
**доцент АГПУ**

***Açar sözlər:*** *azərbaycanlıların milli yeniliyi, etnomədəniyyət.*

***Ключевые слова:*** *национальная идентичность азербайджанцев, этнокультура.*

***Key words:*** *azerbaijani national identity, ethno culture.*

Современная национальная идея в Азербайджане формулируется как синтез и единство всех проживающих на территории Азербайджана этносов.

Именно поэтому подчеркивается роль и тюркского, и иранского, и арабского культурного строя. Ассимиляция в единый народ и определяет национальную идентичность азербайджанцев. Именно поэтому столь актуально, сегодня изучение художественной культуры в высших учебных заведениях во всех ее слагаемых. История Азербайджана дает богатый материал для понимания генезиса и эволюции азербайджанской художественной культуры, что необходимо для правильного воспитания молодого поколения.

Подчеркнем, что формулирование национальной идеи органично соответствует современным представлениям этнокультуры в гуманитарной науке. А.Я.Флиер пишет об этнических ценностях: "Последние представляют собой совокупность культурных традиций этноса, которые выделяются самим этносом в качестве наиболее специфичных, маркирующих его историческое и культурное своеобразие черт. При этом реальное происхождение культурных форм, интерпретируемых как этнические ценности, не имеет принципиального значения; оно может быть как автохтонным, так и иноэтничным, что не влияет на степень вероятности включения их в систему этнических ценностей" (75, с. 389).

Этноисторическое происхождение артефактов имеет функциональный импульс. Изначально заложенный посыл может приобретать со временем разную степень выявленности. Но ядро, корень, этномаркер сохраняется. В этом смысле универсальные закономерности музыкального структурирования объясняют, в определенной степени, параллелизм, совпадения, культурное родство.

Новый уровень функционирования образования, безусловно, связывается с национальной картиной мира, ибо национальная идея концентрирует в себе представления о культуре народа.

Вместе с тем, подчеркнем, что в свете вышеизложенного, требует дифференциации такие понятия как этническая культура, народная культура, национальная культура. В чем инновационный смысл такого рода дифференциации в рамках этнологического освоения в высших учебных заведениях? Прежде всего, подчеркнем важный и очевидный факт: для инноваций необходима исходная база. Этнокультура, традиционная, народная культура определяет базовые законы существования, жизнедеятельности. Это и обычаи, обряды, уклад жизни, воспитание, миропредставление, верование, фольклор и многое другое. Иными словами, у студента должно быть четкое понятие о материале, на базе кото-

рого осуществляются педагогические инновации. Парадигма народной культуры изучается в высших учебных заведениях в определенном "ключе" - как основа инноваций. Только в этом случае национальная культура, как и сложившаяся ментальная структура раскрывает те свои параметры, которые открыты для инноваций.

При этом особо подчеркнем, что восприятие иного, как правило, в процессе истории эволюции художественного творчества, представляло собой переработку, порой активную, в контексте своей культуры. Так рождались артефакты, приобретающие значение традиций национальной культуры.

В преподавании региональных национальных культур превалирует их понимание как "механической", статичной суммы. Вместе с тем, раскрытие связей этих культур покажет их слитность, этнокультурную общность, художественную монолитность. В этом смысле лекционные курсы требуют обновление позиций преподавательской практики, преобразования в понимании обширного материала, ибо восприятие всей этнокультурной целостности сложно для восприятия студентов.

Поэтому фиксация конгломерата больших культурных общностей, включающих разные страны и народы, которые обладают, определенной общностью художественного самовыражения облегчает преподавание этноисторических параметров.

Безусловно, четко следует очерчивать диапазон и конкретику восточной культуры. Ведь азербайджанская художественная культура вмещает в себя множество цивилизационных слагаемых Востока. Однако, каких именно? Этот важный вопрос пока не показан в курсах в музыкальных высших учебных заведениях. Между тем, молодое поколение музыкантов должно быть не только информировано о взаимосвязях азербайджанской художественной культуры, которые присутствовали в истории Азербайджана на протяжении многих веков. Необходимость ориентироваться в сложных взаимосвязях восточной культуры создает новое видение, новые ракурсы, новое миропредставление у учащихся.

Сегодня, когда столь "модны" рассуждения о европеизации, подражании Западу стоит формировать у студентов верное представление об азербайджанской культуре как "жемчужине" восточной культуры. Достаточно верно повернуть ракурс изучения предмета, по-новому, на инновационном уровне показать реалии азербайджанской художественной культуры как восточной. Тогда закономерно возникнут такие характеристики, которые подтвердят глубину, древность азербайджанской культуры, ее колоссальные перспективы в будущем, ее огромный культурный потенциал.

Достаточно обратиться к антиномии Запад-Восток, сформировавшейся на протяжении последних нескольких веков, отражающих известные и очень спорные постулаты европоцентризма. "В науке сложились стереотипы, в которых динамизму первых противостоит статичность вторых, "молодости" первых – "старость" вторых, ориентация на свободу – ориентация на деспотизм, понятийной культуре – эмоциональная, историческая и посторонняя доминанта мышления – неисторическая и потустороннее, материалистичность – духовность" (75, с. 15).

Однако даже в этих весьма тенденционных сравнениях, мы находим качества весьма высокого свойства. Например, древность, духовность, эмоциональность. Представления об Азербайджане как азиатской, восточной культуре должна кануть в Лету. Во-пер-

вых, на территории Азербайджана с древнейших времен существовали развитые государства. Сила, мощь всех государственных объединений, куда входил и Азербайджан отразились в высокой степени развитости цивилизаций. Во-вторых, несколько веков Азербайджан находится в культурном пространстве Европы и мировосприятие азербайджанцев органично синтезирует в себе и восточные, и западные ценностные параметры. Безусловно, масштабы воздействия арабо-мусульманской культуры широки, глубина влияния очевидна. Однако, сегодня гармония человека Востока, органично покоящаяся на трех началах – Небо, Земля, Человек, пронизана динамическими реалиями современности. Процессы аккультурации приобретают прогрессивный и поступательный характер.

В высших учебных заведениях изучается история народной музыки. Но если рассмотреть креативный подтекст этой педагогической проблемы, напрашивается как бы “зеркальное” ее понимание. А именно – изучение народной музыки как источника исторической информации.

Так, например, американские этнологи разработали теорию культурных ареалов, где главными объединяющими характеристиками служили природная среда, материальная культура, некоторые черты этнокультуры.

Мы подчеркнем идею Уисслера об одинаковом возрасте культурных элементов, происходящих из одной территории. Кроме того, нас заинтересовали также выработанные Уисслером “некоторые шаблоны диффузии: распространение элементов культуры расходящимися кругами, из которого следовало, что чем дальше от центра найден элемент (чем шире круг), тем больше возраст его существования. Эта концепция стимулировала составление систематических описаний распространения культурных черт”.

Подчеркнем, что взаимосвязи Азербайджана со странами Евразии, общение с европейской культурой никогда не были деструктивными.

Вспомним Э.Сепира, который в конечном результате выдвинул понятие символизма в этнолингвистике. Это означает высокую степень значимости кодификации языка (в данном случае – музыкального). Мы, безусловно, далеки от известной “радикализации” идей Сепира, однако, считаем следующую цитату вполне уместной: “член данного общества не только кодифицируем чувственно воспринимаемую действительность, при помощи использования языка и характерного для его культуры поведения, соотнесенного с образцами, но он только тогда в состоянии понять действительность, когда она представлена ему посредством этого кода”.

Все территориальные зоны Азербайджана связаны единым культурным пространством. Изучение музыкального искусства каждой из них подчеркивает целостность этнокультуры, духовного наследия, менталитета. Мы предлагаем, наряду с привлечением конкретного зонального материала, выделять концепционные слагаемые национальной идеи. Таким образом, можно будет синтезировать изучение в высших учебных заведениях как всего комплекса музыкального материала, так и понимания инновационных задач регионального понимания собственной культуры. Сосредоточимся на теоретическом аспекте. Сразу подчеркнем, что любая новая в преподавании народной музыки идея опирается на фундаментальные свойства фольклора – коллективность и устность. Опираясь на них, мы предлагаем следующую инновационную, я бы сказала, реконструкцию изуче-

ния народной музыки.

Эстетические и этические нормы, духовное соответствие формировали особый язык народной музыкальной культуры. Выразительные средства, особенности структуры были тесно связаны с этногенетическими основаниями. Критерии оценки исходили от особенностей восприятия и воспроизведения.

I. Структурный аспект опирается на несколько уровней:

1. морфологический,
2. синтаксический,
3. функциональный

II. Комплексный аспект подразумевает изучение этнокультуры, материальной культуры, бытовой, а также археологию и этнографию.

III. Содержательный аспект необходим в понимании текстов, отражающих особенности этнокультуры Азербайджана.

IV. Зональный аспект предлагает самостоятельное составление музыкальной карты Азербайджана. Процесс картографирования должен осуществляться студентами на основе изученного ими материала.

Необходимо изучение истории, культуры, традиций, этнокультуры музыки отдельных зон Азербайджана, городов Азербайджана. Ибо каждый регион нашей страны отличается уникальностью и богатством культуры.

Здесь еще раз подчеркнем: чтобы понять смысл современных процессов в азербайджанской педагогике, управлять ими возможно лишь в результате изучения тех инновационных процессов, которые необходимы сегодня в педагогической практике. Эти процессы должны базироваться на национальных ценностях. Только осознание этого паритета обеспечит успех.

*Рецензент: проф. В.Халилов*

**İstifadə edilmiş ədəbiyyat**


1. “Культурология. XX век” Энциклопедия. Москва, 1988.
2. Васильева Е. Инновационность в обучении будущего специалиста. Стандарты и мониторинг в образовании: науч.-информ. журн. М., 2004, № 2.
3. Кепгерлинская Т. Музыкальная педагогика – как интеграция науки и искусства. Баку, 2004.


**L.Həsənova**

**Milli ideyanın innovasiya paradiqması haqqında**

**Xülasə**

Məqalədə müasir humanitar pedaqogikada milli ideyanın yerinin müəyyənləşdirilməsinin zəruriliyi fikri irəli sürülür. Milli ideyanın formullaşdırılması humanitar pedaqogikanın müasir innovasiya reallıqlarına üzvi şəkildə uyğun gəlir. Məqalədə, həmçinin Azərbaycanın ayrı-ayrı regionlarının etnologiyasının, etnoqrafiyasının musiqi mədəniyyəti ilə bağlılığının öyrənilməsi zəruriliyi qeyd olunur ki, bu da mədəni irsin dərkinə xidmət edir.

**L.Hasanova**

**On the innovation paradigm of the national idea**

**Summary**

The article suggests that it is necessary to determine the place the national idea in the present-day humanitarian pedagogis. The formation of the national idea is close integration with the innovation realities of the humanitarian pedagogics. It also suggests that it is necessary to study the interrelation of the music culture with the ethnology and ethnography of different regions of Azerbaijan. This, in its turn, serves the comprehension of the cultural heritage.



# TƏHSİLDƏ İNNOVATİV FƏALİYYƏTİN TƏKMİLLƏŞDİRİLMƏSİ

**İntiqam Cəbrayılov,**
**pedaqogika üzrə elmlər doktoru, professor,**
**ARTPİ-nin təhsil nəzəriyyəsi şöbəsinin müdiri**

***Açar sözlər***: *təhsil, sistem, innovasiya, innovativ fəaliyyət, konsepsiya, proqram, inkişaf, strategiya, məzmun, səriştəli yanaşma, keyfiyyət.*

***Ключевые слова***: *образования,систем, инновация, инновационного дейтельности, концепция, программа, развития,стратегия, содержание, компетентный подход, качество.*

***Key words:*** *education, systems, innovation, innovation activities, consept, program, development, strategy, table of contents, competent approach, quality.*

Təhsildə innovasiya fəaliyyəti ilə bağlı son illərdə bir sıra elmi-nəzəri, pedaqoji, metodik əsərlər çap olunmuşdur. S.S.Xəlilov təhsil, təlim və tərbiyənin, o cümlədən orta təhsilin məqsədi və məzmunu ilə bağlı araşdırmalar apararaq şəxsiyyətin formalaşdırılmasına xüsusi əhəmiyyət vermişdir. Ə.Ə.Ağayev yeni təlim metod və texnologiyalarından istifadənin nəzəri və təcrübi məsələlərini, A.O.Mehrabov, A.N.Abbasov və M.C.Mahmudov təhsildə konseptual kompetensiyaların formalaşdırılması və ilkin pedaqoji kadr hazırlığının müasir problemlərini, Ə.M.Abbasov yeni fənn kurikulumlarının tətbiqi, səciyyəvi xüsusiyyətləri, İ.H. Cəbrayılov isə şəxsiyyətyönümlü təhsilin məzmun məsələləri ilə bağlı araşdırmalar aparmışlar.

A.V.Xutorski pedaqoji innovasiyanın metodologiyası, nəzəri və praktik problemləri, peşə səriştəliliyinin tipologiyasını, V.D.Şadrikov mütəxəssis hazırlığında innovasiyaların tətbiqi, səriştəli yanaşma məsələlərini, M.V. Boquslavski isə təhsilin nəzəri məzmununun formalaşdırılmasında innovativ potensialın rolu və əhəmiyyətini tədqiq etmişlər.

Təhsildə innovativ fəaliyyət eyni zamanda dünya ölkələri ilə, müxtəlif təhsil müəssisələri ilə, konkret təhsilverən, yaxud təhsilalanlar arasında əməkdaşlığın tədricən genişləndirilməsi və inkişaf etdirilməsidir. Təhsil müəssisələri arasında beynəlxalq əlaqələrin möhkəmləndirilməsinə yönəldilmiş beynəlxalq layihələrin hazırlanması, beynəlxalq konfransların, forumların və simpoziumların keçirilməsi bu baxımdan mühüm əhəmiyyət kəsb edir (6).

İnnovativ fəaliyyət təhsil sisteminə aid bütün vəzifələrin həyata keçirilməsinə, ayrı-ayrı məsələlərin məqsədəuyğun, səmərəli həllinə və keyfiyyətin təminatına ciddi təsir göstərir. İnnovativ fəaliyyət əslində təhsil fəaliyyətinin inkişaf formasıdır. Təhsil sistemində innovativ fəaliyyət, əsasən, aşağıdakı məsələləri əhatə edir:

- pedaqoji sistemdə zəruri dəyişikliklərə, yeniliklərə tələbatların öyrənilməsi, üzə çıxarılması;
- təhsilin keyfiyyətinin yüksəldilməsinə kömək göstərə bilən mövcud metodik işləmələrin dəyərləndirilərək üzə çıxarılması;
- arzuolunan gələcək pedaqoji sistemlərin layihələndirilməsi və doğru istiqamətlənmiş

fəaliyyət.

Qeyd olunan məsələlərə diqqətli yanaşma və onların keyfiyyətli həlli nəticəsində təhsil müəssisələrinin və bütövlükdə təhsil sisteminin obyektiv tələbatları ödənilər və imkanlar reallaşar. Bu baxımdan, aşağıdakı müddəalara xüsusi əhəmiyyət verilməsi vacibdir:

1) problemlərə həssaslıq (dəyişikliklərə zəruri ehtiyac və tələbat); 2) inkişafın imkanlarını müəyyənləşdirmək və diqqətdə saxlamaq; 3) tətbiq etmək, həyata keçirmək gücü, potensialı; 4) təhsil müəssisəsinin kreativliyi-yaradıcı yanaşma.

Problemlərə həssas yanaşma təhsil müəssisəsinin xüsusiyyətlərini, zəruri ehtiyaclarını, pedaqoji sistemin tələbatlarını müəyyənləşdirməyə və onların əhəmiyyətini qiymətləndirməyə imkan yaradır. İnkişaf imkanlarının müəyyənləşdirilməsi təhsil fəaliyyətinin effektivliyinin yüksəldilməsi və mövcud potensialın düzgün qiymətləndrilməsi baxımından əhəmiyyətlidir. Təhsil müəssisəsinin mövcud imkanlarını həyata keçirmək potensialı dedikdə, ilk növbədə resurslardan minumum səviyyədə istifadə olunmaqla maksimum faydalı nəticələrin qazanılması nəzərdə tutulur.

Təcrübə və araşdırmalar göstərir ki, müasir dövrdə təhsilin keyfiyyətinin artırılması problemi ilə bərabər innovativ fəaliyyətin keyfiyyətinin yüksəldilməsi diqqətimizi xüsusilə cəlb edir. Əslində innovativ fəaliyyətin keyfiyyətinin artırılması aktuallıq baxımından daha çox əhəmiyyətlidir. Çünki təhsilin keyfiyyətinin yüksəldilməsi birbaşa təhsil fəaliyyətinin innovativliyi ilə bağlıdır (9).

Bəzi təhsil müəssisələrində innovativ fəaliyyətin ardıcıl, sistemli olmaması aktual problemlərin həllində müəyyən çətinliklər yaradır. Ona görə də bu məsələlərə ciddi diqqət yetirilməsi vacibdir. Təcrübə və araşdırmaların nəticəsi olaraq innovativ təhsil fəaliyyətinin təkmilləşdirilməsinin başlıca istiqamətlərini aşağıdakı şəkildə əsaslandıra bilərik:

- pedaqoji kollektivdə təhsil fəaliyyəti sahəsində keyfiyyət dəyişikliklərinin dərk olunması zəruriliyinin formalaşdırılması;
- innovativ fəaliyyət texnologiyalarının təkmilləşdirilməsi;
- pedaqoji kollektivlərin məlumatlılıq (informasiya toplamaq, informasiyalılıq) səviyyəsinin yüksəldilməsi;
- innovativ fəaliyyət zamanı keyfiyyətin qiymətləndirilməsi metodlarının təkmilləşdirilməsi;
- təhsil müəssisəsi rəhbərlərinin, müəllimlərin, ictimaiyyətin (o cümlədən valideynlərin) innovativ fəaliyyətlə bağlı səriştəliliklərinin yüksəldilməsi və bu istiqamətdə əlbir işin genişləndirilməsi.

Elmi-pedaqoji araşdırmalar göstərir ki, təhsilin keyfiyyətinin yüksəldilməsi, təhsil müəssisələrinin innovativ fəaliyyətinin inkişafı yeni konsepsiyaya əsaslanmaqla təmin oluna bilər. Bu isə bir neçə konsepsiyanın sintezi əsasında formalaşmış nəzəri ideyalar məcmusudur. Həmin nəzəriyyələrdən biri K. Levinin “donuşluğun yumşalması” (yaxud “donun əriməsi”) konsepsiyasıdır. Bu konsepsiya idarə və müəssisələrdə, o cümlədən təhsil müəssisələrindəki iki tərəfin-iki əsas qüvvənin təklifləri əsasında formalaşmışdır. Tərəflərdən biri dəyişikliklərin təşəbbüskarı, digəri isə məhdudlaşdırıcısı mövqeyində çıxış edir. Hər iki tərəf müəyyən balans yaratsa da tədricən yeniliyin təşəbbüskarları öz mövqelərini möhkəmləndirməklə tədricən öz istəklərinə nail ola bilirlər (10, 11).

K.Levinin fikrincə, dəyişikliklər prosesi, əsasən, üç mərhələdən ibarətdir: donuşluq, hərəkət və yumşalma (ərimə). Donuşluq mərhələsində təşəbbüskar qüvvələr rəhbərlik qarşısında yeniliklərin həyata keçirilməsi zəruriliyi ilə bağlı məsələ qaldırır, həmin məsələlərin mahiyyətinin kollektiv daxilində dərk olunmasına çalışır. Hərəkət mərhələsində yeni qaydalar, məqsədəçatma texnologiya-

ları mənimsənilir, fəaliyyətin prosedur forma və priyomları öyrənilir. Yumşalma (ərimə) mərhələsində isə nəzərdə tutulmuş təcrübənin reallaşdırılmasına istiqamətlənmiş müvafiq tədbirlər həyata keçirilir. Bu mərhələnin nəticələri kollektiv üçün faydalı olmalıdır.

İkinci nəzəriyyə təşkilati inkişaf nəzəriyyəsi adlanır. Bu nəzəriyyə XX yüzilliyin 60-cı illərində formalaşmış və daha çox menecment sahəsinə istiqamətlənmişdi. İnkişaf konsepsiyasının başlıca xüsusiyyəti müəssisədə, ilk növbədə struktur dəyişikliklərinin aparılması, işin məzmununa yeniliklərin gətirilməsi və nəticə etibarilə yaranan problemlərin həllinin asanlaşdırılması, işin keyfiyyətinin yüksəldilməsidir. Bu konsepsiyaya görə kollektivdə münasibətlərin təkmilləşdirilməsi, yeni məzmun daşıması, davranışa və işin nəticələrinə xüsusi əhəmiyyət verilməsi vacibdir. Təşkilati inkişaf konsepsiyası müəssisədə özünüinkişaf mərhələsinə çatmağa və bu prosesin davamlı olmasına istiqamətlənmişdir. Özünüinkişaf mərhələsinə çatan müəssisə qarşısına yeni məqsədlər qoyur. Beləliklə, kollektiv üzvləri arasında əməkdaşlıq daha da güclənir, onlar dəyişiklikləri diqqətlə izləyir və idarəetmədə fəal iştirak edirlər.

Bu konsepsiyanın tərəfdarları təşkilati inkişaf prosesinin beş ardıcıl mərhələdən ibarət olduğunu göstərirlər:
1) müəssisə üçün yaranmış problemlərin müəyyənləşdirilməsi və qiymətləndirilməsi; 2) qabaqcadan diaqnozun qoyulması; 3) birgə fəaliyyətin planlaşdırılması; 4) fəaliyyətin yerinə yetirilməsi; 5) aparılmış dəyişikliklərin nəticələrinin qiymətləndirilməsi.

Problemin həlli ilə bağlı yaranmış digər konsepsiyalardan biri sistemli analiz konsepsiyasıdır (14). XX yüzillikdə formalaşmış bu konsepsiya problemlərin sistemli həlli metodologiyasına əsaslanır. Bu baxımdan, ilk növbədə aşağıdakı məsələlərə diqqət yetirilir: 1) problemlərin müəyyənləşdirilməsi; 2) aktual problemlərin qiymətləndirilməsi; 3)qiymətləndirmə kriteriyalarının müəyyən olunması; 4) mövcud sistemin təhlili, problemlərin həlli imkanlarının müəyyənləşdirilməsi; 5) müxtəlif həll variantlarının işlənib hazırlanması; 6) qərarın həyata keçirilməsi; 7) nəticələrin qiymətləndirilməsi. Qeyd olunanları əsas götürərək təhsil müəssisələrində innovativ sistemin modernləşdirilməsi zamanı aşağıdakı məsələlərin həlli nəzərdə tutulur:

1) təhsil müəssisələrində innovativ fəaliyyətlə bağlı mövcud vəziyyətin öyrənilməsi və təhlili; 2) innovativ fəaliyyətin modernləşdirilmiş sisteminin layihələndirilməsi; 3) innovativ fəaliyyətin yeni sisteminin tətbiqi ilə bağlı hazırlıq işlərinin görülməsi; 4) təhsil müəssisələrinin yeni innovativ fəaliyyət modelinə uyğun təhlil edilməsi; 5) alınmış nəticələrin (nailiyyətlər və çatışmazlıqlar) müzakirəsi, çatışmazlıqların səbəblərinin müəyyənləşdirilməsi; 6) problem baxımından təhlil üsulları və nəticələrin korrektə olunması; 7) arzuolunan təhsil sisteminin layihələndirilməsi və müvafiq təhlillərin aparılması; 8) arzuolunan yeni təhsil sisteminə keçid strategiyasının işlənib hazırlanması, ardıcıl olaraq təhlillərin, korrektə işlərinin aparılması və həyata keçirilməsi.

Təcrübə göstərir ki, innovativ fəaliyyətin sistemli şəkildə həyata keçirilməsi məqsədi ilə bu konsepsiyanın tətbiqi əhəmiyyətlidir. Belə ki, bu konsepsiyaya görə təhsil sisteminin bütövlükdə struktur, məzmun və idarəetmə məsələlərinə yeni baxış tələb olunur. İnnovativ fəaliyyət prosesində təhsil işçiləri ilə bərabər geniş ictimaiyyət, o cümlədən valideynlərin iştirakı üçün əlverişli zəmin yaradılır.

Qeyd etmək lazımdır ki, təhsildəki innovasiyalar intellektual və inteqrativ fəaliyyət hesab olunan elmi-tədqiqat fəaliyyəti ilə əsaslı şəkildə bağlıdır. Elmi-tədqiqat fəaliyyəti sosial-iqtisadi, humanitar və digər problemlərin həlli məqsədi ilə yeni biliklərin qazanılması və təbiqinə istiqamətlənir. Bu fəaliyyət aşağıdakı istiqamətləri əhatə edir:

- fundamental (nəzəri, eksperimental) elmi fəaliyyət. Bu fəaliyyət əsas etibarilə insanın yaranması, formalaşması və inkişafı haqqında yeni biliklərin əldə olunmasına istiqamətlənir;

- tətbiqi elmi tədqiqatlar. Bu fəaliyyət konkret vəzifələrin həlli və praktik məqsədlərlə bağlı nailiyyətlər üçün yeni biliklərin tətbiqinə istiqamətlənir;

- elmi tədqiqatların aparılması nəticəsində əldə olunmuş baza bilikləri, yaxud praktik təcrübə əsasında eksperimental işləmələr.

Qeyd olunan hər bir istiqamət üzrə aparılan tədqiqatların nəticələrinin inteqrativ bilik və səriştələrə çevrilməsi təhsildə innovativ fəaliyyətin davamlı olmasına zəmin yaradır. Elmi-pedaqoji ədəbiyyatda inteqrasiya bir prinsip kimi qəbul olunmuşdur. Bu prinsipə görə təlim prosesinin bütün komponentləri, sistemin bütün elementləri və sistemlərin özləri arasında qarşılıqlı əlaqələr mövcuddur. İnteqrasiya prinsipi təlimin məqsədi, forması, məzmunu və metodlarının müəyyənləşdirilməsində başlıca rol oynayır. Pedaqoji prosesin bu və ya digər komponentinə inteqrativ yanaşma inteqrasiya prinsipinin tətbiqini nəzərdə tutur. İnteqrativ yanaşma pedaqoji prosesin bütövlüyünü və sistemliliyini təmin edir. Təhsil prosesində elm və təhsilin inteqrasiyası elmi biliklər sisteminin şagirdlər tərəfindən mənimsənilməsi, idrak bacarıqları, vərdişləri, dünyagörüşünün formalaşdırılması, şəxsi keyfiyyətlərin, yaradıcılıq qabiliyyətlərinin inkişafı prosesidir. Təcrübə göstərir ki, təhsil prosesində elm və təhsilin inteqrasiyası aşağıdakı məsələlərin reallaşmasına şərait yaradır:

1) təhsilalanların yaradıcılıq qabiliyyətlərinin üzə çıxarılması və tətbiqinə; 2) elmi layihələndirmə metodologiyasının öyrənilməsinə və tədrisinə; 3) müəllimlik və ya elmi fəaliyyətə hazır olan istedadlı təhsilalanların seçiminə; 4) gənclərin elmi fəaliyyətdə iştirakına, bu baxımdan kütləviliyə və keyfiyyətin daha da yüksəlməsinə; 5) Azərbaycan təhsil sisteminin, milli elmlərin inkişafına, ənənələrin qorunub saxlanmasına; 6) təhsil prosesində elmi fəaliyyətin rolunun gücləndirilməsinə; 7) təhsilalanların peşə meyillərinin inkişafına, seçdiyi ixtisas üzrə səriştəli kadr kimi formalaşmasına; 8) yüksəkixtisaslı mütəxəssis hazırlığında keyfiyyətin təminatında varisliyə diqqət yetirilməsinə, sistemli yanaşmaya xüsusi əhəmiyyət verilməsinə; 9) təhsilalanların qloballaşan cəmiyyətin tələblərini, milli və bəşəri dəyərləri vəhdətdə nəzərə alan vətəndaş şəxsiyyət kimi formalaşmasına.

Qeyd etmək lazımdır ki, müasir dövrdə qloballaşma prosesləri cəmiyyətin digər sahələri ilə yanaşı təhsil sahəsinə də təsir göstərir. Təhsil sahəsində qloballaşma müxtəlif ölkələrin təhsil sistemlərinin arasındakı kəskin fərqlərin tədricən aradan qaldırılmasında, məzmun və təşkilati məsələlərin inteqrasiyasında, beynəlxalq təhsil məkanının formalaşması və tədricən inkişafında özünü büruzə verir. Qloballaşma şəxsiyyətin həyat mövqeyinin formalaşdırılmasında, öz yaradıcı qabiliyyətlərinin reallaşdırılmasında, istədiyi ölkədə, bölgədə özü üçün sərbəst yaşayış yerinin seçimində mühüm əhəmiyyət kəsb edir.

Bu gün ölkəmizdə təhsilin normativ-hüquqi bazası xeyli təkmilləşdirilmiş, maddi-texniki təminat, informasiya-kommunikasiya texnologiyalarının tətbiqi ilə bağlı mühüm əhəmiyyət kəsb edən geniş tədbirlər həyata keçirilmişdir. Lakin etiraf etməliyik ki, müasir dövrdə Azərbaycan təhsilinin modernləşdirilməsinə xidmət edən aşağıdakı problemlərə xüsusi diqqət yetirilməsi vacibdir:

1) təhsil sisteminin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi istiqamətində yeni addımların atılması (insan kapitalı inkişafının sürətləndirilməsi);

2) ümumi təhsilin keyfiyyət göstəricilərinin Avropa standartlarına uyğunlaşdırılması.

Bu müddəalar bir-biri ilə sıx bağlıdır.

Bu müddəaların həyata keçirilməsi təhsilin keyfiyyətinin yüksəldilməsi və nəticə etibarilə yeni tipli şəxsiyyətin formalaşmasına, insan kapitalının inkişafına gətirib çıxarır. Təcrübə və elmi araşdırmalar göstərir ki, təhsilin keyfiyyətinin artırılması bir sıra amillərlə bağlıdır. Aşağıda qeyd etdiyimiz həmin amillər innovativ fəaliyyət baxımından mühüm əhəmiyyət kəsb edir:

1) təhsili idarəetmə sisteminin yenidən qurulması; 2) idarəetmə ilə bağlı insan resurslarının inkişaf etdirilməsi; 3) müəllim peşəsinin nüfuzunun yüksəldilməsi. Bu baxımdan, Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında qeyd olunduğu kimi, bu gün dünya ölkələri sırasında özünün keyfiyyət göstəricilərinə və əhatə dairəsinə görə aparıcı mövqeyi olan müasir təhsil sisteminin formalaşdırılması vacibdir. Belə bir təhsil sisteminin formalaşdırılması üçün beş strateji istiqamətdə müvafiq tədbirlərin həyata keçirilməsi məqsədəuyğundur:

1) səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsil məzmununun yaradılması;

2) səriştəli təhsilverənlərin formalaşdırılması;

3) təhsildə nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizminin yaradılması;

4) ömür boyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması;

5) iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartları ilə eyni səviyyəyə uyğun təhsil sisteminin maliyyələşdirilməsi modelinin yaradılması.

Hər bir strateji istiqamətin özünün əhatə etdiyi məsələlər, konkret hədəfləri vardır. Birinci strateji istiqamətin əhatə etdiyi hədəflər bunlardır:

1) məktəbəqədər, ümumi, ilk peşə-ixtisas, orta ixtisas və ali ixtisas üzrə bütün pillə və səviyyələrin təhsil proqramlarının (kurikulumların) inkişafı.

İkinci strateji istiqamətin əhatə etdiyi hədəflər aşağıdakılardır:

1) təhsilverənlərin peşəkarlığının yüksəldilməsi;

2) təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni sistemlərin qurulması;

3) təhsilalanların istedadının aşkar olunması və inkişafı ilə bağlı, eyni zamanda xüsusi qayğıya ehtiyacı olanlar üçün inklüziv təlim metodologiyasının yaradılması.

Üçüncü strateji istiqamətin hədəfləri isə aşağıdakı məsələlərdir:

1) təhsil sistemində tənzimləmə və idarəetmənin qabaqcıl beynəlxalq təcrübə əsasında müasirləşdirilməsi;

2) təhsil müəssisələrində nəticəyönlü və şəffaf idarəetmə modelinin yaradılması;

3) təhsilin keyfiyyətinin təminatı və idarə- olunması üzrə yeni məlumat və hesabat sistemlərinin yaradılması.

Dördüncü strateji istiqamətin hədəfləri aşağıdakı məsələlərdir:

1) təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyalarına əsaslanan təlim metodologiyasına uyğun infrastrukturun yaradılması;

2) təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılması;

3) distant təhsil, istedadlı və xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün təhsil və inkişaf, yaşlıların təhsili, peşə-ixtisas və təhsil məsələləri üzrə məsləhət xidmətləri göstərən regional universal mərkəzlərin, peşə tədris mərkəzlərinin, kampusların yaradılması.

Beşinci strateji istiqamət aşağıdakı vacib hədəfləri əhatə edir:

1) müxtəlif mənbələrdən istifadə etməklə təhsili maliyyələşdirmə mexanizminin təkmilləşdirilməsi;

2) təhsil müəssisələrinin adambaşına maliyyələşdirilməsinin tətbiqi, ödənişli təhsil xidmətlərinin göstərilməsinin dəstəklənməsi;

3) Təhsilin İnkişafı Fondunun yaradılması, digər təşkilatlarla əlaqələrin inkişaf etdirilməsi, daha da möhkəmləndirilməsi.

Araşdırmalar göstərir ki, təhsilin inişafına xidmət edən innovativ fəaliyyətin daim təkmilləşdirilməsi, dövrün tələbləri, elmi-pedaqoji baxımdan ardıcıl və sistemli olaraq yeniləşdirilməsi zəruridir. Məlumdur ki, innovativ fəaliyyətin özü elə yeniliklərin tətbiqi ilə müşayiət olunan fəaliyyətdir. Lakin bu fəaliyyət prosesində də yeniliklər tətbiq olunarkən elmi-pedaqoji tələblər nəzərə alınmalıdır. Bu baxımdan müvafiq inkişaf proqramlarının hazırlanması və onun fəaliyyət modelləri kimi qəbul edilməsi məqsədəuyğundur.

*Rəyçi: prof. Ə.Ağayev*

**İstifadə edilmiş ədəbiyyat**


1. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası". //Azərbaycan məktəbi, 2013, № 5.
2. Abbasov Ə. Kurikulum islahatının əsas istiqamətləri.// Azərbaycan məktəbi, 2011, № 4.
3. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirlik. Bakı: Adiloğlu, 2006.
4. Əlizadə H. Milli təhsil strategiyası ilə məktəbə doğru. Azərbaycan müəllimi, 2014, 17 yanvar.
5. Алмазова Н., Попова Н. Теоретические и прикладные аспекты вузовского инновационного процесса ( на примере дисциплины иностранный язык). // Инновации в образование, 2003, № 4 .
6. Богуславский М. Инновационный потенциал разработки теории содержания образования и образователъных технологий ( в отечественной педагогике второй половины XX века). М., 2008.
7. Виткина М. Проблемы и перспективы развития образования в области реставрации и сохранения кулътурного наследия, Качество инновации образование, (ежемесячный научно-практический журнал). №11, 2013.
8. Иванова Л. Инновационные условия развития профессионалъной компетентности учителя // Инновации в образование, 2003, №4 .
9. Хуторской А. Педагогическая инноватика: методология, теория, практика. М.: Изд-во УНЦ ДО, 2005.


**И.Джабраилов**

**Особенности усовершенствования инновационной деятельности в образовании**

**Резюме**

Статья уточняет значимость инновационной деятельности в условиях модернизации образования. Здесь анализируются инновационные научные и теоретические вопросы, связанные с инновационной деятельностью, а также положения, содержащиеся в государственных документах. В данной статье, обобщая существующий опыт и научные исследования обосновывается влияние инновационной деятельности на развитие и повышение качества образования. Отмечается важность систематичного усовершенствования технологий инновационной деятельности.

**I. Jabrayilov**

**Improving features of innovative activity in education**

**Summary**

The article clarifies the nature of innovative activity in terms of modernization of education. Scientific and theoretical issues, the provisions contained in the documents related to the innovative activity are analyzed in this article. The article summarizes existing experience, research results and substantiates the impact of innovative activity on development of education and quality improvement. It is noted that it is important to systematically improve the innovative activity technologies.

***Bəxtiyar Vahabzadə - 90***



# O HƏM DƏ BÖYÜK PEDAQOQ İDİ

**Buludxan Xəlilov,**
***filologiya üzrə elmlər doktoru, professor***

Azərbaycan ədəbiyyatı tarixinin xüsusi mövqeyə malik görkəmli simalarından olan Bəxtiyar Vahabzadənin pedaqoji görüşləri də tədqiqat obyekti olmuşdur. O, həm müəllimlərinə böyük hörmətlə yanaşmış, həm də öz biliyini tələbələrə verməkdə qüvvəsini əsirgəməmişdir. O, Azərbaycan ədəbiyyatının yaşlı nümayəndələrinə də öz müəllimi kimi baxardı. Bəxtiyar Vahabzadənin özünü borclu saydığı adamlardan biri də ustad şairimiz Səməd Vurğundur. Böyük Vətən müharibəsi illərində ədəbiyyata gəlmiş onlarca gənc şairin püxtələşməsində, yetişməsində Səməd Vurğunun böyük rolu olmuşdur. Səməd Vurğun Bəxtiyar Vahabzadənin yaradıcılığında öz fikir və ideyaları ilə bir mayak rolunu oynamışdır. Bu da bir alın yazısıdır ki, Bəxtiyar Vahabzadə “Səməd Vurğunun poeziyası” mövzusunda dissertasiya yazmışdır. Bəxtiyar Vahabzadə bununla Səməd Vurğundan sənətin sirlərini öyrənmiş və elmi dərəcə almışdır. O, ali məktəbdə uzun müddət dərs demiş (Azərbaycan Dövlət Universitetində - indiki Bakı Dövlət Universitetində), nüfuzlu müəllim kimi tələbələri tərəfindən sevilmişdir. Çox yaxşı bir nümunədir ki, Bəxtiyar Vahabzadə onun taleyində mühüm rol oynamış Səməd Vurğunu heç vaxt unutmamış və özünü ona borclu bilmişdir. O, 1956-cı ildə yazdığı “Mən ona borcluyam” məqaləsində yazırdı: “... Səməd Vurğunun göstərişləri biz gənclərə həmişə fayda vermiş və bizim inkişafımıza kömək etmişdir. Mən bir şair kimi yetişməyimdə, Səməd Vurğunun məruzələrinə, onun alovlu şeirlərinə və bizimlə olan şəxsi söhbətlərinə çox borcluyam”. Deməli, bu etiraf onu göstərir ki, Səməd Vurğun Bəxtiyar Vahabzadə üçün əsl ustad və müəllim olmuşdur.

Bəxtiyar Vahabzadə onun həyatında az-çox rol oynayan, onun xeyirxahı olan, onun barəsində xoş söz deyənlərin hər birinə hörmət və rəğbətlə yanaşmışdır. Bunlardan biri də Mehdi Hüseyndir. Mehdi Hüseyn görkəmli ədib olmaqla yanaşı, nəinki Azərbaycandakı, hətta dünyadakı ədəbi-bədii prosesləri izləyən, yerindəcə bunları yüksək səviyyəli elmi-nəzəri məqalələri ilə təhlil edən vicdanlı bir ədəbiyyatşünas – tənqidçi olmuşdur. Əslində, dünya gör-götür dünyasıdır. Hər kəs görür, öyrənir və yetişir. Görkəmli şəxsiyyətlərin hər biri bu cür yetişmişdir. Bu mənada Bəxtiyar Vahabzadə Mehdi Hüseyndən ədəbi mühitdə qaynamaq qabiliyyətini, ədəbi mühitə biganə qalmağı, ədəbiyyatla, sənətlə yaşamağı, iradəli olmağı, ədəbi və ictimai hadisələrə öz ağlı ilə baxmağı, mərdanəliyi, həqiqi dost olmaq keyfiyyətini və digər keyfiyyətləri öyrənmişdir. Yaxşı bir misal var: “Azın qədrini bilməyən çoxun da qədrini bilməz”. Bəxtiyar Vahabzadə öz qədirbilənliyini həmişə mövqe kimi nümayiş etdirmişdir. Əlbəttə, kim ona nə yaxşılıq edibsə, onun

heç birini unutmamışdır. Bu cür qədirbilənlik keyfiyyəti onu daha da sevdirmiş, geniş ictimaiyyətin dərin hörmət və məhəbbətini qazanmışdır. Bəxtiyar Vahabzadə 1969-cu ildə "Döyüşən ədib" məqaləsində yazır: "Bu gün Mehdi Hüseynin 60 illiyini keçiririk. O aramızdan tez getdi. O indi yoxdur, ancaq bir yerdə yeri görünür. Bu gün mən yazıçı vicdanımla onun əziz xatirəsi önündə başımı əyirəm". Bəxtiyar Vahabzadə Mehdi Hüseyni öz ustadı, müəllimi kimi qiymətləndirir və ona dəyər verirdi. Bunu şərtləndirən səbəblər vardı. Bu səbəblərdən biri o idi ki, Mehdi Hüseyn vaxtilə Bəxtiyar Vahabzadənin çap olunmuş "Etiraf" əsərini dərindən oxumuş və ona qarşı olacaq ittihamların qarşısında səbirli, təmkinli olmağı məsləhət bilmişdi. Təbii ki, Bəxtiyar Vahabzadəni səbirli, təmkinli olmağa çağıran Mehdi Hüseyn qələm yoldaşlarının etiraf etdiyi kimi "ədəbiyyatın əlisilahlı keşikçisi" olmuşdur. Bəxtiyar Vahabzadə 1969-cu ildə yazırdı: "10-15 gün bundan qabaq köhnə yazılarımı araşdırarkən üstündə bir qeyd vardı: "Bəxtiyar, çıxış etməsən yaxşıdır, danışası olsan, təmkin!.. H.Mehdi".

O bu qeydi mənə 7-8 il bundan əvvəl Yazıçılar İttifaqında keçirilən bir müşavirə zamanı göndərmişdi. Həmin müşavirədə yazıçılarımızdan biri məni "Etiraf" əsərinə görə "Tolstoyçuluqda" ittiham edirdi. O zaman çıxış etmədim. Həm də Mehdi müəllimin bu əsər haqqındakı fikrini bilirdim. Əsər jurnalda çap olunan kimi o mənə zəng çalıb rəyini telefonda demişdi.

Mərhum yazıçımız həmin qeydi ilə məni səbrə, təmkinə çağırırdı".

Başqa bir tərəfdən, Mehdi Hüseyn bir ustad və müəllim kimi, gənc nəslə tələbkarlıqla, qayğı ilə yanaşan ustad və müəllim kimi ədəbiyyatımızdakı bütün məsələlərə münasibətini həmişə açıq şəkildə bildirmişdir.

Bəxtiyar Vahabzadə Mehdi Hüseyni bir müəllim, ustad kimi başqa cəhətdən də qiymətləndirirdi. Bu da onun ədəbiyyatdakı nöqsanı, hətta həqiqi dost olduğu ədəbiyyat adamlarının nöqsanına göz yummaması ilə bağlı olmuşdur. Məhz ədəbiyyatın həmişə belələrinə ehtiyacı olmuşdur. İndi ədəbiyyatımızın belə ehtiyacı daha çoxdur. Bəxtiyar Vahabzadə onun barəsində yazırdı: "Bizim onunla S.Vurğun yardıcılığı haqqında çox tez-tez mübahisələrimiz düşərdi. O, S.Vurğunun sənətini həddindən artıq sevməsinə baxmayaraq, böyük şairin yaradıcılıq nöqsanlarına da göz yummazdı."

Əgər bizim hər birimiz hansısa bir elmi, bədii əsəri oxuyuruqsa və oradan nəyi öyrəniriksə, öyrəndiklərimiz fəaliyyətimizdə gərəkli olursa, deməli, həmin əsərlərin müəllifi müəllim, ustad kimi dəyərləndirilməlidir. Bu mənada bizim hər birimizə dərs deməyən, heç üzünü görmədiyimiz müəllimlər, ustadlar var ki, biz onların əsərlərindən çox şeylər öyrənmişik. Deməli, öyrənmişiksə, onlar bizim hər birimiz üçün müəllimdir, ustaddır. Bu mənada Bəxtiyar Vahabzadə belə ustadlara, müəllimlərə böyük dəyər verirdi və onlardan ədəbi gəncliyin, bütövlükdə gəncliyin çox şey öyrənə biləcəyini söyləyirdi. O yazırdı: "Bugünkü ədəbi gənclik Ələsgər şeirindən çox şey öyrənə bilər. Bəzən aşıq şeirinə ibtidai damğası vurulur. Bu şeirin dərinliyinə getmək lazımdır. Onun incəliklərini qavramaq lazımdır. Təcnislərdə çox böyük şəkil məhdudluğu var. Həm sözlərin şəklində, həm də şeirin formasında. Lakin bu məhdudluğa baxmayaraq, Ələsgər yalnız forma obrazlılığına uymamış, məhdud forma qəlibində çox böyük fikirlər söyləməyi bacarmışdır.

Biz Aşıq Ələsgərin şeirindən həm fikir, həm də şəkil gözəlliyini öyrənə bilərik".

Xalqın yaratdıqları, təcrübədən üzüağ çıxan dəyərlər insana çox şey verir. Bir sözlə, xalqdan böyük müəllim və ustad ola bilməz. Uşaqlıqdan indiyə qədər babala-

rımızdan, nənələrimizdən, ağsaqqallardan, ağbirçəklərdən eşitdiklərimizi, onların danışdıqlarını, təcrübədən çıxmış fikirlərini, məntiqlərini yaddaşımıza yazsaydıq, nələr öyrənmiş olardıq. İnsan yaşının müəyyən mərhələsində dərk edir ki, o, öyrənməli olacağı bir çox məsələlərdən heç özü də bilmədən imtina etmişdir. Uzun illər boyu dədə-babalarımızın öyrəndiklərini öyrənməkdən imtina etmək insanları doğma kökə, milli dəyərlərə sadiqlikdən uzaqlaşdırmışdır. Bu mənada Bəxtiyar Vahabzadə babasından, nənəsindən öyrəndiklərini etiraf edir, bununla da gənc nəslə çatdırır ki, biz onlardan öyrənməliyik. Onların söylədiyi şeirləri də, fikirləri də, hadisələri də uşaqlıqdan beynimizə həkk etməliyik və bu təməl üzərində inkişafımızı tapmalıyıq. 1972-ci ildə yenə də Aşıq Ələsgərə həsr etdiyi “Mən aşiqəm, tasaq yoxdur dilimə” məqaləsində Aşıq Ələsgərin yaradıcılığının xalq ruhuna, xalq mənəviyyatına söykəndiyi və buna görə də ondakı hikmətin dərinliyinə səcdə etdiyini etiraf etmişdir. Onun şeirlərindəki doğmalığı, təmizliyi xalqa bağlılıqla əlaqələndirmişdir. Ona görə də xalq Aşıq Ələsgərin şeirlərini əzbərdən bilmişdir. Bəxtiyar Vahabzadənin fikrincə, biz Aşıq Ələsgəri və eləcə də digər klassikləri onların yaradıcılığını dərindən oxuyub öyrənməklə yanaşı, həm də xalqın dilindən ata-babalarımızın bildiklərindən öyrənməliyik. Çünki onlar xalqı o qədər yaxın ruhda yazıb-yaradıblar ki, elə bil ki, onların şeirlərini xalq özü yaradıbdır. Beləliklə, Bəxtiyar Vahabzadə babasından öyrəndiklərini də yüksək qiymətləndirirdi. O yazırdı: “Bizim evimiz Şəkinin “Yuxarı – baş” məhəlləsində idi. Şəhərin qurtaracağındakı ən axırıncı evlər bu məhəllədədir. Bizim məhəllədən sonra dağlar başlayır. Evimiz dağ yolunun kənarında, bir təpənin üstündədir. Yazbaşı qoyun sürüləri bizim evin yanından keçib dağa gedərdi. İldə iki dəfə, qoyun dağa çıxanda və düşəndə bu yolda mərəkə qopardı. Birdən yarım saat dayanıb mələşə-mələşə ötən qoyun sürüsünə tamaşa edər, ləzzət alardıq. O zaman babamın dilindən bir bənd şeir eşidərdim:

Kəkotu, qırxbuğum, qaymaqçiçəyi,
Bənövşə, qantəpər, qızlar örpəyi,
Qoyun mələşməsi, çoban tütəyi,
Çəkir uzaqlara xəyalı, yaylaq!

Əlbəttə, bu bənddəki bütün sözləri başa düşürdüm. Kəkotunu, qırxbuğumu, qaymaqçiçəyini, bənövşəni görmüşdüm”. Görəsən, indiki uşaqlar bu sözlərin mənasını başa düşürmü?! Dilimizdə bu qəbildən olan yüzlərlə, minlərlə belə sözlər vardır ki, uşaqlar o sözlərin mənasını başa düşmürlər. Bunun bir səbəbi odur ki, bəzi uşaqlar xalqımızın həyat tərzindən, məişətindən, Azərbaycanımızın təbiətindən uzaq olduqları üçün belə sözləri başa düşmürlər. Bunun gələcəkdə çox böyük acı fəsadları ola bilər və fəsadlar olur da. Belə ki, bəzi uşaqlar xalqdan, onun mənəviyyatından, ruhundan, həyat tərzindən bixəbər olurlar. Belə olanda onlar klassiklərin yaradıcılığından, eləcə də xalq yaradıcılığından uzaq düşürlər. Nizamini, Nəsimini, Füzulini, Xətaini, Aşıq Ələsgəri və eləcə də digərlərini, daha doğrusu, onların yaradıcılıqlarını sevə bilmirlər. Ən başlıcası Azərbaycan təbiətini, onun bitkilərini, gül-çiçəyini tanımırlar. Təbiətə olan yadlaşmanın özü də uşaqların təbiətini dəyişir. Halbuki Bəxtiyar Vahabzadə deyirdi ki, o, babasının dilindən eşitdiyi bir bənddəki şeirdə adı çəkilən bütün bitkiləri gözləri ilə gördüyü üçün onları – sözlərin mənasını başa düşürdü. Ancaq bu bir bənddəki şeirdə “Xəyal” sözünü başa düşə bilmirmiş. O yazırdı: “Amma bu bənddəki “Xəyal” sözünü heç cür başa düşə bilmirdim.

“Xəyal” sözünün mənasını isə mən çox sonralar başa düşdüm”. Deməli, insan bilmədiyini soruşmaqla öyrənir. Öyrənmək üçün gərək bu istəkdə olasan, bilmədiklərini təkcə kitabdan deyil, yerində və məqamında

bilənlərdən öyrənəsən. Bu mənada kiçik yaşlarından bilmədiyini öyrənən uşaqlar sonralar öz yaş səviyyələrinə uyğun bilgi əldə edə bilirlər. Bəzən görürsən ki, hər hansı bir uşaq, yeniyetmə, gənc, eləcə də ortayaşlı və ahıl yaşlı insan öz yaş səviyyəsinə uyğun bilikdə olmur. Onların dünyagörüşü, doğma ana dilindəki sözlərin bir çoxunun mənasını bilməmələri onların nitqinə əngəl törədir, nitqləri qüsurlu, yorucu olur, nitqləri nitq mədəniyyətinin tələblərinə cavab vermir. Ona görə də dildə olan sözlərin mənalarını həmin sözlərlə ilk tanışlıqdan öyrənməlidirlər. İlk tanışlıq isə ailədən başlayır. Uşaq ailədə atadan, anadan, babadan, nənədən, böyük qardaş və bacıdan ilk tanış olduğu sözlərin mənasını öyrənməlidir. Ancaq bəzən valideynlər də uşaqların ilk tanış olduğu sözlərin mənalarını ya bilmir, ya da uşağa başa salmağı bacarmırlar. Belə olanda uşaq hər hansı bir sözün ifadə etdiyi məfhumu, anlayışı seçib fərqləndirə bilmir, ayırd edə bilmir. Məsələn, bu gün uşaqların böyük əksəriyyəti gül növlərini bir-birindən fərqləndirə bilmirlər. Nərgiz, lalə, qərənfil, yasəmən, süsən, sünbül və digər gül növlərini bir-birindən fərqləndirə bilmirlər. Bəzən ailələr də böyüklər bu gül və bitki növlərini ayırd edə bilmirlər. Bunun əsas səbəblərindən biri odur ki, insanların bir qismi uşaqlıq dövründən təbiətdən çox-çox uzaq düşürlər. Təbiətdə olan təbii bitkiləri gözləri ilə görmürlər və təbii ki, təbiətdəki bitkiləri də tanımırlar. Bunu təkcə bitkilərlə bağlı deyil, dildə mənasını bilmədiyimiz çoxlu sayda digər sözlərə də aid etmək olar. Doğrudan, onların ifadə etdiyi məfhumu, anlayışı bilməmək dilin lüğət tərkibinin tam qavranılması işinə maneçilik göstərir. Ona görə də insan uşaqlıqdan başlayaraq onu əhatə edən aləmə elə-belə baxmamalı, onun mənasını, hikmətini anlamağa çalışmalıdır.

Beləliklə, Bəxtiyar Vahabzadə “Xəyal” sözünün mənasını çox sonralar başa düşdüyünü deməklə, uşağın öyrəndiyi şeirdə, nəğmədə bilmədiyi sözün mənasını vaxtında öyrənilməsini məsləhət bilirdi ki, ilk məqamda uşağın mənasını bilmədiyi sözləri öyrənəcəyi adam onun valideynləri, babası, nənəsi və evdə ondan böyük olan qardaş-bacıları olmalıdır. Onlar isə uşağın psixologiyasını duymağa, hiss etməyə çalışmalıdırlar. Eyni zamanda uşağın səviyyəsinə enməyi mütləq nəzərə almalıdırlar. Düzdür, bu, çətin bir işdir. Ancaq bu çətinliyin öhdəsindən gəlməyi bacarmaq lazımdır. Bəxtiyar Vahabzadə, hətta uşaqlar haqqında yazanda da bu çətinliyi nəzərə almağı olduqca vacib sayırdı. O yazırdı: “Uşaqlar haqqında yazmaq çətindir, deyirlər. Bu, doğrudan da belədir. Bəs bu çətinlik nədədir? Məncə, bu çətinlik dəfələrlə eşitdiyimiz kimi birinci növbədə uşağa məxsus olan xüsusiyyəti – uşaq psixologiyasını, uşaq təbiətini, uşaq aləmini bilməkdədir. Uşaqlar üçün yazıb, onların dilini dərketmə qabiliyyətlərini, ətrafdakı hadisələrə münasibətlərini bilməmək şairi sözsüz ümumiçiliyə, mücərrədliyə aparacaqdır”. Deməli, Bəxtiyar Vahabzadə uşaq təbiətini, uşaq aləmini bilmədən uşaqlar üçün yazmağın mümkünsüzlüyünü qeyd edir. Bundan başqa, o, pedaqogikadakı əyanilik prinsipini konkret olaraq hər hansı bir fikrin, ideyanın daha canlı çatdırılmasında əhəmiyyətli hesab edirdi. O yazırdı: “Pedaqogikadan bildiyimiz kimi, uşaqlar üçün tədrisin özü də əyanilik prinsipi ilə aparılır. Müəllim uşağa iki üstəgəl ikinin dörd olduğunu quru sözlərlə deyil, sayğacda iki daşın üstünə iki daş əlavə etməklə, doğrudan da dörd alındığını məhz göstərməklə öyrədir.

Uşaq ikinin üstünə iki gələndə dörd alındığını sayğacda öz gözləri ilə gördüyü kimi, təbliğ olunan ideyanın faydalılığını, yaxud pis əməlin faydasız olduğunu da konkret həyat lövhələrində görməlidir. Bunun üçün isə şair quru nəsihətçiliyə, ümumi söz-

çülüyə getməməli, aşılamaq istədiyi fikri canlı boyalarla göstərməlidir". Konkret olaraq həyat lövhələri əsasında öyrənmək, quru nəsihətçilikdən, sözçülükdən uzaq olaraq canlı boyalarla öyrənmək uşağın yaddaşına biliyi əbədi həkk etdirir. Hazırda tədris prosesində tədrisin əyanilik prinsipi ilə aparılmasına daha çox üstünlük verilir. Deməli, təcrübə göstərir ki, əyanilik üzərində qurulmuş tədris prosesi mücərrədlikdən uzaq olmaqla, daha canlı və inandırıcı olur. Ümumiyyətlə, öz sənəti, öz sözü, öz nəfəsi olanlar başqalarından seçilir, hətta yadda qalırlar. Bəlkə, heç bəlkəsiz də, bütün sənət sahələrində o adamlar sevilir ki, onlar sənətlərinə məhəbbətlə bağlanırlar, məşğul olduqları sahənin dərinliklərinə baş vururlar, biganəlikdən və laqeydlikdən uzaq olurlar.

Bəxtiyar Vahabzadə təlim, tərbiyə və təhsil sahəsində keçmişə xor baxmağın əleyhinədir. Keçmişini bəyənməmək, hər şeyi inkar etmək gələcəyə də inamsızlıq yaradır. Odur ki, Bəxtiyar Vahabzadə məqamında "Keçmişinə xor baxan gələcəyinə kor baxar", "Nə tökərsən aşına, o da çıxar qaşığına" el sözündən, atalar sözündən istifadə etməklə düz danışmayanları, düz yazmayanları, məqalələrində, yazı-pozularında həqiqəti təhrif edənləri inandırıcı dəlillər əsasında sözün həqiqi mənasında tərbiyələndirirdi. Məsələn, 1972-ci il avqust nömrəsində Türkiyədə nəşr olunan "Varlıq" jurnalında İsmət Zeki Eyyuboğlu adlı birisi XX əsrə qədərki türk ədəbiyyatını "ölü ədəbiyyatı", təsəvvüf ədəbiyyatını (Nəsimini, Füzulini) "fikirdən məhrum, mənasız, əyləncə məqsədi ilə" yazılmış ədəbiyyat hesab edirdi. Bəxtiyar Vahabzadə bunu ədəbiyyata, mədəniyyətə bir qəsd-qərəz heab edərək yazırdı: "Eyyuboğlu bir məqaləsi ilə bir xalqın neçə əsrlik ədəbiyyatını, sənətini, ictimai fikrini yerə vurur, keçmişini bəyənmir, atasını inkar edir. Mən ona bir el sözü ilə cavab vermək istəyirəm: "Keçmişinə xor baxan gələcəyinə kor baxar". Yazıq Eyyuboğlu, sən ki, öz atanı bəyənmirsən, görəsən sənin balan da səni bəyənəcəkmi?". Ümumiyyətlə, öyrəndiklərin o qədər zəngin və geniş olmalıdır ki (həm həyatdan, həm də kitabdan öyrəndiklərin) məqamında, yerində verdiyin cavab tutarlı alınsın və təsir gücü ilə qarşı tərəfin iddiasını alt-üst etsin. Bu da bir bacarıqdır və bəlkə də pedaqoji ustalıqdır. Bu mənada Bəxtiyar Vahabzadə İsmət Zeki Eyyuboğlunun fikrinin əsassız olduğunu təsdiq etmək üçün ədəbi-bədii əsərlərdən oxuduqlarına istinad etmişdir: "L.Tolstoyun bir hekayəsi yadıma düşdü: "Ata qocaldı, əlləri əsməyə başladı. Oğul boşqabın sınmasından qorxaraq atasına taxta çanaqda yemək verdi. Bir gün işdən gəlirkən gördü ki, balaca oğlu qarşısına taxta, mismar qoyub nə isə qayırır. Soruşdu:

- Bu nədir?

Uşaq cavab verdi:

- Sən də qocalanda babam kimi əllərin əsəcək, boşqabları qıracaqsan. Ona görə də indidən sənə taxta çanaq qayırıram".

Uşaq gördüyünü eləyirdi və düz eləyirdi. Çünki atalar demişkən: "Nə tökərsən aşına, o da çıxar qaşığına".

Eyyuboğlunun iddiasına görə, əsl ədəbiyyatı indi yaradırlar.

İndi ki, belə başlamısınız, bu gün yaratdığınız ədəbiyyatı da sabah sizin balalarınız inkar edəcək". Əslində Bəxtiyar Vahabzadənin bu fikri, məntiqi, bütövlükdə mövqeyi bütün zamanlar gənclik üçün, eləcə də düzgün olmayan meyillər baş qaldıranda kimin kim olduğunu göstərmək üçün ən yaxşı örnəklərdən biridir. Bütün zamanlarda atalar – oğullar, yaşlı nəsil – gənclik arasında barışmazlıq olub. Hətta ədəbiyyatda gənc ədəbi nəslin klassikləri bəyənməməsi də olub, indi də bu meyillər az deyil. Gəncliyə, gənc ədəbi nəslin nümayəndələrinə belə örnəklər – Bəxtiyar Vahabzadə kimi sənətkarların fikirləri həmişə gərəkdir. Onlar keçmişə də, bu günə də düzgün qiymət verməyi

bacarır və gələcəyin də düzgün istiqamətini göstərə bilirlər.

Borc hissi, özünü cəmiyyətə, Vətənə borclu hesab etmək təkcə biliyi olmaqla qurtarmır. Bu, işin zahiri cəhətidir. Yəni biliyi olmaq işin zahiridir. Ancaq həmin biliyin cəmiyyətin, insanların xeyrinə xərclənməsindən uzaq olmaq vətəndaşlıq borcunu bilməmək deməkdir.

Bəxtiyar Vahabzadə 1970-ci ildə "Borc hissi" məqaləsində özünü intelligent hesab edənlərin vəzifələrini, fəaliyyətlərinin məzmununun nədən ibarət olmasını konkret misallarla izah edirdi. O, intelligent – ziyalı kimdir? Bütün bilikli, ali təhsilli adamlara intelligent – ziyalı demək olarmı? suallarına cavab axtarırdı. Bəli, intelligent sözü intellekt sözündən yaranmışdır, Azərbaycan dilində ziyalı kimi işlənir. Ziyalı sözü isə ziya (işıq) sözündəndir.

İntelligenti, ziyalını tamamlayan hansı cəhətlər var? Bu cəhətlər içərisində Bəxtiyar Vahabzadə vətən və xalq qarşısında borc hissini əsas hesab edirdi. Doğrudan da, biliyi olmaq, diplomu olmaq hələ ziyalılıq deyil. Elələri var ki, onların diplomları yoxdur. Ancaq onlar təbiətən ziyalıdırlar. Bəxtiyar Vahabzadə yazır: "...borc hissini intelligentliyin əsas şərtlərindən biri hesab edirəm. Dünya hadisələrindən, təzə dəblərdən, yəni axınlardan və cərəyanlardan xəbərdar olub, bir insan kimi öz ictimai borcunu başa düşməyən, vətəndaşlıq vəzifəsini bilməyən, həyatın mənasını dərk etməyən, nəyin naminəsə yanmağı, alışmağı özünə məslək seçməyən bir adamı mən kamil intelligent hesab etmirəm. Əsl intelligent bircə şeyi bilməlidir: mən nəyin naminə yaşayıram?" O biləcək ki, çörəyini yediyi, havasını udduğu vətənə, torpağa borcludur. Borcunu bildikdən sonra vəzifəsini də dərk edəcəkdir. Hər bir insanın ən müqəddəs vəzifəsi Vətənə xidmətdir. Təbii ki, vətənə xidmət etmək üçün insanda savad, bilik, mədəniyyət, geniş dünyagörüş olmalıdır.

Bəxtiyar Vahabzadə yazırdı: "Mən universitetdə müəlliməm. Beşinci kurslara mühazirə oxuyuram. Bu adamlar artıq ali təhsilə yiyələnmiş savadlı, bilikli cavanlardır. Lakin təəssüf ki, mən onların bəzisinə intelligent deməzdim. Niyə?" Niyəsini Bəxtiyar Vahabzadə faktlarla izah edirdi. Qeyd edirdi ki, gənclərlə söhbət zamanı məlum olur ki, dünyadakı kino ulduzlarını, rejissorları, müğənniləri, futbolçuları tanıyırlar, hətta onların tərcümeyi-hallarını da bilirlər. Ancaq dünyadakı siyasi, ictimai hadisələrə biganədirlər. Belə cavanlar bunu mədəniyyət sayırlar. Əslində isə bu, mədəniyyət deyil. Bəxtiyar Vahabzadə uzaq qohumlarının birinin evində müşahidə etdiyi bir hadisədən çıxış edirdi. Belə ki, uzaq qohumu – ev sahibəsi evində Heminqueyin şəkillərini açsa da, onun əsərlərini oxusa da, onun evində bir dənə də olsun Azərbaycan ədibinin, yaxud aliminin kitabı yoxdur. Bəxtiyar Vahabzadə yazırdı: "Burda N.Nərimanovun "Bahadır və Sona" povestindəki bir obraz yadıma düşür. Bu qız xarici ölkədə təhsil alıb bir neçə əcnəbi dil bilməsi və öz dilini bilməməsi ilə fəxr edir. Bu, mədəniyyətdirmi? Qətiyyən! Bu, təqliddir, bu mədəniyyətsizliyin ən bariz nümunəsidir.

Belə adamlar mədəniyyəti zahirdə görürlər. Əgər o qadın özünü dərk eləsəydi, onun evində Nizaminin də, M.F.Axundovun, C.Cabbarlının da kitabları olardı. Höteni oxuyan və sevən bu qadın bilmir ki, onun pərəstiş etdiyi Höte Nizamini özündən qat-qat yüksək sənətkar hesab etmişdir".

Bəxtiyar Vahabzadə öyrətmək üçün sadə yollardan, üsullardan istifadə etməyi məqbul sayırdı. O, sadə yolla öyrətməyin faydasına inanır və bu yolu təbliğ edirdi. Görünür ki, bu da onun müəllimlik təcrübəsindən irəli gəlirdi. Göründüyü kimi, o, böyük sənətkar, alim olmaqla yanaşı, həm də böyük pedaqoq idi.



# MAARİF FƏDAİLƏRİNDƏN BİRİ: ƏFSUN ƏFƏNDİYEV

Təhsilimizin tarixində danılmaz xidmətləri olan şəxslərdən biri də on il respublika maarif nazirinin müavini vəzifəsində çalışmış Əfsun Əfəndiyevdir. Onun bu vəzifəyə təyin olunmasından dörd on illik keçir. 40 il əvvəl – 1974-cü il. Respublikada yaradılmış tələbkarlıq və işgüzarlıq şəraiti rəhbər pedaqoji kadrların da seçilməsinə diqqəti artırmış, az müddətdə kadrların tərkibində keyfiyyət dəyişiklikləri aparılmışdı. Bu məqsədlə Nazirliyin mərkəzi aparatında əsaslı işlər görülmüşdü.

Ötən əsrin 70-ci illərində gündüz ümumtəhsil məktəblərində təhsilalanların sayı bir milyon dörd yüz minə çatmışdı. Təhsil sahəsində böyük dəyişikliklər aparılırdı. Azərbaycan təhsilinin 1969-1982-ci illərdəki uğurları, respublikadakı ümumi tendensiya nazirliklərdə də hiss olunurdu. Ə.Əfəndiyev 1974-cü ildən ömrünün sonunadək nazirin ümumtəhsil məktəblərinə baxan müavini vəzifəsində çalışmışdır.

Əfsun Piran oğlu Əfəndiyev 1928-ci ildə Samux rayonunun Alpoud kəndində doğulmuşdur. 1942-ci ildə Alpoud məktəbinin 9-cu sinfini bitirdikdən sonra dərhal kəndlərindəki məktəbə müəllim təyin edilmişdi. Lakin onun bu sevinci uzun çəkməmişdi. Böyük Vətən müharibəsi hər şeyi yarımçıq qoymuşdu. Cəbhədə vəziyyət ağır idi. Bunu yaxşı dərk edən gənc Əfsun könüllü olaraq ordu sırasına yazılır. Döyüşdə iki dəfə ağır yaralanır. 1944-cü ildə Polşa cəbhəsində vuruşur, səhhəti ilə əlaqədar 1945-ci ildə ordudan təxris olunur. Gənc müəllim cəbhədən döyüş medalları ilə qayıdır. O yenə də öz doğma işinə – Samux rayonunda müəllimliyə başlayır və təhsilini davam etdirmək üçün növbəti ildə Azərbaycan Dövlət Universitetinin qiyabi şöbəsinə daxil olur. 1952-ci ildə ADU-nun tarix fakültəsini bitirir. Yenə də könüllü olaraq, rayonda işləməyə hazır olduğunu bildirir. Lakin ona öz kəndində işləmək qismət olmur. Çünki o illərdə Əfsun müəllimin doğulduğu, boya-başa çatdığı, müəllim işlədiyi kənd artıq yox idi. O kənd Mingəçevir dənizinin altında qalmışdı. Ona görə də Əfsun müəllim özü üçün yeni iş yeri seçməli idi. Belə də oldu. O, müəllimə ciddi ehtiyacı olan Xaçmaz rayonuna təyinat aldı. Gənc müəllim tezliklə kənd camaatı ilə qaynayıb-qarışdı. Müharibədən sonrakı bərpa və quruculuq işlərinin qoynuna atıldı. O öz sənətini sevirdi. Uşaqlar da, valideynlər də ondan çox razı idi. Bu illərdə artıq Əfsun müəllim həm də qabaqcıl müəllim kimi tanındı. 1952/53-cü dərs ilində o, işlədiyi Xudat orta məktəbindən qonşu məktəbə direktor vəzifəsinə irəli çəkildi, 1953-cü ildən 1962-ci ilədək Müqtədir qəsəbə məktəbində direktor vəzifəsində çalışdı. Yaxşı işinə görə, Maarif Nazirliyi, partiya, sovet təşkilatları onu ehtiyat rəhbər kadrların siyahısına saldılar, gənc direktor yuxarı təşkilatların da diqqətini özünə çəkdi. Valideynlərini vaxtsız itirmiş Əfsun kollektivə öz doğma ailəsi kimi baxırdı. O bu vəzifədə də özünü doğrultdu. Artıq onun adı hər yerdə hörmətlə çəkilirdi. O vaxtdan neçə illər keçsə də, həmin kənddə

Əfsun müəllimi xatırlayanlar indi də tapılır. Kənddə böyük nüfuz qazanmış gənc direktor abadlıq işləri apparardı. Təbiət vurğunu kimi onun öz əli ilə əkdiyi ağaclar indi də qalmaqdadır.

Bir neçə il sonra elmə olan həvəsi onu Bakıya gətirdi. 1962-ci ildə Əfsun müəllim Azərbaycan Dövlət Universitetinin aspiranturasına qəbul olundu. 1965-ci ildə aspiranturanı qurtaran kimi Bakı Ali Partiya Məktəbinə baş müəllim vəzifəsinə göndərildi. 1970-ci ildən 1974-cü ilədək, yəni nazir müavini təyin olunana qədər bu vəzifədə çalışdı. Respublikanın partiya, sovet təşkilatları ilə əlaqəsi onu daha da püxtələşdirmişdi. Kollektiv onu Bakı Ali Partiya Məktəbin partiya komitəsinin katibi seçir. 1973-1975-ci illərdə o, rayon sovetinin deputatı olur.

Ə.Əfəndiyev bütün tapşırıqları vicdanla, vaxtlı-vaxtında yerinə yetirir, öz vəzifəsinin öhdəsindən layiqincə gəlirdi. Belə bir zəngin həyat yolu keçmiş, respublikanın əməkdar müəllimi fəxri adına layiq görülmüş Əfsun Əfəndiyevə müxtəlif rəhbər vəzifələr təklif olundu. Lakin onu pedaqoji sahə daha çox özünə çəkirdi. Artıq Əfsun müəllim  ailə sahibi idi. Həyat yoldaşı müəllim işləyirdi. Oğlu Vadim və qızı Leyla böyüyürdü. Atasının yolu ilə gedən və onun layiqli davamçısı olan Leyla xanım hazırda Bakı şəhəri, 160 nömrəli Klassik gimnaziyada işləyir. Dərslik müəllifidir. Yaxşı işinə görə hamı ona hörmətlə yanaşır. “İlin ən yaxşı müəllimi”dir. Məktəb rəhbərliyi, pedaqoji kollektiv, valideynlər və şagirdlər onun işindən razıdır.

Qeyd etmək lazımdır ki, Əfsun Əfəndiyev çox yetkin ziyalı, erudisiyalı, yüksək intellektli bir pedaqoq idi. O, mütaliəni çox sevir, rus və Azərbaycan dilində olan ən maraqlı kitabları hamıdan əvvəl əldə edirdi. Onun dilindən tez-tez tarixi şəxsiyyətlərin müdrik sözləri səslənərdi. Bəzən, imkan olanda, bu əsərlərin obrazlarından misallar gətirərdi. O, həmişə deyirdi ki, müdrik kəlamlara vaxtı ötüb-keçmiş fikirlər kimi baxılmamalıdır, cəmiyyət həmişə ayrı-ayrı fərdlərdən, ayrı-ayrı xarakterə malik insanlardan ibarət olmuşdur. İnsanlar arasındakı münasibətlərə isə bütün dövrlərdə həlledici amil kimi yanaşılmışdır. O, tabeliyindəki işçilərə öyrədirdi ki, insanlar arasında fikir ayrılığı ümumi işə mane olmamalıdır. Böyük pedaqoqların fikirləri, bizdən əvvəl işləyənlərin taleyi, təcrübəsi bugünkü fəaliyyətimiz üçün faydalı tərbiyə məktəbidir. Söz yox ki, onunla razılaşmayanlar da vardı. Bu da təbiidir, heç də hamı Əfsun müəllimi olduğu kimi qəbul etmir, onu daha çevik, bir qədər də sərt görmək istəyirdilər. Bu illərdə onun ünvanına, xüsusən kuratoru olduğu sahənin vəziyyəti barədə tənqidi fikirlər də söylənərdi. Əfsun müəllim irad və tənqidləri təmkinlə dinləyər, heç kəslə mübahisəyə girişməzdi. Belə tənqidi fikirlər yuxarılar tərəfindən söylənəndə isə sakitcə dinləyər, qarşısındakı kağıza nə isə yazar, deyilənləri öz fikrində götür-qoy edərdi. Belə hallarda qətiyyən hiss olunmurdu ki, o, natiqdən incimişdir, yaxud daxili narahatçılıq keçirir. İdarəçilik qaydalarını yaxşı bilən Əfsun müəllim hər bir tapşırığın gecikmədən icrasını vacib sayırdı. Ən mühüm məsələləri rəhbərliklə, hətta tabeliyindəki işçilərlə məsləhətləşər, həyata keçirilməli olan problem barədə özündə əminlik yarandıqdan sonra işə başlayardı. O, çox qayğıkeş və ədalətli idi, həmişə deyirdi: “Ciddi əsas olmadan heç kəsi təndiq etməyin. Bu bizim işimizə xeyir gətirməz. Onda yaxşı kadrları itirərik”.

Əfsun müəllim nazirliyə daxil olan şikayət məktublarının çox diqqətlə araşdırılmasına diqqət yetirərdi. O öz tabeliyindəki işçilərinin ən yaxşı cəhətlərini qiymətləndirdiyi kimi, nöqsanlarını da görürdü, onun düzəldilməsinə imkan verirdi. Həmçinin işçilərin səhvlərini bağışlamağı da bacarardı.

Heç kəsə ögey münasibət bəsləməzdi. Başqa müavinlərdən fərqli olaraq, yalnız rəislərlə deyil, hər bir inspektorla da ayrıca işləyərdi. Heç vaxt bütün ağırlığı idarə, şöbə rəhbərlərinin üzərinə atmazdı.

Əfsun müəllim Azərbaycanda təlim-tərbiyə, məktəb quruculuğu, təhsilin inkişafı, təlim prosesinin təkmilləşdirilməsi məsələlərinə bələd idi. Ona təqdim olunan arayışları bəzən tamamilə yenidən işləyirdi. Baş məktəblər idarəsinin işçiləri onun bu keyfiyyətlərindən ağızdolusu danışırdılar. Əfsun müəllim tərəfindən nəzərdən keçirilən sənədlərin yuxarılarda da bəyəniləcəyinə həmişə əminlik vardı.

Əfsun müəllim çox böyük ürək sahibi, hər kəsə böyük qəlblə yanaşan səbirli, təmkinli, xeyirxah, obyektiv, halal bir rəhbər idi. Onunla işləyənlər müsbət keyfiyyətlərinə yaxşı bələd idilər, onun iş üslubunu qəbul edirdilər. Əfsun müəllim özünəməxsus daxili mədəniyyətə malik idi. Onun bir cəhəti də diqqəti cəlb edirdi ki, o, normativ sənədləri çox diqqətlə oxuyur, hər bir sətiraltı mənanı da başa düşməyə çalışırdı. Sonra da onun icrasına bələdliklə nəzarət edirdi.

Dövrünün açıqgözlü ziyalısı kimi Əfsun müəllim pedaqoji mətbuatı ardıcıl izləyərdi. Çox zaman şöbə müdirlərini də yanına çağırıb, aidiyyəti yazılara münasibət bildirərdi. O çox nadir hallarda hirslənər, həmişə sakit olmağa çalışardı. Ən ciddi prinsipial məsələləri də təmkinlə müzakirə edərdi.

Tanınmış təhsil eksperti, əməkdar müəllim Asif Cahangirov:

- Mən Nazirliyin Baş Məktəblər İdarəsinin rəisi, Bakı şəhəri Xalq Təhsil Şöbəsinin müdiri kimi məsul vəzifələrdə çalışarkən Əfsun müəllimlə çox görüşmüşəm. O, rəhbər işçilərə məxsus ən yaxşı keyfiyyətlərə malik idi.

Ələsgər Mehdiyev – Salyan RTŞ-nin sabiq müdiri, əməkdar müəllim: Əfsun müəllim yerlərdən gələnləri çox diqqətlə dinləyərdi. Çalışardı ki, onlar üçün nəsə etsin.

Gəncə Dövlət Universitetinin ümumi riyaziyyat kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru Üzeyir Əfəndiyevin dediklərindən:

- Əfsun müəllim dörd yaşından bizim ailədə böyümüşdür. Biz bir-birimizə qardaş deyə müraciət edərdik. Atam da onu çox istəyirdi. Əfsun həm yaxşı oxuyurdu, həm də çoxlu mütaliə edirdi. Zəhmətə də biganə deyildi. Bir dəfə də onun nədənsə narazı qaldığını görməmişdim. Qonşularımız isə ona böyük adam kimi yanaşırdı. Müəllimləri onun gələcəyinə inanırdılar.

Leyla Əfəndiyeva 160 nömrəli Klassik gimnaziyanın müəllimi:

- Atam ailədə özünü çox təmkinli aparardı. Onun ailəcənablılığı ailədə də hiss olunurdu. Nədənsə, ən çox oğlu ilə məşğul olurdu. Ona həyatın ən çətin anlarını öyrətməyə çalışırdı. O, mənim üzümə baxanda sanki gözləri işıqlanırdı. Öz uşaqlığı çətinliklə keçdiyi üçün bizə daha çox qayğı göstərirdi. Bir də heç zaman işdən evə zəng etməzdi. Görüşümüz, söhbətimiz yalnız axşam, sabah olardı. Bir ata kimi onun əvəzi yox idi. Heyif ki, yaşı heç olmazsa 60-a da çatmadı. İndi təhsilimizin bu günündə həmişə onu xatırlayıram. O belə günləri görsəydi, daha çox yaşayardı.

Həqiqətən də, bu gün təhsilimizin uğurlarını, təlim-tərbiyə sahəsindəki nailiyyətlərini görəndə, istər-istəməz Əfsun müəllimi xatırlamalı oluruq. Çünki o özü də on il ərzində təhsilimizin inkişafı üçün az iş görməmişdir və həmişə də təhsilimizin gələcəyinə ümid bəsləmiş, bu gününü arzulamışdır.

Əfsun Əfəndiyevi tanıyanlar, onunla bir yerdə işləyənlər onu həmişə belə xatırlayırlar.

***Nəcəf Nəcəfov,***
***Azərbaycan Yazıçılar Birliyi və***
***Jurnalistlər Birliyinin üzvü,***
***əməkdar müəllim, Qızıl qələm***
***mükafatı laureatı***

**BİZƏ YAZIRLAR**: "Azərbaycan məktəbi"nin oxucuları jurnalımızın 90 illiyi münasibətilə yerlərdə müzakirələr, tədbirlər keçirir, ona uğurlar, uzunömürlülük arzulayırlar.

"Azərbaycan məktəbi"nin daimi oxucularından olan **Astara rayonu, Renə kənd tam orta məktəbinin direktoru Fikrət Kəkəyev** məktubunda qeyd edir ki, jurnalın hər bir nömrəsi bizim üçün maraqlıdır. Biz jurnalın daimi abunəçiləriyik. Jurnalın səhifələrində təhsilimizdə gedən yenilənmələrlə tanış olur, "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na dair materialları, xüsusən onun tətbiqinə dair məqalələri, pedaqoji fikrimizin dünəni və bu gününə dair dəyərli fikirləri oxuyur, pedaqoji sahədə bilik və təcrübəmizi zənginləşdiririk. Jurnalın sonuncu nömrəsinin müzakirəsində məktəbin ən təcrübəli müəllimləri: Rasib İsayev, Səmədulla Nəzərov, Zakir Kəkəyev, Vidadi Fətəliyev, Ədalət Baxşılı, Mirhəsən Mirzəyev çıxış edib, arzu və təkliflərini, həm də iradlarını bildirmişlər. Belə müzakirələr ardıcıl davam etdiriləcəkdir.



Onlar əmin olduqlarını bildirmişlər ki, jurnal təhsilimizin uğurlarının təbliğinə, dünya təhsilinə inteqrasiyaya dair materialları daha geniş işıqlandırılacaq, müəllimlərin elmi-nəzəri və pedaqoji hazırlığına kömək etməklə 90 il ərzində qazanılmış ənənələrin keşiyində duracaqdır.

**Lənkəran rayonu Senaradi kənd tam orta məktəbinin direktoru Məhərrəm Nurullayev** məktubunda "Azərbaycan məktəbi" jurnalının 90 illik həyat yoluna dair müəllimlərlə yanaşı, yuxarı sinif şagirdlərinə də məlumat verildiyini yazır və pedaqoji mətbuatımızın keçdiyi keşməkeşli yollarda zəhməti olan pedaqoqlarımızı xatırladır, onların şagirdlərə tanıdılması üçün jurnalın ayrı-ayrı nömrələrini misal göstərir, müəllimlərlə birgə jurnalda ən yaxşı məqalələrin müzakirəsi keçirilir.

M.Nurullayev onu da qeyd edib ki, jurnaldakı məqalələr müəllimlərin peşəkarlığına və səriştəliliyinin artırılmasına kömək edir, onlarda ölkəmizdə təhsil islahatının mahiyyəti barədə aydın təsəvvürlər yaradır. Əminəm ki, jurnalda kənd məktəblərinə dair məqalələrin kəmiyyət və keyfiyyətinin artırılmasına ardıcıl fikir veriləcək, qabaqcıl iş təcrübəsinə geniş yer veriləcəkdir.



**P.S. "Azərbaycan məktəbi" jurnalının redaksiya heyəti Astara rayonunun Renə və Lənkəran rayonunun Senaradi kənd tam orta məktəblərinin rəhbərliyinə və pedaqoji kollektivinə öz təşəkkürünü bildirir və onların məqalələrini gözləyir.**